*Bu kitab “**İlyas Əfəndiyev.** Seçilmiş əsərləri. Yeddiclddə. I cild”*
*(Bakı, Çinar çap, 2002) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni: **Elçin**

Redaktorları: **Vaqif Bəhmənli**
**Umud Rəhimoğlu**

Ön sözün müəllifi: **Bəkir Nəbiyev**

**894.3613 - dc 21**
**AZE**
**Əfəndiyev İlyas. Seçilmiş əsərləri.**
Üç cilddə. I cild. Bakı, “AVRASİYA PRESS”, 2005, 280 səh.

XX əsr Azərbaycan ədəbiyyatının klassiki, bənzərsiz nəsr ustası və dramaturq, xalq yazıçısı İlyas Əfəndiyevin “Seçilmiş əsərləri” üçcildliyinin bu cildinə əlli ildən də çox bir zaman aralığında qələmə aldığı hekayələrindən az bir qismi toplanmışdır. Yazıçının hekayə janrında yaratdığı sanballı nümunələr daim oxucu marağı və rəğbəti ilə qarşılanmış, dönə-dönə nəşr edilmiş, dünya xalqlarının dillərinə tərcümə olunmuşdur. Böyük ədibin roman, povest və pyesləri ilə birlikdə hekayələri də üslubuna, ideyasına, estetik dəyərlərinə görə öz müəllifinə Azərbaycan ədəbiyyatında qibtə olunacaq bir mövqe qazandırmışdır. Yazıçının lirik-psixoloji yaradıcı təxəyyülünün məhsulu olan hekayələrə lakonizm, humanizm – yüksək insanpərvərlik xasdır. Bu cildə “Körpüsalanlar” və “Xan qızı Gülsənubərlə tarzən Sadıqcanın nağılı” povestləri də daxil edilmişdir.

**ISBN 99452-421-04-2**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## O, HƏMİŞƏ MÜASİRDİR

Azərbaycan ictimai fikrinin XX əsrdə yetirdiyi nadir ədəbi simalardan biri, Azərbaycanın xalq yazıçısı, məşhur nasir və dramaturq, mənsub olduğu xalqın ədəbiyyatının tarixində, mənəviyyatında parlaq iz qoyan görkəmli sənətkar İlyas Əfəndiyevin ədəbi irsi öz məna və əhəmiyyətini bu gün də qoruyub saxlayır, xalqın ədəbi dəyərlər xəzinəsində özünə layiq yer tutur, yeni-yeni nəsillərin ədəbi-estetik, vətənpərvərlik, vətəndaşlıq tərbiyəsində öz mühüm, nəcib və xeyirxah rolunu oynayır. Bu cür qələm sahiblərinin əsərlərinin onların sağlığında və sonra dönə-dönə üzü köçürülür, bu əsərlər müxtəlif qəzet və jurnallarda seçmə halında, ayrı-ayrı nəşriyyatlarda kitablar kimi bütöv halda nəşr edilir, pyesləri müxtəlif teatrlarda, fərqli rejissorlar tərəfindən dönə-dönə tamaşaya qoyulur, efir və ekran vasitəsilə səsləndirilir və nümayiş etdirilir. Bu prosesdə həmin əsərlər katiblərin, naşirlərin, redaktorların, rejissorların, tərcüməçilərin, jurnalistlərin çox vaxt mexaniki olaraq, bəzən bilmədən, nadir hallarda isə bilərək yol verdikləri dəyişikliklərə məruz qalır, onların mətnlərində müxtəlif yozumlar özünə yer tapa bilir. Buna görə də böyük ictimai fikir xadimlərinin – klassik ədib və şairlərin əsərlərinin əslinə, yəni müəllifin vaxtilə qələmə aldığı, yaxud özünün sonradan üzünü köçürdüyü, təshih etdiyi mətnə uyğun olaraq adekvat şəkildə, mükəmməl nəşrini hazırlayıb meydana çıxarmaq həm qələm sahibinin xatirəsi qarşısında, həm də çağdaş və sonrakı oxucu nəsilləri qarşısında xeyirxah xidmətdir.

Diqqətli oxucular fərqinə vardılar ki, biz bu yazıda “akademik nəşr”, yaxud “elmi-tənqidi mətn” ifadələrini işlətmədik. Akademik nəşr, elmi-tənqidi mətn klassik irsi yenidən meydana qoymağın ən yüksək pilləsidir. İlyas Əfəndiyev Azərbaycan ədəbiyyatının təzəcə ayrıldığımız XX əsrdə yetirdiyi klassiklərdən biridir və onun da zəngin irsi, şübhəsiz, gələcəkdə öz akademik nəşrini görəcəkdir. Lakin bu, sabahın, deyək ki, 10-15 il sonranın tədqiqatçı və mətnşünaslarının qarşısında duran elmi yaradıcılıq vəzifəsidir və inanırıq ki, bu vəzifə də layiqincə yerinə yetiriləcəkdir.

* * *

Bu üççildlik təkcə İlyas Əfəndiyevin yaradıcılığı ətrafında deyil, bütünlükdə Azərbaycan ədəbiyyatının vaxtilə sovet dövrü adlandırılan ikinci respublika mərhələsinin ədəbiyyatına dair bəzi düşüncələr üçün zəngin material verir. Keçmiş SSRİ-də, o cümlədən də xüsusilə Azərbaycanda minilliyin axırlarında baş verən məlum tarixi ictimai hadisələr zəminində dövlət müstəqilliyi əldə etmiş ölkələrdə bərqərar olan yeni təfəkkür tərzi işığında bu gün bir çox ədəbi, mədəni dəyərlərə, o cümlədən də bütünlükdə ədəbi prosesə münasibət əsaslı surətdə dəyişmiş, təzə baxımdan qiymətləndirilməyə başlamışdır. Az qala dünənə qədər ağır təzyiq və təsiri altında olduğumuz "ədəbiyyatın partiyalılığı", "bədii yaradıcılığın sinfi səciyyəsi", "sosialist realizmi yaradıcılıq metodunun qanunauyğunluqları" deyilən tələblər bir zamanlar zorla beyinlərə yeridilən "Proletkult", "AzAPP", "Tar daloy" və sair anlayışlar kimi artıq ədəbi məişətimizdən köçünü çəkib arxivlərin künclərində toz basmağa məhkum edilmişdir. Lakin bu heç də o demək deyil ki, vaxtilə ədəbiyyat cəmiyyət üzvləri qarşısında yerinə yetirməli olduğu böyük vəzifələrindən tamamilə uzaq düşmüşdür. Əlbəttə yox. Klassik irsimizin görkəmli nümayəndələrinin yaradıcılığı kimi ötən əsrin sovet dövrü kəsiyinə məxsus ədəbiyyatımızın da ən qiymətli nümunələri gah həzin və kövrək lirik duyğuları, gah vüsətli epik lövhələri, gah da gərgin dramatik kolliziyaları yüksək bədii səviyyədə əks etdirmək əsasında, bəzən müdrik nəsihətlər, bəzən də adamın yeddi qatından keçən kəskin satirik ifadələr vasitəsilə çağdaşlarımızın milli, mənəvi aləminin formalaşması, vətənpərvərlik duyğularının pərvəriş tapması, bəşəri ideallar ruhunda tərbiyələnməsi sahəsində öz tarixi vəzifəsini yorulmaq bilmədən yerinə yetirmişdir. Azərbaycan ədəbiyyatının bir qədər fərqlə son yarım əsrini bu baxımdan araşdırarkən siması gözlərimiz önündə canlanan ən görkəmli sənətkarlardan biri – artıq haqq dünyasına qovuşmuş xalq yazıçısı İlyas Əfəndiyevdir. O, həmvətənlərimizin humanist, yaradıcı təbiətini, pak məhəbbət duyğularını, yeniliklə köhnəliyin mübarizəsini həm nəsr, həm də dram əsərlərində həyati konfliktlər, canlı xarakterlər əsasında yüksək

sənətkarlıqla əks etdirən bir yazıçı idi. Xalq, vətən, cəmiyyət, insanlıq qarşısında mənəvi borca münasibət onun qəhrəmanlarının daxili aləmini müəyyən etmək üçün başlıca meyar olmaqla yanaşı, həm də ədibin özünün sənətkar idealının mötəbər göstəricisi olmuşdur. Biz vaxtilə yazmışdıq ki, ədəbi-ictimai fikir tariximizdə lirik-psixoloji üslubun inkişafı və böyük uğurları bilavasitə və hamıdan çox İlyas Əfəndiyevin şərəfli adı və əsərlərilə bağlıdır. XX əsrin əllinci-altmışıncı illərindən etibarən ictimai həyatda baş verən dəyişiklikləri ilkin duyan, yeni insanı, onun mürəkkəb daxili aləmini, sevinc və qayğılarını, kədər və faciələrini sənətin orijinal vasitələrilə əks etdirən yazıçılar arasında İlyas Əfəndiyevin xüsusi mövqeyi vardır.

Məlum səbəblər üzündən vaxtilə bizim bir sıra əsərlərimizdə vulqar sosiologizm təzahürləri çox qüvvətlənmiş, bu da öz növbəsində diqqəti insan mənəviyyatının dərin psixoloji şərh və təhlilindən uzaqlaşdırmışdı, "konfliktsizlik" deyilən bəlanı meydana çıxarmışdır. Bu zaman İlyas Əfəndiyevin əsərləri ilə nəsr və dramaturgiyamıza əsl həyati konfliktlər əsasında yaradılmış qəhrəmanların, təmiz ürəkli, prinsipial və mərd adamların yeni bədii surətləri gəldi. Biz onların daxili aləminə vardıq, bu qəhrəmanların həyatiliyinə, səmimiyyətinə inandıq.

Azərbaycan teatrının repertuarındakı əsərlərinin sayı etibarı ilə İlyas Əfəndiyev dramaturgiyamızın tarixində birinci yeri tutur desək, yanılmarıq. Lakin o, yaradıcılığa nəsrlə başlamış, ədəbiyyatımıza 1939-cu ildə nəşr edilən "Kənddən məktublar" adlı hekayələr kitabı ilə gəlmişdir.

İlyas Əfəndiyevin "Söyüdlü arx", "Körpüsalanlar", "Sarıköynəklə Valehin nağılı" kimi yazıldığı dövrün gerçəkliyini əks etdirən əsərlərinin qəhrəmanları mərkəzdən uzaq rayonlarda təzə binalar tikən, dağlar qoynundakı fermalara yol çəkən, gur çaylar üstündən körpülər salan, bu binalar, yollar, körpülər vasitəsilə kəndə mədəniyyət aparan, adamların rifahını yaxşılaşdıran, onların qəlbinin dərinliklərinə işıq salan nurlu adamlardır. Həyatın müxtəlif sahələrində çalışan bu qəhrəmanların böyük bir qismi cavan qızlar və oğlanlardır. Lakin yaşından, fəaliyyət sahəsindən, ixtisasından asılı olmayaraq, ədibin qəhrəmanları öz böyük qayəsi, bu qayə uğrunda mübarizədə təzahür edən ehtirası, xarakterinin bütövlüyü, yaşadığı hisslərin, daxili təlatümün

təbiiliyi ilə yaddaşlara həkk olunmuşlar. Bu xüsusiyyətlər keçmiş həyatımızın, tariximizin ən tipik lövhələrini əks etdirən "Üçatılan", "Geriyə baxma, qoca!" romanları üçün də səciyyəvidir.

İlyas Əfəndiyevin pyeslərinin səhnəyə hər gəlişi teatrımıza təzə ab-hava gətirmişdir. Bu təzə ab-havanı təmin edən isə ilk növbədə həmin illəri parlaq surətdə təmsil edən insanların canlı təcəssümüdür. "Bahar suları", "Atayevlər ailəsi", "Sən həmişə mənimləsən", "Mənim günahım", "Unuda bilmirəm", "Məhv olmuş gündəliklər", "Büllur sarayda" və s. kimi hərəsi sənət aləmində özünəməxsus bir iz qoyan həmin əsərlər olmadan Azərbaycan teatrının tarixi xeyli natamam görünərdi.

İlyas Əfəndiyevin pyesləri bu gün də insanları mənəvi təmizliyə çağırır. Dramaturq bəzən tərəddüd edən, hətta müəyyən səhvə yol verən, lakin sarsılmayan, ən mürəkkəb vəziyyətlərdə belə öz insanlıq şərəfini qoruyub saxlamağı bacaran aydın məqsədli qəhrəmanların timsalında müasirlərinə canlı, həyati xarakterlər təqdim edir, onları meşşanlıq bataqlığına yuvarlanmaqdan çəkindirir, vətənpərvərlik qayələrinə, böyük bəşəri ideallara sədaqət və məhəbbət aşılayırdı. Barəsində o biri əsərlərinə nisbətən bir qədər az yazılmış "Büllur sarayda" pyesi bu cəhətdən xüsusilə əlamətdardır. Onun tamaşasına baxanlar, yaxud əsəri oxuyanlar aydın gördülər ki, inzibati rəhbərlikdə, məişət xidmətində, ticarətdə girəvə düşən kimi adamları soyan, gah sadəcə aldatmaq, gah rüşvət, gah da şantaj yolu ilə toplanmış sərvət hesabına yağ içində böyrək kimi bəslənən Qədimlə Ağahüseynin gəmisi xalq nifrətinin qəzəbli dalğaları önündə necə çevrilir, öz sərnişinlərini ədalətin fırtınasında necə qərq edir! Bayandurun, Təbrizin, onların təsiri ilə gözü açılan Aynurun qəlbindən süzülən təmizlik işığında var-dövlət hərisi olan bəzi qeyrətsiz meşşanlar nə qədər cılız görünürdülər! Həyatın mənasını daş-qaşda, çığırqan dəbli paltarlarda, eyş-işrətdə görən əqidəsizlərə, simasızlara sənətin yeni, ağır bir zərbəsini dramaturq məhz "Büllur sarayda" əsərilə endirmiş, belələrini ümumxalq nifrətinin hədəfinə çevirməyə müvəffəq olmuşdur.

İlyas Əfəndiyevin səhnə əsərləri arasında tarixi mövzulara həsr edilən "Xurşidbanu Natəvan", "Şeyx Xiyabani", "Mahnı dağlarda qaldı", "Tənha iydə ağacı" kimi pyeslər də var. Birinci pyes keçən

əsrdə öz zərif, həm də həzin şeirlərilə Azərbaycan poeziyasını zənginləşdirmiş Natəvana, onun xalqın rifahı üçün gördüyü nəcib və xeyirxah əməllərə həsr edilmişdir. İkinci pyesin baş qəhrəmanı isə İranda ictimai ədalət uğrunda mübarizə tarixinə parlaq səhifələr yazmış Azərbaycan oğlu Şeyx Məhəmməd Xiyabanidir. Bu əsərdə inandırıcı epizodlar əsasında göstərildiyi kimi, Səttar xan öldürüldükdən sonra onun mübarizə bayrağını yerə düşməyə qoymayan Xiyabani Rusiyada monarxiyanın süqutundan ruhlanaraq bu bayrağı daha da qətiyyətlə ucaltmış, şah rejiminə qarşı, imperializm müdaxiləsi əleyhinə mübarizəyə ləyaqətlə başçılıq etmişdir. Dramaturq onu gözlənilməz hadisələr labirintində ruhdan düşməyən, düşünüb-daşınan, axtaran və tapan, istədiyini, konkret vəziyyətdə lazım olanı tapmayanda isə həyəcanlar qoynunda çırpınan həyati bir obraz kimi canlandırmışdır. Milli Akademik Dram Teatrının səhnəsində mükəmməl tamaşasına baxdığımız "Hökmdar və qızı" əsəri isə dramaturqun tarixi mövzuda yazılmış sonuncu kamil səhnə əsəridir. Bu faciə əsasında teatrımızın xalqa bəxş etdiyi sənət "Qarabağnamə"sinin sədası Qarabağ düşmən tapdağından azad edildikdən sonra da həmişə eşidiləcəkdir!

* * *

Yeni Azərbaycan nəsrinin canlı, təravətli, bədii surətlər, əlvan təsvir vasitələri və incə təfərrüatlarla zənginləşməsində dramaturgiyamızda lirik-psixoloji üslubun inkişafında İlyas Əfəndiyevin böyük yaradıcılıq xidmətləri unudulmazdır. Yarım əsrlik dramaturqluq fəaliyyəti ərzində onun səhnəmizə verdiyi qiymətli əsərlər əsasında hazırlanmış tamaşalarda aktyor və rejissor kadrlarımızın, bəstəkar və rəssamlarımızın bütöv bir nəsli yetişib püxtələşmiş, estetik fikirdə yeni "İlyas Əfəndiyev teatrı" bərqərar olmuşdur.

İlyas Əfəndiyev həm nəsr, həm dram əsərlərini cazibədar bir üslubda, şirin dillə yazır, ilk təsvirlərdən, ilk dialoqlardan oxucu və tamaşaçı qəlbini fəth edirdi. Hələ ilk əsərlərindən olan "Bahar suları" pyesinin şeriyyətini vaxtilə xalq şairi S.Vurğun yüksək qiymətləndir-

mişdir. Həmin keyfiyyət ədibin əsərlərində zaman keçdikcə daha da büllurlaşmış, dramaturq və nasir kimi onun fərdi üslubunu müəyyənləşdirən amillərdən birinə çevrilmişdir. Elə buna görədir ki, hər dəfə İlyas Əfəndiyevin hər hansı pyesini səhnədə görənlər, yaxud romanını oxuyub son səhifəsini çevirənlər həm də dilimizin məna dərinliyi, ifadə gözəlliyi və ahəngdarlığı ilə yaxından təmasda olduqları üçün razılıq duyğusu yaşayır, bir daha fəxr edirlər ki, doğma dilimiz böyük ictimai və estetik həqiqətləri, güclü fikir və ehtirasların vüsətini, insan qəlbinin ancaq böyük sənətkarların işıqlandıra bildiyi incəliklərini yüksək bədii səviyyədə əks etdirmək baxımından belə geniş imkanlara malikdir!

Məhz bu keyfiyyətlərinə görə İlyas Əfəndiyevin əsərləri onların nəşr olunmasından və tamaşaya qoyulmasından on illər keçməsinə baxmayaraq, öz fikri-bədii təravətini həmişə qoruyur, oxucu və tamaşaçıların, tənqidçi və tədqiqatçıların yeni-yeni nəsillərinin mənəvi dünyasında və ədəbiyyatımızın tarixində öz şərəfli mövqeyini qoruyub saxlayır. Ədibin "Seçilmiş əsərləri"nin bu üçcildliyi də dediklərimizi parlaq surətdə təsdiq etməkdədir. Bu baxımdan sözü gedən cildlərin bir cəhətinə diqqəti cəlb etməyi lazım bilirik. Bu kitablarda toplanmış hekayə, povest və romanların, dram əsərlərinin onlarla səhifələrinin həmin əsərlərin əlimizdə olan irəliki (sovet dövrü) nəşrləri ilə müqayisəsini apardıq və qeyd etmək çox fərəhlidir ki, mətnlər arasında heç bir ciddi fərq görmədik. Düzdür, həmin nəşrlərin həyata keçirildiyi illər arasındakı fərq xronoloji baxımdan o qədər də çox deyil. Lakin nəzərə almaq lazımdır ki, bu illər ərzində vətənimizdə köklü tarixi-ictimai hadisələr baş vermiş, Azərbaycanda müstəqil demokratik dövlət qurulmuş, ədəbi irsə münasibətdə yeni, obyektiv meyarlar bərqərar olmuşdur. Acınacaqlı olsa da, İlyas Əfəndiyevlə eyni onilliklərdə fəaliyyət göstərmiş bəzi ədib və şairlərin əsərlərinin yeni nəşrlərini hazırlamaq məsələsi gündəmə gələndə məhz bu yeni meyar işığında onların bir çox əsərləri çıxdaş olunur, yaxud, mətnlərdə hansısa qaçılmaz düzəliş və ixtisarlar aparılması zərurəti meydana çıxır. Leninə, Stalinə, sosializmə, partiyaya dair şüar və şit təriflərlə dolu olan bu cür yazılardan tamamilə fərqli olaraq İlyas Əfəndiyevin əsərləri azərbaycançılığın ilk növbədə məhz ədəbi milli-

mənəvi dəyərlər, yüksək bəşəri ideallar işığında təqdimindən və tərənnümündən ibarətdir.

Seçilmiş əsərlər külliyyat demək deyil və bu səbəbdən də İlyas Əfəndiyevin qələmindən çıxmış əsərlərin bir qismi üççildlikdə yoxdur. Xüsusən onun hekayələr toplularından tərtibçi haqlı olaraq daha dolğun nümunələri seçib birinci cildə salmışdır. Lakin bu nəşrin unikallığı öz həcm imkanları daxilində İlyas Əfəndiyev irsini kifayət dərəcədə hərtərəfli əks etdirməsindədir. Müqəddiməni nəzərə almasaq birinci cild əsasən ədibin bütün yaradıcılığı boyu vaxtaşırı müraciət etdiyi və gözəl nümunələrini yaratdığı hekayə janrındakı əsərləri üçün ayrılmışdır. İkinci cilddə İlyas Əfəndiyevin bir sıra pyesləri toplanmışdır. Onların arasında dramaturqun "Atayevlər ailəsi", "Sən həmişə mənimləsən", "Məhv olmuş gündəliklər" kimi hər biri səhnə sənətimizin tarixində hadisəyə çevrilən pyesləri, "Xurşidbanu Natəvan" kimi tarixi dramı var. "Söyüdlü arx", "Geriyə baxma, qoca" kimi çox populyar romanlar üçüncü cilddədir.

* * *

Məmnuniyyətlə qeyd edirəm ki, ədibin ayrı-ayrı romanlarının çağdaş ədəbi prosesdə mövqeyini düzgün müəyyən edən bəzi tədbirlərin iştirakçıları (təşkilatçıları) arasında mən də olmuşam.

Məlum həqiqətdir ki, qısa müddətdə geniş oxucu auditoriyası qazanmaq və ədəbi mühitdə sözün yaxşı mənasında bir təlatüm əmələ gətirmək baxımından İlyas Əfəndiyevin bu nəşrə salınmış "Söyüdlü arx" romanı öz dövrünün qiymətli sənət nümunəsi olaraq qalır. 1959-cu ildə kitab halında buraxılmış bu əsər o vaxtadək bir hekayənəvis və dramaturq kimi məşhur olan İlyas müəllimin yeni yaradıcılıq imkanlarından, orijinal roman təfəkkürünə malik olduğundan xəbər verirdi. Bu roman haqqında o illərin qocaman ədiblərindən, gənc şairlərindən başlamış görkəmli tənqidçilərinə qədər bir çox müəlliflər məqalə və resenziyalarla çıxış etmiş, çoxlu oxucu məktubları nəşr edilmişdi. Bir gənc tənqidçi olaraq mən o zaman Azərbaycan KP MK-nın orqanı olan "Kommunist" qəzetinin redaksiyasında mədəniyyət şöbəsinin

müdiri vəzifəsində çalışırdım. Əsər məni elə mütəəssir etmişdi ki, onun haqqında kiçik bir resenziya yazmaq niyyətindən vaz keçdim. Belə qərara gəldim ki, yazıçının özü ilə məsləhətləşib əməkdaşı olduğum qəzetin xətti ilə mənim doğma yurdum Ağdaşda "Söyüdlü arx" romanı ətrafında geniş bir oxucu konfransı keçirək. Razılaşdıq (Onu da deyim ki, əsərlərini hələ 1945-ci ildən mütaliə etsəm də ədibin özü ilə 10 il sonra, 1955-ci ilin yayında Şuşada tanış olmuşdum. Mən və dostum Əliağa Kürçaylını İlyas müəllimgilə ikimizin də dostumuz, Əfəndiyevlər ailəsinə məhrəm olan Qasım Oasımzadə aparmışdı. Elə o vaxtdan ədiblə ünsiyyətimiz tutdu və mənim bu gün də iftixar duyğusu ilə əziz-əziz xatırladığım dostluğumuzun əsası qoyuldu). İlyas müəllimi Ağdaşa aparmaq, ona dədə-baba evimizdə hörmət etmək üçün əlimə yaxşıca fürsət düşmüşdü. Lakin 1960-cı ilin sərt bir fevral günündə bölgəyə (rayona) getmək məsələsi reallaşanda bir qədər soyuqlamış İlyas müəllim dedi: "Bəkir, oxucuların öz mülahizələrində sərbəst olmasına şərait yaratmaq çox vacibdir. Mənim yanımda onlar "etikanı güdmək" xətrinə tənqiddən çəkinə bilərlər. Yaxşısı budur müzakirələrini keçirib nəticəsini mənə deyəsən". Sonra yazıçı "Hörmətli Ağdaşlı yoldaşlar!" müraciətilə başlanan səmimi bir məktub da yazıb mənə verdi... Həmyerlilərimizlə bir yerdə Ağdaşın mədəniyyət evində keçirdiyimiz oxucu konfransı uğurlu oldu. Onun materialları çıxış edənlərin şəkilləriylə birlikdə "Kommunist" qəzetinin 26 fevral 1960-cı il tarixli nömrəsində bütöv bir səhifə halında dərc olundu və mən həmin qəzetin bir nüsxəsinin üstünə bir neçə xatirə sözü yazıb İlyas müəllimə yadigar verdim...

Bu da maraqlıdır ki, sovet dövrü bədii nəsrində 60-cı illərin əvvəllərində ilk bahar qaranquşu kimi təravətli təsir bağışlayan, həm də o zamankı ədəbi mühitdə heç də birmənalı qarşılanmayan "Körpüsalanlar" povestinin ilk oxucusu makinaçı Sona xanımdan və Elçindən sonra mən olmuşam.

1960-cı ilin ortaları idi. "Kommunist" qəzetinin redaktoru, qocaman jurnalist İsrafil Nəzərova dedim ki, İlyas Əfəndiyev qəzetlərdə bədii əsər çap etdirməyə həvəs göstərən müəlliflərdən deyil. Ondan xahiş edib boynuna bir yazı (məsələn, müxtəsər hekayə) qoysanız çox yaxşı olar. Bir neçə gündən sonra redaktor məni yanına çağırıb

"Körpüsalanlar" povestindən bir parçanı verdi və oxuyub çapa hazırlamağı məsləhət gördü. Mən səhəri gün redaktora dedim ki, bu çox maraqlı bir parçadır, obrazlar arasında əsasən onların düşüncə və dialoqunda özünü büruzə verən təravətli münasibətlər, maraqlı hadisələr və rəvan dil elə təsir bağışlayır ki, həmin parçanı oxuyan adam mütləq əsərin hamısını mütaliə etməyə daxili ehtiyac duyur. İsrafil müəllim də sözügedən parçadan məhz bu cür təsirləndiyini söylədi və mənim yanımdaca telefon açıb İlyas müəllimə dedi ki, oxuduğu hissə çox xoşuna gəlir və əsərin hamısını nəzərdən keçirmək üçün xahiş edir ki, povestin tam halda ona göndərsin. İlyas müəllim əsəri göndərdi. Beləliklə də, "Körpüsalanlar"ı Əfəndiyevlər ailəsindən sonra ilk dəfə tam halda oxumaq, onun haqqında redaktorda konkret obyektiv rəyin formalaşmasına kömək etmək şərəfi mənə nəsib oldu. Bunu xatırlayanda, üstündən 45 il keçdiyinə baxmayaraq bu gün də duyğulanıram... Həmin il sentyabrın 7-dən başlayaraq "Körpüsalanlar" müntəzəm olaraq parçalar halında qəzetdə çap olunmağa başladı (Respublika partiya təşkilatının xüsusi göstərişi ilə bu əsərin çapının yarımçıq dayandırılması başqa bir yazının mövzusudur).

"Sarıköynəklə Valehin nağılı" da təxminən 25 il bundan əvvəlki bəzi hadisələri gözlərim önündə canlandırır. Azərbaycan bədii nəsrinin klassik nümunələri sırasında layiqli yer tutmuş bu romanın da yolu şahraq olmamışdı. Əlbəttə, İlyas müəllimin digər əsərləri kimi "Sarıköynəklə Valehin nağılı" da oxucular və tənqidçilər arasında geniş maraq doğurmuşdu. Mən də bu əsərdən çox mütəəssir olmuş və o zaman Yazıçılar İttifaqına rəhbərlik edən İmran Qasımova müraciət edərək romanın Yazıçılar İttifaqının Natəvan klubunda geniş müzakirəsini keçirmək haqqında təşəbbüs irəli sürmüşdüm. Təşəbbüs qəbul edilmiş, ədibin özü ilə razılaşdırılmış, həmin tədbirdə məruzə etmək də mənə həvalə olunmuşdu. Həm təcrübəli, həm də gənc qələm sahiblərinin fəal iştirak etdiyi müzakirə yüksək səviyyədə keçdi və əsər layiq olduğu qiyməti aldı, onun fikri-bədii keyfiyyətləri geniş təqdir olundu, məruzə və çıxışlar "Ədəbiyyat və incəsənət" qəzetinin 14 may 1977-ci il tarixli nömrəsində dərc edildi. Lakin müəllif də, məruzəçi olaraq mən də bu hadisənin fərəhini əməlli-başlı yaşamamışdıq ki, birdən-birə bu romanın taleyinin üzərini qara buludlar

aldı. İlyas Əfəndiyevin istedadına qısqananlardan kimsə yuxarılara məlumat vermişdi ki, "bu roman inkişaf etmiş sosializm cəmiyyətinə yad bir əsərdir". Yeri gəlmişkən, qeyd edim ki, "Sarıköynəklə Valehin nağılı"nda o zamankı hüquq mühafizə orqanlarında yuva salmış çox ciddi neqativ hallar kəskin bədii tənqidin hədəfi olmuşdur. Bəli, Yazıçılar İttifaqının, "Ədəbiyyat və incəsənət" qəzetinin rəhbərlərindən izahatlar tələb olundu, MK-da ideoloji işə başçılıq edənlər bu məsələ ilə əlaqədar olanlara, o cümlədən də, təbii ki, təşəbbüskara və məruzəçiyə əyri-əyri baxmağa başladılar. Nəhayət, İmran Qasımovun xahişi ilə o zaman Respublika partiya təşkilatına rəhbərlik edən Heydər Əliyev işə qarışandan sonra "Sarıköynəklə Valehin nağılı" ətrafında qızışan təqib və təxribata son qoyuldu...

Yeri gəlmişkən, qeyd etməyi vacib sayırıq ki, Azərbaycan Respublikasının prezidenti cənab Heydər Əliyev İlyas Əfəndiyevin əsərləri ilə yaxından tanış olmuş, pyeslərinin tamaşalarına baxmış, çıxışlarından birində etiraf etdiyi kimi, onun "bütün yaradıcılığını böyük minnətdarlıq hissilə xatırlamışdı".

***

Üçcildlik "Seçilmiş əsərləri" böyük ədib İlyas Əfəndiyev dünyasını dəyişəndən sonra onun öz oxucuları ilə növbəti sanballı görüşüdür. Biz cildlərdə əhatə olunan və o zamanın sınaqlarından çıxmış əsərləri nəinki geniş təhlil edə bilmədik, hətta onların bir çoxunun barəsində təəssüratımızı belə istədiyimiz ölçülərdə əks etdirə bilmədik. Bununla belə, göstərməyi vacib sayırıq ki, oxucuların sevimli sənətkarla, onun seçilmiş əsərlərinin üç cildi zəminində reallaşan mənəvi görüşü uğurla baş tutmuşdur.

***Bəkir Nəbiyev***
akademik

# GÖZLƏNİLMƏYƏN SEVGİ

Darülfünunda dərslərin başlandığının dördüncü günü idi. Foyedə gənc bir oğlanla yaşlı bir qadın dayanmışdı. Hamı maraqla onlara baxırdı. Uca boyu, enli kürəyi olan bu qadın qara yun parçadan uzun tuman, ətəkli arxalıq geymişdi. Qara, sürməli gözləri sükutla baxır, günəşdən yanmış üzü soyuq bir qayğı ifadə edirdi. O, kimsəyə baxmadan nə haqqında isə düşünür və çubuq çəkirdi. Yanındakı ucaboylu oğlan olduqca şux geyinmişdi, lakin son dərəcə çirkin idi. Üzü çopur, burnunun ortası yəhər kimi yastı idi. Dodaqları qaba surətdə irəliyə doğru uzanmışdı. Cod və bozumtul kimi görünən saçları alnında bir bucaq təşkil edir və az qala burnuna qədər uzanırdı.

Xidmətçilərin biri onlara yaxınlaşaraq:

– Direktor gəldi, – dedi.

* * *

– İmtahanlar qurtarıb, yerimiz dolub, xala, – deyə direktor qadına baxdı.

– Birtəhər elə, ağrın alım... rayonumuz çox uzaqdır. Ona görə gecikmişik, – deyə qadın quru, bir az da amiranə səslə cavab verdi.

Qadının üzü tutuldu. Uzun, enli qara qaşları çatıldı. Çubuğunu dərindən sümürərək fikrə getdi. Pəncərənin qabağında dayanmış oğlan soyuq baxışlarla çölə baxırdı.

O, hamıda təəccüb oyadan bir məharətlə imtahan verib riyaziyyat fakültəsinə daxil oldu. Özünü olduqca sakit və ciddi aparmasına baxmayaraq, az zaman içərisində fövqəladə istedadı ilə hamımızı heyran etdi. Ən güclü riyaziyyatçı, ən yaxşı radist idi. Qırx nəfər yaxşı şahmatçı ilə eyni zamanda oynayar və həmişə də qalib gələrdi. Bütün müəllimlərimiz ondakı səlis, axıcı natiqlik məharətinə qibtə edərdilər. Onun məharəti bunlarla bitmirdi. O, ən gözəl snayperlərdən hesab oluna bilərdi. Həmişə birinci mükafatı o qazanardı. O, az zaman içərisində bizim aramızda təsəvvürə gəlməz bir hörmət qazandı. O, hamıdan gözəl geyinir, başını dik və məğrur tutaraq gəzir, həmişə teatrlarda birinci sırada otururdu. Pul xərcləməyə onda düşgünlük hesab olunacaq dərəcədə şiddətli bir arzu vardı. Onunla aşxanaya, teatra və qeyri yer-

lərə gedən adam əlini cibinə salıb pul xərcləmək istədikdə, o, dilxor olar və “mənim hesabımadır!” sözlərini o qədər şən və həvəslə söyləyərdi ki, adam onun diləyini pozmaq istəməzdi. İnsan ən sıxıntılı vaxtında belə, onun yanında özünü sərbəst və şən hiss edirdi. Ondakı bu tükənməz fərəh bir çoxlarını təəccübləndirirdi. Sanki öz taleyinin hökmünə tabe olaraq, o, güzgüyə baxıb heç bir zaman gülməməli imiş...

* * *

Darülfünunda yuxarı sinif tələbələrindən tutmuş professorlara, hərbi müəllimlərə qədər hamı ona etimad bəsləyir və hörmət edirdilər. Lakin ona yalnız bir adamın münasibəti qəribə idi. Bu, bizim sinifdə oxuyan Gülara adlı bir qız idi. Həsən nə qədər çirkin idisə, Gülara o qədər gözəl idi. İri, qara gözləri tükənməz bir cəsarətlə yanırdı, qəşəng cizgili nazik dodaqları vardı. Üzündən gülüş əskik olmazdı. Özünü şax tutaraq, kimsəyə məhəl qoymadan getdiyi zaman bütün tələbələr arxasınca baxardılar. Hər işdə birinci olmaq üçün bu qızda qarşısıalınmaz bir həvəs var idi. Bilmədiyi bir şeyi başqası izah etdikdə və ya verilmiş bir məsələni sinifdə hamıdan qabaq Həsən həll edib verdikdə, qız utanar, qızarar, bəzən də özünü saxlaya bilməyərək, uşaq kimi ağlamaq dərəcəsinə gələrdi. O, heç bir vəchlə Həsənin itifikirli və qabaqcıl olmasına dözə bilmirdi. Etiraf edim ki, bizim içərimizdə bu qızla rəqabət edə biləcək yalnız Həsən idi. Gülaranın böyük bir həvəslə birincilik qazanmaq istədiyi bir işi Həsən heç bir güc sərf etmədən asanlıqla həll edir və hamını ötüb keçirdi.

Xatirimdədir: bir dəfə yaz imtahanlarından birində Gülaranın yarım saat əlləşərək həll edə bilmədiyi bir məsələni Həsən beş dəqiqənin içində həll etdi. Bu zaman qız, Həsənə kin və qəzəb dolu amansız bir nəzər salaraq, tabaşiri əzib yerə tökdü. Çox vaxt Gülara haradansa elə çətin məsələlər tapırdı ki, bizim başımız taqqıldayırdı. Lakin, Həsən soyuqqanlılıqla məsələnin cavabını çıxardıqda, qız dərindən köksünü ötürər, alt dodağını dişləyərək heç kəsin üzünə baxmadan çıxıb gedərdi.

Mühazirədə oturduğumuz zaman mən hiss edirdim ki, onun xəyalı müdərrisdən çox Həsənin ətrafında dolaşır. Əlini çənəsinə söykəyərək, oğrun baxışlarla onun hər bir hərəkətini, geyimini, qalstukunu, saçlarının vuruluşunu nəzərdən keçirirdi. Lakin mən bir dəfə də olsun, Həsənin Gülaranın üzünə dik baxdığını görməmişdim. Şən və zarafatlı

olmasına baxmayaraq, o, heç bir zaman bu qız haqqında danışmaz, onun tikanlı zarafatlarına heç bir cavab verməzdi. Bəzən bu qızın gözəlliyi haqqında söhbət düşdükdə, onun üzü birdən-birə tutular, qəti bir hərəkətlə dərhal söhbəti dəyişdirərdi. Bir dəfə hərbi təlim zamanı Gülara əlli mümkün xaldan qırx dördünü toplayaraq, birinci yerə namizəd oldu. Onun bu müvəffəqiyyəti cavan oğlanları heyrətləndirdi. Bu vaxt haradansa Həsən gəlib çıxdı. Bayaqkı küt susqunluq gurultulu bir canlanmaya çevrildi.

– Bircə Həsən qalıb... görək də... Həsən tüfəngi al! – deyə tələbələr oradan-buradan səsləndilər.

Uşaqlar Gülaraya işarə ilə bir-birilərinə göz vururdular. Gülara qızğın bir təbəssümlə Həsənə baxırdı. Həsən tüfəngi götürüb hər dəfə nişan alarkən, Gülaranın dodaqları xəfifcə tərpənir, ürəyinin döyündüyü nazik paltarla örtülmüş döşünün tez-tez qalxıb-enməsindən bilinirdi. Həsən dördüncü güllədə otuz beş xal yığdı. Araya dərin bir sükut çökdü. Tələbələrdən bəziləri yavaşca sivişdilər. Ehtimal ki, onun qırx dörd xalı keçəcəyinə ümid etmədilər. Gülaranın üzü bir az açıldı, gözləri şən bir həyəcanla parladı. O, bir yerdə dayana bilmir, gah o yana, gah bu yana keçirdi. Doğrusu, burada mən də Həsənə ürək verdim. Bu, deyəsən, ona bir az toxundu. Mülayim bir nəzərlə mənə baxdı. Ani bir nişanla gülləni atdı.

– Ura!!! – deyə hamı birdən qışqırdı.

Güllə tam “10” rəqəminin üstündən dəymişdi. Qəribə burasıdır ki, Həsənin Gülara üzərindəki qələbəsi sanki hamının ürəyindən imiş. Şadlıq hamını bürüdü. Gülara bu istehzalı gurultunu hiss etməyirmiş kimi qəribə bir təbəssümlə Həsənə baxırdı. Heç bir zaman xatırımdan çıxmayacaq bu baxış o qədər dərin mənalar, şəfqətli, incə duyğular söyləyirdi ki, onları sözlə anlatmaq deyil, hiss etmək lazımdı. Mən gözəl qızın bu həzin və incə təbəssümündə, yaşla dolmuş gözlərində birinci dəfə olaraq, qüruru qırılmış, bakirə bir qız könlünün pərişan, əzgin həyəcanını duydum. Qürurlu bir gəncin məğlubiyyətinin nə demək olduğunu hiss etdim... Hamı gənc qıza, onun məğlubiyyətindən mülayimləşmiş zərif təbəssümünə kin və istehza ilə baxırdı. Sanki “hə, indi necəsən?” demək istəyirdilər. Guya ki, Həsənin çirkinliyində bu yazıq günahkar imiş. Mən, gözəl qızın o unudulmaz baxışında, birinci dəfə olaraq, çirkin dostuma qarşı mərhəmətmi, yanıqlıqmı, sevgimi, bilmirəm... incə, xoş bir şeyin titrədiyini və bunun xəfif bir ahla qurtardığını

sezdim... Bu duyğu mənə həm xoş gəldi, həm də nə üçünsə izzəti-nəfsimə toxundu. O, “bəlkə də bu qəhrəman, lakin çirkin oğlanın yerində gözəl bir gənc görmək istəyirdi. Yoxsa, bunun belə olmadığına təəssüf edirdi... Kim bilir, bəlkə də onun məğlub könlündə cilvələnən aydın, şirin duyğular üzərinə çirkinliyin qara buludu çökürdü... Bəlkə də, gənc qız bu soyuq, eybəcər buludu könlündən qovmaq əzabı çəkir” deyə düşünürdüm.

Həsən ona yaxınlaşaraq, üzünə baxmadan:

– Pərt olmayın, Gülara, – dedi, – bu tamamilə təsadüfi bir işdir.

Gülara boynunu azca sola əyərək, şəfqət qarışıq, bir növ, istehzalı təbəssümlə “doğrudanmı?” deyə kəlməni xüsusi bir əda ilə uzatdı. Həsən heç bir cavab vermədən sakitcə uzaqlaşdı.

* * *

Bu hadisə biz üçüncü kursda oxuduğumuz ilin baharında oldu.

Bundan sonra Həsənin hərəkətlərində kəskin bir dəyişiklik əmələ gəldi. O, birdən-birə soyuq, sakit və fikirli oldu. Hiss edilmədən gəlib yerində əyləşir, dərs qurtaran kimi də hara isə gedirdi. Demək olar ki, kimsə ilə danışmırdı.

Gülara da son zamanlarda büsbütün dəyişmişdi. Gözlərində kədər qarışıq mülayim bir ifadə yaranmışdı. Fikri dağınıqdı, artıq birincilik üçün atılıb-düşməyən sakit bir qız olmuşdu.

Mən hiss edirdim ki, Həsənin həmişə ondan qaçmasına baxmayaraq, Gülara hər bir fürsətdən istifadə edib, onunla danışmaq istəyir, bəzən çox ehtimal ki, özünün də həll edə biləcəyi bir məsələni “çətindir” deyə Həsənə həll etdirir, məzəli sözlərlə onu güldürməyə çalışırdı...

Bütün bunlar bizə qəribə gəlirdi. Təəccüblə bir-birimizdən “bu nə işdir” deyə soruşurduq. Bəzən hamımızın aciz qaldığı bir sualı Həsən öz sakit, şirin sözləri ilə aydın bir şəkildə izah etdikdə, Gülaranın iri gözləri parlayır, müəllimin razılığı onun dodaqlarında isti bir təbəssümə səbəb olurdu... Əvvəllərdə yaraşıqlı gənclərə qarşı o qədər də laqeyd olmayan Gülara, indi demək olar ki, kimsə ilə yaxınlıq etmirdi.

Bir dəfə idman təlimi zamanı beş kilometri hamıdan tez qaçıb, birinci dəfə lenti qıran Həsənə baxan Gülara öz-özü ilə danışırmış kimi “bax, əsl kişi buna deyərlər” deyə pıçıldadı. Eyni zamanda, Həsənin

qızarıb tərləmiş üzünə, qabarmış saçlarına baxaraq, təntimiş bir hərəkətlə üzünü çevirdi. Əlində tutduğu çiçəyi dırnaqları ilə didib yerə tökdü. Mənə elə gəldi ki, o, indicə hönkürtü ilə ağlayacaq...

Mən, "çirkinlik buludu" deyə düşündüm.

* * *

Bir gün bərbərxanadan çıxdığımız zaman Həsən güzgüyə ötəri bir nəzər salaraq:

– Ay Bahadır! – dedi. – Görəsən, niyə mən bu qədər çirkin olmuşam?

Onun səsi boğazında titrədi.

Mən, birinci dəfə olaraq, onun varlığında müdhiş bir əzab duydum: çirkinlik əzabı! Nər ürəyinə malik olan bu cavanın belə bir duyğunun məngənəsində inləməsi ürəyimi dağladı. Uzun zaman heç nə söyləyə bilmədim. Nəhayət:

– Nə boş şeylər haqqında düşünürsən, Həsən! – dedim.

O gülümsədi... Ah, bu təbəssümdəki dərin, ümidsiz kədəri duysaydınız...

– Nə etməli, ay Bahadır... Mən də insanam... Məndə də könül var, – dedi.

Mən, bu sözlərdən tüklərimin biz-biz durduğunu hiss etdim.

– Gedək bizə, – dedi. – Ürəyim qısılır, bir az oturaq.

Getdik. Açıq pəncərədən yaşıl bağlar, bürkü içində mürgüləyən təpələr görünürdü. Söyüd və qovaq ağaclarının açıq yaşıl, yüngül yarpaqları aramsızlıqla titrəşir, ləkəsiz göy qübbəsi qüruba yaxınlaşmış günəşin zəif şüalarını udur, havada xoş bir sərinlik duyulurdu.

Həsən yanağını şüşəyə söykəyərək çölə baxırdı. Üzünün çirkin cizgiləri solğun, həlim bir məyusluq ifadə edirdi. Bu hal yarpaqların sərin kölgələri ilə birləşir, əbədi və təbii görünürdü. Adama elə gəlirdi ki, onun könlündə dibsiz bir kədər dənizi var...

– Niyə son zamanlarda belə olmusan, Həsən? – dedim.

Üzü qüssə saçdı. Nəzərləri uzaqlara getdi.

– Səncə, bəs, nə cür olmalıyam? – dedi.

– Əvvəlki kimi, şən... – dedim.

O, təəccüblə mənə baxdı. Gözləri kinlə parladı.

– Doğrudanmı, belə düşünürsən? – dedi, – indiyə qədər haqqım olmadığı halda şənlik etdiyim bəs deyilmi? Arsızlıq nəyə lazımdır?

– Nə danışırsan, Həsən, – dedim. – Sən lap xarab olmusan. Bu sözlər heç sənə yaraşarmı?

– Çox təəssüf ki, belədir. Bu bədbinlik deyil dostum, həqiqətdir!

O, əli ilə çölləri göstərərək:

– Baxırsanmı? – dedi. – Bu dünyada hər şey öz gözəlliyindən bəhs edir. Hər bir canlı öz zahiri gözəlliyini nümayiş etdirir. Qəribədir... budağa qonmuş o quşa bir bax! Gör bir döşünü necə qabartmışdır. Sanki: "Bir baxın... görün mənim necə əlvan döşüm var..." demək istəyir.

– Nə olsun ki? – dedim.

O, dərin bir nəfəs alaraq güzgüyə baxdı. Dodaqlarını nifrətlə əydi:

– Onu demək istəyirəm ki, bu çirkinliklə mən dünyada kimə lazımam?

– Necə, sən həyatı, məgər, gözəl simalardamı görürsən?

– Yo-o-ox... – deyə uzadaraq fikrə getdi.

Axşamın sərin yeli üzümüzü oxşayır, uzaqdan bizə doğru ağ bir bulud parçası üzür, yaşıl budaqlar yavaş-yavaş yırğalanır, insan, könlündə xoş bir rahatlıq hiss edirdi.

– Səadətin yalnız üz gözəlliklərində olmadığını bilirəm, – deyə o, arxayın bir ifadə ilə davam etdi. – Ancaq nə edəsən ki, insan insandır. Bu canlı vücud da sevib-sevilmək istəyir. İradən dağ kimi də olsa, yenə görürsən bu tələblər səni sarsıdır. Çünki bu tələblərin təmini həyatın mənası, gələcəyin yoludur. Ancaq onda yazıq olursan ki, bu yola addım basmaq üçün sən özünü haqlı bilmirsən... O zaman sən özünü həyatın bir küncünə qısılmış, mənasız surətdə o yan-bu yana əl-qol atan kimi görürsən... Dostum, sən, bəlkə də, burada məni tənqid edəcəksən... İctimai səadətdən danışacaqsan. Bu, əlbəttə, doğrudur. Lakin bir düşün, könlün təbii ehtiraslarını kim inkar edə bilər? Əgər, bunu inkar etmək mümkün olsaydı... Bu qədər çirkin bir sima ilə hasarlanmış könül heç nə ilə hesablaşmaq istəmir... Mən ona qandıra bilmirəm ki, bir düşün, əzizim, bir təsəvvür et ki, xarici görünüşün Viktor Hüqonun Kvazimodasından da eybəcərdir. Sakit ol! Lakin kimə deyirsən... Hiss edirsən ki, sənin yazıq könlün də sevgiyə susayır. O da coşub-daşmaq istəyir... Sən isə, öz murdar simana baxıb, qəlbin bu gülünc tələbindən utanırsan.

O, müdhiş bir təbəssümlə gülümsədi. Nəzərləri yarpaqlarda dolaşdı. Günəş sönürdü. Bağlar tünd işıqlı bir görünüş alır, səmadakı bulud parçası getdikcə qaralırdı. Mən dedim...

– Bilmirəm bunlar haradan başına doldu? Sən əvvəllərdə o qədər şən idin ki...

– Çünki məni təhqir etdilər. İzzəti-nəfsimi yaraladılar. Könlümü boş ümidlərlə təlatümə gətirdilər.

Bu sözlərdən sonra o, mənim qarşıma kiçik bir zərf atdı.

– Mənə vicdanla söz ver ki, bu barədə kimsəyə bir söz söyləməyəcəksən, – deyə əsəbi surətdə gözlərimin içinə baxdı.

– Arxayın ola bilərsən, – dedim.

Zərfi açdım, incə bir xəttlə belə yazılmışdı: "Həsən! Bu məktubu öz-özümlə uzun mübarizədən sonra yazıram. Sizin geniş, nəcib qəlbiniz qarşısında tab gətirə bilmədim, heç olmazsa, məni qınamayacağınızla təsəlli tapa bilərəm. Əgər, azca da olsa, iradəm çatsaydı, bəlkə də, yazmazdım. Birinci dəfə könlümdə duyduğum narahatlıq əvvəllərdə məni qorxutdu... Bunun nə demək olduğunu uzun zaman anlaya bilmədim... Bunun sevgiyə bənzər şey olduğunu öz-özümə belə təkrar etməyə xeyli zaman cəsarət etmədim. Geniş qəlbiniz şirin bir yuxu kimi məni cəzb etdiyi zamanlar dırnaqlarımla sinəmi didərək, hönkür-hönkür ağladım. Zənn edirəm ki, məni sizə bağlayan hisslər haqqında çox da düşünməyəcəksiniz... Ürəyinizə başqa heç nə gəlməyəcəyinə əminəm. Sizdəki yüksək qəlb mənim üçün dünyada hər şeydən qiymətlidir. Onu məndən əsirgəməyin!"

Məktubun axırında əsəbilikdə yazılmış "Gülara" imzasını gördükdə, mən gözlərimə inana bilmədim. Öz heyrətimi gizləməyə çalışaraq:

– Yaxşı da... daha burada nə təhqir var ki? – dedim.

Üzümə acı təbəssümlə bir nəzər saldı:

– Sanki anlamırsan? – dedi.

– Nə olsun ki, mən də qız olsaydım, sənin kimi qəhrəman bir gəncdən keçməzdim, – dedim.

– Paho... qəhrəmanlıq! Bəs, bu sir-sifəti hara qoyaq... yox! Mən bunun necə sevgi olduğunu anlayıram. O, öz hədəfində yanılmadı. Ən yaralı yerimdən vurdu! Görürsənmi "məni sizə bağlayan hisslər haqqında çox da düşünməyəcəksiniz" deyir... Bunun nəyə işarə olduğunu anlamırsanmı? Yox! O, öz gözəlliyinin qalibiyyət təntənəsini görmək istəyir. O, mənim qırx altı xalıma qarşı əlli xal vurmaq istəyir... Sən necə düşünürsən? O, məni necə sevə bilər? İnsafla danış, hansı bir qız

iyrənmədən mənə baxa bilər. Ah, insanın təbiəti... sən nə qədər qəribəsən... onsuz da şikəst olan bir oğlana belə istehza etmək, ürəyindən yaralamaq onun nəyinə lazımmış?

Onun səsi həyəcanlı akkordlardan sonra birdən-birə titrəyib incələn musiqi kimi ötüb susdu. Mənə elə gəldi ki, Həsən öz şübhələrində bir az haqlıdır. Doğrudan da, Gülara kimi bir qızın Həsənə vurulması bir qədər təəccüblü görünə bilərdi. Gülaranın əvvəlki məğrurluğunu da nəzərə aldıqda, bu şübhə daha da qüvvətlənirdi.

Lakin qadın könlünün sirlərini kim olduğu kimi anlaya bilərdi?

– Əziz dostum! – deyə əlavə etdi. – Sən məni bədbinlikdə təqsirləndirmə. Lap uşaqlıqdan hər cürə ah-zara nifrət edirəm. Beş yaşında ikən gözümün qabağında altı qardaşımı, bir atamı xəngəl kimi doğradılar. İllər boyu bir tikə çörək üçün anamın onun-bunun qapısında paltar yuduğunu gördüm. Səkkiz yaşında bir uşaq ikən ayaqyalın, soyuqda, boranda başqalarına quzu otardım. Aclığın nə olduğunu gördüm. Lakin ürəyimə ələm girmədi, dərd çəkmədim... İndi isə... İndi isə, ürəyimdə qaynayan kədərin qarşısında durmağa iradəm çatmır... Eh...

O, başını bulayaraq, söyüd ağacının yırğalanan budağına baxdı.

– İstəsəydin, Həsən, – dedim, – mən bu barədə o qızla bir danışardım.

O, fikrə dalaraq, heç bir cavab vermədi.

* * *

Foyedə Gülaraya rast gəldim, salamlaşdıq. Söhbəti hərləyərək, Həsənin məsələsi üzərində dayandım. O, maraqla:

– Nə demək istəyirsiniz? – dedi.

– Bilmək istəyirəm, siz, doğrudanmı, onu sevirsiniz?

Onun üzü ciddi bir hal aldı:

– Özünə söyləmişəm, siz də bilmək istəyirsinizsə, bəli, sevirəm, – dedi.

– Demək, bu, ürəkdəndir?

– Qəribə sualdır? Yəni, ürəkdən olmayan sevgi də var?

– Bəlkə burada... Nə bilim... Siz... bir növ.

O, səbrsiz bir hərəkətlə mənim sözümü kəsdi:

– Rica edirəm, heç nə düşünməyin. Şübhələrinizin haranı döydüyünü bilirəm. Guya ki, məhəbbət üçün ancaq qara gözlər lazım imiş...

Onun dodaqları istehza ilə büzüldü.

– Mənə elə gəlir ki, – dedim, – bunu bir fədakarlıq kimi də düşünmək olar...

O təntimiş, ağlar bir halda:

– Axı, niyə belə düşünürsünüz? – dedi. – Fədakarlıq hər nə qədər nəcib bir duyğu olmuş olsa da, unutmayın ki, könül xudpəsəndliyini də inkar etmək olmaz. Lazımsız bir fədakarlığı onun şəninə necə yaraşdırmaq olar. Yox, belə bir romantika nə ona, nə də mənə lazım olardı...

Sözlərinin axırını öz-özü ilə danışırmış kimi, fikri dağınıq bir halda qurtardı. Bu vaxt gözəl bir gənclə Həsən qapıda göründülər. Qızın baxışları soyuqluq və laqeydliklə gözəl gəncdən çevrilərək uzun zaman Həsənə zilləndi. Bu baxışda nəvaziş və məhəbbətlə qarışıq, nə isə, üçüncü bir duyğu da sezilirdi. Bunun nədən ibarət olduğunu təyin etmək çətindir. Lakin bəzən acımaq və təəssüf duyğuları ilə taqətdən düşmüş sevgi belə bir baxışla şəfəqlənir. Onun üzü qürub edən günəş kimi solğun və həlim görünür. Bəzən şikəst oğluna baxan ananın da gözləri, dodaqları beləcə bir ifadə ərz edir, könlünün dərinliklərində ahəstə-ahəstə yanıb tüstülənən bu duyğunu, bəlkə də, o gənc qız öz dili ilə söyləməyə cəsarət etməzdi...

* * *

Həsən yenə də ona inanmadı. Özünə inanmamazlıq duyğusunun bu qədər hökmə malik olduğunu heç təsəvvür etməzdim... O, əsəbi hərəkətlərlə otaqda o yan-bu yana gəzinir, tez-tez saçlarını ovuşduraraq:

– Yalan deyir... yalan... axı, o gözəl qız nə üçün belə bir dramla əylənir... Nə üçün?

* * *

Bir neçə gündən sonra yay tətilinə buraxıldıq. Ayrıldığımız zaman onun gözləri yaşardı:

– Məni unutma, – dedi.

* * *

Üzümüzə gələn il Həsən gəlmədi... Sonralar onun Moskva darülfünununa dəyişilmiş olduğunu öyrəndik. Gülara hiss ediləcək dərəcə arıqlamış, sakit, eyni zamanda, əsəbi olmuşdu. Biz, demək olar ki, heç danışmırdıq. Nədənsə, bir-birimizdən çəkinirdik. Mən buraxılış imtahanından sonra onu bir daha görmədim.

* * *

Darülfünunu bitirəndən təxminən 4 il sonra bir gün Bakıda küçə ilə getdiyim zaman birisi qolumdan yapışdı. Donub qaldım.

– Həsən! – deyə qışqırdım.

Qucaqlaşdıq. O daha da böyümüş, kökəlmiş, pəhləvan kimi bir oğlan olmuşdu. Siması indi əvvəlki qədər də çirkin görünmürdü. Adəti üzrə, yenə də çox şıq geyinmişdi.

– Gedək bizə, – dedi.

Yol uzunu onun indi darülfünunda riyaziyyat dosenti olduğunu öyrəndim. Qapını açan yaxşı geyinmiş bir az yaşlı rus qadını oldu. Təxminən üç-dörd yaşında gözəl qaragöz bir oğlan uşağı sürətlə yüyürərək "ata" deyə Həsənin dizlərini qucaqladı. Mən uşağı görərək:

– Demək, sənin belə bir igidin də varmış, – dedim.

O biri otaqdan Həsənin anası gəldi. "Xoşgəldin" etdi. Bütün bu illərdə onun əzəmətli siması demək olar ki, heç dəyişməmişdi. Yalnız geyimində bir az dəyişiklik vardı. İndi əvvəlki kimi döşlüyü yox idi. Çubuq əvəzində əlində uzun papiros vardı.

– Buradamı olursan, xala? – dedim.

– Yox, – dedi. – Uşaqları görməyə gəlmişəm.

Nəvəsini yanına çağıraraq, günəşdən yanmış iri sümüklü əli ilə saçlarını oxşadı. Üzündə mehriban bir təbəssüm vardı.

Maraq və intizar qarışıq bir həyəcan bütün duyğularımı bürüdü. Həsənin həyat yoldaşını görəcəyim fikri, bilmirəm nə üçünsə, mənə, bir növ, ürkək, utancaq bir hiss təlqin edirdi... Qəribədir... Mənə elə gəlirdi ki, onun həyat yoldaşını görəcəyimdən Həsən utanacaqdı. Bir an tez çıxıb getmək istədim... Lakin bu dəqiqədə zəng vuruldu. Uşaq, "anam gəldi" deyə sürətlə qapıya yüyürdü. Ucaboylu, dolğun gərdənli, ağbəniz, gözəl gənc bir qadın gülümsəyərək mənə yaxınlaşdı.

Bu gənc qadın Gülara idi.

*1939*

## APARDI SELLƏR SARANI

Ölüm qanadlarını Gülnarın üzərinə gərdiyi zaman o, Soltanını yanına çağırıb, gözlərindən öpdü...

– Mən gedirəm, əzizim, – dedi, – günlərinə qəm qatma. Bu qoca dünya əzəldən belədir. Bilirəm evlənəcəksən, cavansan. Amma Saramdan muğayat ol. Qoyma ögey ana sitəmi çəksin. Əgər, xoşbəxt olsa, qəbrimin üstünə gəl... mənə de.

... Soltanın dərdi böyük oldu. Saçlarına dən düşdü. Lakin o evlənmədi. Könlünü əziz Gülnarının tək yadigarına bağladı.

Saranın süd anası bir qaşqa ceyran oldu. Ata qızını kimsəyə tapşırmadı. Arxasına şələyib qoyun otardı, dağ güllərinin arasında yatırtdı.

Sara ceyran südü əmə-əmə, qayalar arasında qaynayan durna gözlü bulaqlardan su içə-içə böyüdü, nazlı bir sona oldu.

Dağlar onun gözəlliyinə heyran qaldı. Çiçəklər ona qibtə etdi. Aşıqlar hüsnünə dastan dedilər. Sorağı ellərə yayıldı. İgidlər dərdə düşdü. Ay dağlar arxasından boylanaraq ona baxdı, məftun oldu... Günəş onu görməyə tələsdi, lakin rəngi saraldı, getdi.

Soltanın dərdi qaçdı. Könlü güldü.

Sara igidlərə yoldaş, quşlara sirdaş oldu, cıdırlarda at çapdı, ox atmaqda taysız oldu.

Güneylərdə oturaq oba qocaları ona baxaraq:

– Qənirsiz gözəldir, – dedilər...

İgidlər vurğunu idilər. Qız onlardan birini seçdi: Xançobana könül verdi.

İgidlər alaçıq tikdilər. İçini pələng dəriləri ilə döşədilər. Aşıq çağırdılar. Məclis qurdular.

Xançobana toy etdilər.

Günəşdən eşq əmən xoş günlər başladı...

* * *

Ay doğdu. El yaylağa köçdü.

Xançoban sıldırım bir qaya başında oturub tütək çalırdı. Yamaca yayılmış qoyunlar başlarını sallayıb, onu dinləyirdilər.

Muğan gözəli dağa çıxıb, Xançobana yanaşdı. Boynunu büküb igidinə baxdı. Baxışları həsrətliydi. Ay onun kədərli üzünə solğun bir nur çiləyirdi.

Çoban çalırdı...

Qızın yanağından mirvari dənələr yuvarlanırdı.

Çoban çalırdı...

Qız qolunu Xançobanın boynuna doladı, başını sinəsinə qoydu.

Çoban soruşdu:

– Sənə nə olub, gülüm?

Qız başını qaldırıb, yana-yana sevgilisinə baxdı:

– Sən yaylağa gedirsən, əzizim, – dedi, – bu ayrılıq mənə ağır gəlir. Elə bil ki, biz bir də görüşməyəcəyik...

Çoban güldü:

– Dərd çəkmə, gülüm, – dedi, – sənə dağ gülləri ilə bəslənmiş gözəl əmliklər gətirəcəyəm.

... Xançoban qoyunlarını dəstələyib yola düşdü.

Qız atası ilə Muğanda qaldı. Yay işləri görəcəkdilər. Qızıl sünbüllər biçəcəkdilər. Lakin bir gün hava tutuldu. Günəş buludlar arasında gizləndi. Araz "qan-qan" dedi.

Yadelli bir şah doğma yurda basqın etdi. Yolu Muğandan düşdü. Sular kənarında bir pəri gördü, atının başını çəkərək:

– Ey gözəl, – dedi, – kimin qızısan?

Sara qara gözlərini şaha zillədi. Qürurla:

– Atama Soltan deyərlər! – dedi.

Şah əmr etdi. Soltan gəldi. Şah ona müraciətlə:

– Mən sənin qızını özümə arvad eləmək istəyirəm, – dedi.

Soltan ürəyindən vuruldu:

– Ey şah! – dedi, – onun yarı var!..

Şah "mərhəmət" göstərdi:

– Mən səni dünya malından qane edərəm, kişi.

Soltan acı-acı güldü:

– Ey şah! – dedi, – dünya malı şahlara lazımdır, bizə bu azad çöllər də bəsdir.

Şah qəzəbindən titrədi. Qızı göstərib:

– Götürün! – dedi.

Yad əllər Muğan gözəlinin gərdəninə dolandı. Qızın dodaqlarından nagahani bir səda qopdu:

– Ata!..

Ata, balası vurulmuş pələng kimi qıvrıldı. Ciyərlərində odlu gürzələr süründü.

İmdad istəyən bir cüt qara göz ataya zillənmişdi. Qız yadlar əlində çırpınırdı. Ata yanırdı.

Ürəklərə od salan o yaralı səs bir də eşidildi:

– Ata!..

Bu zaman göylər qeyzlə guruldadı. İldırım çaxıb, qoca dağın şiş təpəsini parçaladı. Sular qayalara çarparaq hiddətlə səsləndi. Dərələr uğuldadı. Muğan titrədi. Onun gözəli gedirdi...

Təbiətin qüdrətli səsi ataya qalibiyyət yolunu göstərdi. O, əlini qaldıraraq:

– Dayanın, – dedi, – şaha bir sözüm var.

Hamı bir an dayandı.

O zaman ata, balasını iki qolları arasına alıb, çaya tulladı. Sular öz həmdəmini bağrına basıb, sürətlə axdı.

Ata, şaha baxaraq, müdhiş bir təbəssümlə:

– Sözüm bu idi, ey şah! – dedi.

Günlər keçdi.

Oba qızları dağlara tərəf uçan quşlara baxıb oxudular:

Gedin deyin Xançobana,
Gəlməsin bu il Muğana,
Muğan batıbdır al qana,
Apardı sellər Saranı,
Bir ucaboylu balanı...

*1940*

# QƏHRƏMAN İLƏ BÜLBÜLÜN NAĞILI

Oğlan on səkkizinci yaranı alandan sonra yıxıldı. Adamların müdhiş bağırtıları, süngü cingiltiləri tamamilə eşidilməz olduqda, meşə dərin nəfəs alıb, ağır sükuta daldı.

Yabanı alma ağacının çəhrayı çiçəkləri arasından bir bülbül başını çıxardıb, ürkək nəzərlərlə ətrafı süzdü və birdən aşağıda, meşə otları arasında qan aparmış oğlanı görüb fəryad qopartdı.

Bülbül yaralı bir qəlb kimi çırpınaraq oxuyur, oğlan, yıxıldığı yerdə qımıldanmadan yatıb qalırdı. Onun al qanı parçalanmış köksündən axıb ətrafdakı ağ nərgiz güllərini qızardırdı.

Bülbül bir an susub, meşənin sükutunu dinlədi və təkrar oğlana baxaraq, elə fəğan qopartdı ki, yaralı titrəyərək göz qapaqlarını qaldırdı. Sonra əllərini yerə dirəyib azca dikəldi. Dumanlı gözlərini ətrafa gəzdirərək, çiçəklər arasında oxuyan bülbülü gördü. Dodaqlarına solğun bir təbəssüm qondu.

Nəzərləri ona dikilmiş bülbülün səsində riqqətli bir ney ağladı. O zaman oğlanın da gözlərindəki duman incə büllur təbəqəsi kimi parladı.

Bülbül səsini kəsərək:

– Nə oldu, oğlan, – dedi, – yeddi düşmən sinəsi parçaladın, on səkkiz yara aldın, “uf” demədin, bəs, indi nədən gözlərin yaşardı?

Oğlanın baxışlarından ildırımlar qopdu. O, yaralı pələng kimi, iniltili bir “ah” çəkib, yenə də otların üstünə yıxıldı.

– Yoxsa, o qız yadına düşdü? – bülbül yenə də dilə gəldi.

Qəhrəman gözlərini yumub, cavab vermədi. Bülbül, qanadlarını çiçəklərə çırparaq, yerindən qopdu və bir an çəkmədi ki, oğlanın üzünə kəpənək qanadı qədər xəfif bir gül düşdü.

Oğlan bu qəribə gülün təmasından diksinib, gözlərini açdı. Gül oğlana tanış göründü. Ona elə gəldi ki, bu hansı bir əziz xatirəninsə yadigarıdır...

Güldən qalxan bihuşedici ətir ona şirin bir yuxu gətirdi və bu yuxu yaxınlaşdıqca, oğlanın üzünə röyalı, munis bir nur endi.

Nəhayət, oğlan qəribə bir yuxu gördü; gördü ki, kəndlərinin üst tərəfindən axan çayın qırağında dayanmışdır. Hara isə tələsir, lakin yerindən tərpənə bilmir. Birdən çayın gümüşü suyu içindən ağ paltarlı bir qız çıxıb, ona yanaşdı. Oğlan qızı tanıdı: bu, o idi.

Qızın qucağı, saçları yabanı qızılgüllərlə dolu idi. O, mələk kimi sakit, məzhun bir üzlə oğlanın qarşısında dayanıb:

– Hardasan, əzizim? – dedi. – Mən nə zamandı ki, səni axtarıram.

Oğlan yenə də yerindən tərpənməyə cəhd etdi və dedi:

– Mən getməliyəm, tələsirəm.

Qız onun əllərindən yapışaraq:

– Yox, – dedi, – bu dəfə mən səni buraxmayacam. Sənsiz darıxıram...

“Bu necə ola bilər?” deyə oğlan düşündü. Qız onun tərəddüd etdiyini görüb, gülümsədi. Qucağındakı gülləri oğlanın üzünə səpdi. Oğlan üzünə dəyən güllərin rayihədar, xəfif təmasından gözlərini yalnız bircə dəfə qırpıb açdığı zaman, qızın durduğu yerdə ağ bir göyərçin gördü.

Göyərçin qanadlarını çalaraq havaya qalxdı. Oğlan, onu tutub saxlamaq istəyirmiş kimi, əllərini qaldırdı və birdən bu əllər qartal qanadlarına çevrilib, onun ağır vücudunu qəribə bir yüngüllüklə yerdən üzdü.

Onlar getdikcə bir-birlərinə yaxınlaşıb, nəhayət, qoşalaşdılar. Sonra alov rəngli buludlardan keçərək, göylərin sakit, mavi ənginliklərinə yol aldılar...

... Bülbül bütün gecəni oğlanın başı üstündəki budaqlar arasında oxudu.

Səhər, üfüqlər bahar şəfəqi ilə alışıb yandığı zaman yoldaşları gəlib qəhrəmanı tapdılar. Onun cansız çöhrəsini halələndirmiş nuru, üzünə düşmüş və hələ də solmamış o gülü görüb, heyrətə gəldilər. Sonra həmin yerdə oğlanı dəfn edib getdilər.

Gələn bahar o qərib məzardan yabanı bir qızılgül qalxdı. Bülbül gəlib onun budaqlarında özünə yuva qurdu.

İndi o vaxtdan bəri hər bahar o tək məzar üstündə bir bülbül oxuyur. Onun nəğmələri əzəli və qadir məhəbbətin bitmək bilməyən əfsanələrindən danışır...

*1942*

# YARIMÇIQ QALMIŞ PORTRET HAQQINDA MAHNI

Qoca professor Elmarın gözlərini diqqətlə müayinə edəndən sonra başını qaldırıb, həyəcan və iztirab dolu nəzərlərini ona zilləmiş Güllərə baxaraq, qaşqabağını tökdü və heç bir söz demədən kabinetdən çıxdı. Güllər də onu təqib etdi.

Professor öz otağında kreslosuna çöküb, dərindən nəfəs aldı. Güllər məhzun gözlərini ona zilləmişdi. Həyəcan və intizarı nə qədər qüvvətli olsa da, heç nə soruşmurdu, daha doğrusu, soruşmağa cəsarət etmirdi. Lakin, həkim onun baxışlarındakı sualı anlayırdı. O, Güllərin gənc və gözəl üzünə acıqlı bir nəzər salaraq:

– Neçə yaşınız var? – deyə ucadan soruşdu.

Güllər anlaşılmaz bir qorxu və təlaşla:

– On doqquz, – deyə pıçıldadı.

Qoca həkim acı-acı gülümsədi. Onun bu təbəssümü Gülləri titrətdi.

– Ərinizin sizdən başqa kimi var?

– Heç kəsi, – deyə, Güllər başını buladı. – Qoca bir anası var idi. O da dörd il bundan qabaq vəfat etmişdir.

Həkim ayağa qalxıb, bir qədər var-gəl edəndən sonra otağın ortasında dayandı. Güllərin üzünə baxmayaraq, qəzəbli və boğuq səslə:

– Təbabət ərinizin gözlərini müalicə etməkdə acizdir, – dedi.

Güllər ayaq üstündə müvazinətini saxlaya bilmək üçün yaxınlıqdakı stuldan yapışdı. Sifəti ağappaq ağardı. Dəhşətli təəccübdən alacalanmış gözləri həkimə dikilib qaldı.

Həkimin verdiyi ağır xəbər elektrik cərəyanı kimi onun bütün əsəblərini keyitmişdi. Mənasını dərk etmədiyi anlaşılmaz bir sual başında tez-tez təkrar olunurdu: “Necə, yəni acizdir?..”

– Bəli, acizdir, – deyə həkim özünü də qəti inandırmaq istəyirmiş kimi təkrar etdi.

Güllər bir söz demədən otaqdan çıxdı. Həkimin üzü indi mülayim və mərhəmətli ifadə almışdı. O, dərin təəssüf və ürək ağrısı ilə: “Ah!..” deyib ağsaçlı başını ağır-ağır tərpətdi.

Güllər əri olan otağın qapısında, bir əli dəstəkdə, o biri əliylə isə, gözlərini örtmüş halda dayanmışdı. Yalnız xidmətçi “ah” çəkərək başını buladı:

– Özünə toxtaqlıq ver, qızım, darıxma.

Güllər gözlərini silib, qapını açdı. Elmar əlini alnına söykəyərək oturmuşdu. Hərəkətsiz iri, ala gözləri gur elektrik ziyasını qəribə bir şəkildə əks etdirirdi. Güllər bu gözlərə xeyli baxaraq:

– Gedək, Elmar, – dedi.

Elmar əlini alnından çəkib qəddini düzəltdi, sonra pencəyinin düymələrini bağlayaraq, gümrahlıqla ayağa qalxdı. Yol uzunu professorun nə dediyi haqda heç nə soruşmadı.

Güllər nəhayət, Elmara müraciət etdi:

– Həkim dedi ki, əgər, əsəbiləşməsə, fikir-zad eləməsə, tezliklə sağalacaq (o, gözləri açılacaq demək istədisə də, cəsarət etmədi).

Elmar ona cavab vermədi, sabah konservatoriyada dərsi olub-olmadığını soruşdu. Güllər, qəlbini parçalayan ağrıları boğmaq istəyirmiş kimi, dodaqlarını sıxıb bir neçə saniyə susdu. Sonra:

– Var, – deyə cavab verdi, – ancaq getməyəcəyəm. Mən dərslərə müntəzəm davam etməsəm də olar.

Elmar həyat yoldaşının etibarına hər nə qədər əmin olsa da, indi xudpəsənd bir qürurun təhriki ilə onun bu sözlərində "minnətqoyma" kimi bir şey hiss etdi və bu, heysiyyətinə toxundu. O, soyuq bir laqeydliklə:

– Dərsi buraxmağın nə mənası var, Güllər? – dedi.

Güllər bununla onun nə demək istədiyini anladı. İncimiş və həyəcanlı səslə:

– Niyə elə deyirsən, Elmar! – dedi. – Sənin üçün mənası olmasa da, mənim üçün var, hər kəsə öz istəyi əziz deyilmi? Bir də ki, sən əvvəllər mənə belə sözlər deməzdin... İndi nə üçün...

Göz yaşları onu cümləsini tamamlamağa qoymadı. Elmar mülayim səslə:

– Niyə inciyirsən, Güllər? – dedi. – Bir saat bundan qabağa qədər mənim üçün yenə də ümid qığılcımı var idi. Bu axşamdan o da söndü. Elə bilirsən ki, həkimin nə dediyi mənə məlum deyil?

O, Güllərin cavabını gözləmədən davam etdi:

– Boş ümidlərlə özümüzü nə üçün aldadaq?

Güllər, qaranlıq, qorxunc bir uçuruma yıxılmaqdan çəkinirmiş kimi, bir an ayaq saxladı və oğlana qısılaraq vahimə ilə:

– Elmar, – dedi, – niyə belə sözlər danışırsan? Axı, mən... axı, mən sənin yanındayam!

Elmar dinmədi və onlar evə qədər sükut içində getdilər. Yolda rast gəldikləri adamlar taleyin qıydığı bu gözəl gənclərə təəssüflə baxmadan keçmirdilər.

Mənzilləri dörd otaq və bir mətbəxdən ibarət idi. Evin qərb tərəfində kiçik bir bağça vardı. Otaqlardan ikisinin pəncərələri həmin bağçaya baxırdı. Bunlardan biri Elmarın iş otağı idi, digərində isə, Güllərin pianosu qoyulmuşdu.

Güllər asta, taqətsiz addımlarla öz otağına girdi. Pianosuna və pərakəndə halda tökülmüş not dəftərlərinə baxdı.

Vaxt var idi ki, o, bu balaca bağçada dayanıb, qüruba enən günəşin buludlarda alışıb-yanan son işığına tamaşa edə-edə bu pianonun arxasında sevgilər, bahar şehi kimi titrək, şəffaf sevinclər, arzular, yaradıcı insan əməyinin qüdrət və gözəllikləri haqqında romanslar yazardı. O biri otaqda isə, gənc rəssam Elmar yorulmadan işləyərdi.

Güllər pianonun qapağını qaldırıb, orta barmağı ilə dillərdən birinə toxundu. Pianodan həzin bir səs qalxıb, bağçanın sükutu içində titrəyərək söndü. O, diksinərək əlini geri çəkdi. Ürəyindən buz kimi soyuq rəşə keçdi. Sonra pəncərəyə doğru bir addım atıb dayandı. Qovaq ağaclarının daim titrəyən yüngül yarpaqları arasından axşam səmasına baxaraq, öz-özünə pıçıldadı:

– Doğrudanmı, onun gözlərinə çökmüş qaranlığın sonu yoxdur? Doğrudanmı, hər şey bitmişdir?

O, buna inanmırmış kimi, çevrilib Elmarın otağına getdi. Divar boyu vurulan ağ parça üzərində rəsm edilmiş gənc qadın ona baxaraq gülümsəyirdi. Bu, onun özü idi. Lakin portret tamamlanmamış, Elmarın müharibəyə getməsi ilə yarımçıq qalmışdı.

Vaxtilə dəstə-dəstə gəlib baxan sənət ustaları bu şəklin fövqəladə bir istedadla çəkilməkdə olduğunu söyləyirdilər. Elmar özü isə, bu tərifləri sükutla qarşılayaraq, Güllərə deyirdi ki, əgər, mən bu portreti yarada bilsəm, özümü ömrüm boyu xoşbəxt hesab edəcəyəm. Bu şəkil əbədi və böyük məhəbbətin timsalı olacaq...

Doğrudanmı, bu böyük arzu həmişəlik məhv olub getdi?! Otaq qaranlıqlaşır, bağçada quşların qərib səsləri eşidilirdi. Güllərin varlığını birdən-birə anlaşılmaz qorxu bürüdü və o, bütün vücudu ilə titrəyərək, dönüb sürətlə qonaq otağına getdi.

Elmar əllərini başının altında çarpazlayaraq, divanda uzanmışdı. Gözləri şüşə kimi donuq bir tərzdə parlayırdı. Yalnız uzun qara qaşla-

rının çatılışından, ağ və gözəl alnının incə qırışlarından onun, nə isə, ciddi bir şey haqqında düşündüyü məlum olurdu. Güllər gəlib Elmarın yanında oturaraq, üşüyürmüş kimi, onun geniş sinəsinə qısıldı. Üzünü ərinin ipək kimi yumşaq saçlarının qıvrımları arasında gizlətdi.

Elmarın üzündəki tutqunluğu mehriban, aydın bir ifadə əvəz etdi. Uzun, qara kirpikli göz qapaqları aşağı endi.

Güllər nə düşünürdü? Kor olmuş ərinin varlığına hansı hisslər hakim idi? Bunları söyləmək çətindir. Bəlkə də, onların gənc və günahsız duyğuları aralarına çökmüş müdhiş zülməti keçərək bir-birinə qovuşmaq, bir-birini dərk etmək istəyirdi?

Birdən Elmarın dodaqları rəşə ilə titrədi. Kirpikləri tez-tez qırpındı və o, yavaşca Gülləri özündən kənar edərək, dikəlib oturdu. Güllərin heyrətlə baxan gözləri Elmara zillənib qaldı. Elmar başını Güllərə tərəf azca döndərib:

– Yadındadırmı, Güllər, – dedi, – Korolenkonun kor çalğıçısı nə deyir? Deyir ki, heç olmasa, anamı, günəşi, ulduzları bircə dəfə görmüş olsaydım, indi onların xatirələri ilə yaşayardım. Mən isə, bunların hamısını görmüşəm. Axı, mən aydın gecələri, çiçəkli çəmənlər arası ilə qayğısız axan suları, boz qayalıqlarda səslənən kəklikləri, kolluqlarda bitən bənövşələri görmüşəm. Mən, şərəflə vuruşan qəhrəmanların zəfər mahnıları oxuyaraq can verdiklərinin şahidi olmuşam.

O, bir an susdu. Sonra yavaş-yavaş və mükəddər səslə:

– Nəhayət, – dedi, – səni görmüşəm, axı... Deməli, mən Petrodan xoşbəxtəm. Elə deyilmi? Əgər, mən yaxşı bir rəssam olmadımsa, bunun eybi yoxdur. Dünyaya məndən də istedadlı o qədər rəssam gələcək ki...

Elmar susdu. Sonra sakit və qəti bir ifadə ilə dedi:

– İndi isə, mən sənin işinə mane olmamaq üçün korlar evinə gedəcəyəm, bəlkə orada görə biləcəyim bir iş də tapdım. Sən isə, yaxşı mahnılar yaz. Mən də onlara radioda qulaq asacağam...

Axırıncı cümlədə Elmarın səsi titrədi və o, ayağa qalxıb, pəncərənin qabağına getdi. Qızın nəzərləri qeyri-şüuri bir hərəkətlə boylu-buxunlu Elmarın qamətini dolaşıb, onun enli kürəklərində qərar tapdı.

Həkimin sözündən sonra bu, Güllərin ürəyinə endirilən ikinci zərbə idi. O, bir an, yalnız bir an özünü Elmardan həmişəlik ayrılmış təsəvvür etdi. Vücudunu elə soyuq, elə ümidsiz yalqızlıq hissi sardı ki, dəhşətlə titrəyib ayağa qalxdı və Elmara yaxınlaşıb, onun əlini balaca soyuq əlləri arasında bərk-bərk sıxaraq:

– Bu mümkün deyil, Elmar! – dedi.

Güllər bütün gücünü sərf edərək, ərinin könlünü ovutmağa çalışırdı. Hər axşam onu özü ilə gəzməyə aparır, hər zamankından gözəl geyindirir, onun üçün təzə-təzə qalstuklar alır, köynəklər tikir, onu daha çox əyləndirmək üçün yeni-yeni vasitələr düşünürdü. O, ərinin gözlərində sönmüş işığı öz qayğısı ilə onun qəlbində yandırmaq istəyirdi.

Bahar sabahı şən və parlaq işığı ilə pəncərədən içəri süzüldüyü zaman, dağlardan əsən sərin dan yeri üzünü oxşadığı vaxt Güllər şirin səhər yuxusundan qalxıb, bağçada yeni açılan yuxulu qızılgüllərə, üzərlərində şeh damlaları sayrışan yasəmən salxımlarına, ağaclar altındakı sərin kölgəliklərə, sonra da ərinin bütün bunları heç bir zaman görməyəcək gözlərinə baxar, ürəyinə çalın-çarpaz dağ çəkilərdi.

Elmar da başını yataqdan qaldırıb:

– Deyəsən, səhərdir, Güllər, – deyərdi və o zaman Güllərin üzünü qapamış kədər kölgəsi arasından quzey çiçəyi kimi solğun bir təbəssüm parladı. Sonra onlar bağçaya enərdilər.

Elmar çiçəklərin arasında dolaşaraq, əli ilə onlara toxunar, “qızılgül nə tez açılıb, qaraməxmər hələ düymədir...” deyə sevinclə səslənirdi. Güllər isə, onun bu hərəkətlərinə dözülməz bir dərdlə baxar, keçmişin qayıtmaz xatirələrinə dalıb gedərdi. Axı, bu çiçəklərin ən incə naxışları, ən mürəkkəb boyaları o rəssama tanış idi. Bir dəfə Elmar doymaq bilməyən ehtirasla bu çiçəkləri seyr edib:

– Eh, Güllər, – demişdi, – bunlara baxdıqca düşünürəm: görəsən, doğrudanmı, bir zaman insan dühası bu gözəlliyi olduğu kimi ağ bez parçası üzərində canlandıra biləcək?

Bunları xatırladıqca, bir anlığa təsəlli üçün etdiyi hər cür cidd-cəhd Güllərə kiçik və mənasız görünür, ərinin böyük dərdini unutdurmaqda çox aciz olduğunu hiss edərək, mat-məhbut donub qalırdı.

Sonra onlar cavan yasəmən ağacının yanına gələrdilər. Elmar əlini onun salxımları üzərində gəzdirərək, balasını görməyən kor ana kimi mehriban və qəmgin bir təbəssümlə deyərdi:

– Bu ağac lap böyüyüb ki!

Beləliklə, səhər gəzintisi bitərdi. İş otağının qabağından ötdükləri anı Elmar vərdiş etdiyi bir hisslə duyar və bu zaman onun üzündə əsəbi gərginlik zahir olardı.

Müharibədən qayıdandan bəri, o bir dəfə də olsun, nə bu otağa girmiş, nə də onun adını tutmuşdu. Güllər bunun səbəbini anlayırdı. Odur

ki, pianonun arxasında oturaraq, gənc ərinin taleyi, o biri otaqda əbədi olaraq yarımçıq qalmış portret haqqında uzaq və dərin xəyallara dalaraq, saatlarla çalardı.

Bütün bu müddətdə rəssam aramsız düşünər... düşünərdi...

Günlər keçdikcə onun ruhi sarsılmazlığı və kor çalğıçıya nisbətən məsud olması qənaəti zəifləyirdi. Onun qara pərdə altında hərəkət edən daxili aləmində indi tamamilə əksinə olan xudpəsənd və amansız hisslər baş qaldırırdı.

Vaxtilə görmüş olduğu rəngarəng mənzərələrin xatirələri, zehnində hifz edilmiş kitablar indi artıq onu yorurdu.

“Petro anadan kor olduğu üçün, – deyə o düşünürdü, – təbiət onun görmə qüvvəsini başqa üzvlərinə verdi. O, gözləri ilə görmədiklərini qulağı ilə eşitdi, bütün vücudu ilə duydu və buna görə də, öz musiqisi ilə dinləyənləri heyran etdi. Kor olmuş Korçagini yenidən həyata, öz döyüş yoldaşları sırasına onun böyük istedadı qaytardı. Mən isə, hər şeyi gördüm, ən incə rəngləri bir-birindən seçməyi bacardım və bütün yaradıcı qüvvəmin gözlərimə toplandığı bir zamanda onlardan məhrum edildim. İndi iyirmi altı yaşındayam. Demək, hələ otuz-qırx il də yaşaya bilərəm.”

O, Gülləri sevmişdi. Müharibənin ən qızğın döyüş dəqiqələrində bu sevgi himayədar bir qanad kimi onun üzərinə gərilmiş, qəlbinə qüvvət vermişdi. Onun ən nəcib xəyallarını, ən çətin arzularını bu sevgi pərvazlandırmışdı. Lakin indi bu sevgi, həmin bu qüdrətli məhəbbət ona əzab verirdi.

O özünün əlillər evinə getməsi üçün arvadını dəfələrlə dilə tutdu. Hər dəfə də Güllər bu fikri başından çıxarması üçün ona yalvardı. Lakin insan təbiəti çox qəribədir. O özünü sevilməyə tam mənası ilə layiq bildiyi zaman bu məhəbbət ona fərəh və səadət gətirir. Ona görə də, Güllərin sevgisi iki gözündən kor qalmış rəssamı məsud edə bilmirdi. Qızın ona qarşı dəqiqədən-dəqiqəyə artan qayğı və diqqəti, gecə-gündüz qabıqdan çıxması oğlanın həm qəlbini ağrıdır, həm də izzəti-nəfsini yaralayırdı. O, bütün bunlara, şikəst ərə qarşı göstərilən alicənab mərhəmət hissi kimi baxırdı.

Bu isə, onun gənc həyat yoldaşını dəli edirdi. Güllər bu anlayışın səhv olduğunu ərinə hiss etdirmək üçün saatlarla düşünərək, pianosunun arxasına keçir, öz dili ilə izah edə bilmədiyi hisslərini musiqinin qüdrətli dili ilə ifadəyə cəhd edirdi.

Elmarın yaradıcılıq dühası heç vəchlə rahatlıq tapa bilmirdi. O, göylərin sonsuz dərinliyini görüb-duyan, qanadları qırılmış quş kimi çırpınıb... çırpınıb yerində qalırdı. Varlığındakı yaradıcılıq qüvvəsi, qabağı tutulmuş çay kimi özünə yol axtarırdı və bunu tapa bilmədiyi üçün əzab çəkirdi.

Bu qayda ilə payız, qış dolanıb keçdi. Yenə də yaz gəldi. Elmarın gülləri yenə də açıldı. Lakin onun nə gözləri açıldı, nə də könlü...

Bahar axşamı idi. Ürəklərə sevgi və riqqət təlqin edən sakit bir bahar axşamı...

Onlar qonaq otağının küçəyə baxan pəncərəsi qarşısında oturmuşdular. Güllər dəsmal tikirdi. Elmar isə, dirsəyini pəncərəyə söykəyib, öz düşüncələrinə dalmışdı. Bayırdan gələn axşam yeli onun saçlarını arabir tərpədir, elə bil ki, beynini yoran ağır fikirləri vurub dağıtmaq istəyirdi.

Küçədən keçən iki gənc – qız və oğlan onların pəncərəsi qarşısında ayaq saxladı. Qız əvvəlcə Elmara, sonra da tikiş ilə məşğul olan Güllərə baxıb:

– Salam, Güllər! – deyə gülümsədi.

Güllər başını qaldırıb keçmiş məktəb yoldaşını və onun rəfiqini görərək, mehribanlıqla:

– Xoş gördük, hara belə? – dedi.

Bayırdakı qız, kor rəssamın eşidəcəyindən qorxurmuş kimi, asta və ürkək bir səslə:

– Kinoya getmək istəyirik, – dedi.

Elmar bu sözləri eşitdi və onun kirpikləri əsəbi halda qırpıldı. Bu, Güllərin nəzərindən qaçmadı. O, öz sualından peşman oldu. Mümkün qədər şən bir ahənglə:

– Anangil necədir? – deyə sözü dəyişdi.

Vəziyyətin belə uyğunsuz hal almasını bayırdakı qız da hiss etdiyi üçün:

– Yaxşıdırlar. Sən Allah, bizə gəlin, – deyib tələsik xudahafizləşdi.

Onların gedişi ilə otaqdakı sükut daha da ağırlaşdı. Güllər bu "kino" sözünün doğurduğu təsiri ərinə unutdurmaq üçün söz axtarırdı. Lakin həyatın yüzlərlə belə təsadüfləri qarşısında o nə qədər aldadıcı söz tapa bilərdi ki?

Elmar isə, öz gənc həyat yoldaşının bir ildən bəri teatr, kino üzü görmədiyini düşünərək, lal bir iztirab içində əzilirdi.

Nəhayət, o:

– Yox, bu belə davam edə bilməz! – deyə qəlbində qəti bir qərar verərək, ayağa qalxıb, yataq otağına keçdi. Paltar dolabını açdı. Əlini orda asılmış hərbi mundirinin üzərində gəzdirərək, tapança qoburunu tapdı və kiçik tapançanı çıxarıb, eyni arxayınlıqla cibinə qoydu. Sonra arvadına bir-iki kəlmə söz yazmaq üçün ağır addımlarla öz kabinetinə getdi. Əlini stolun üstünə gəzdirib, çoxdan unudularaq orada qalmış bloknotu və qara karandaşı tapdı. Bloknotdan bir vərəq cıraraq, stul çəkib oturdu. Nə yazsın? Duyğularını necə ifadə etsin? Lakin yazmaya bilmirdi. Dünyada ən çox sevdiyi adamdan birdən-birə, sözsüz-söhbətsiz ayrılmaq, özü də həmişəlik ayrılmaq istəmirdi...

Bütün gücünü toplayaraq ilk əziz sözü yazdı:

"Güllər!"

Elə bu zaman həzin musiqi eşidildi və bu musiqi birdən-birə dil açaraq, qəribə bir hekayət başladı. Oğlan diksindi, əl saxlayıb, bu hekayətə qulaq asdı.

Pianonun dilləri bəzən ağır-ağır, bəzən də sürətli, coşğun nidalarla səslənirdi. Onlar gənc qadın qəlbinin macərasını hekayə edirdi. Bu dillər sakit, ülvi bir avazla, həyatın xoş günlərində o gənc qəlbin öz qəhrəmanına necə vurulduğundan və bu qəhrəmanın böyük taleyindən danışırdı. Bu zaman Elmarın xəyalından bahar çiçəklərinin ətri qədər xəfif, rayihədar bir məhəbbətin heyranedici, uzaq xatirələri süzülüb keçirdi.

Onlar, birdən fəryada gələrək, fərəh və səadətlə gülümsəyən bu bahar sabahının üzərinə çökmüş qara buludlardan, qəhrəmanın öz əzəmətli vətəni uğrundakı cəsur döyüşlərindən xəbər verirdi. Musiqi yavaş-yavaş səslənib, qəhrəmanın qarşısında diz çökən o gənc qadının iztirablarından söyləyir, əbədi və sadiq məhəbbət haqqında and içirdi.

Pianonun dilləri oğlanın qəlbindəki inamsızlığı duyaraq, üsyankarlıqla fəğan qoparıb, dünyada hər şeyə qadir olan o böyük məhəbbətin əfsanəsinə keçdi. Birdən Elmar yerindən qalxaraq, sehrə tutulmuş kimi irəlilədi.

Güllər onun gəlişini duymadı. Otağın yarımqaranlığı içində o, gözlərini pəncərənin yuxarısından görünən və hələ işıq olan göy qübbəsinə zilləyərək çalırdı. Elə bil ki, söylədiyi əfsanələr orada, göylərin o məchul dərinliklərində bir silsilə kimi keçib gedirdi...

Elmar heyrət və həyəcan içində dayanıb dinləyirdi. O, bu ecazkar musiqinin tərənnüm etdiyi hisslərlə özünün yarımçıq qalmış əsərində vaxtilə ifadə etmək istədiyi o qüdrətli məhəbbət arasında heyrətli bir oxşayış görürdü. O görürdü. Rəssamın qəlbi işıqlı, məsud bir aləmdə dayanıb gülümsəyən əziz həyat yoldaşını və onun təbəssümündəki əbədi məhəbbəti görürdü. Bir ildən bəri ruhunu bürüyən, ona əzab verən müdhiş zülmət bu sehrkar məhəbbətin nuru ilə əriyib yox olurdu. İndi o, həyatı, əbədi və böyük həyatı bütün aydınlığı ilə görürdü. Onun yarımçıq qalmış portreti tamamlanmışdı.

Rəssamın qəlbi fərəhli, bəxtiyar hisslərlə çırpınırdı və o, bir addım daha irəli ataraq həyəcanla:

– Güllər! – dedi.

Bir neçə il keçdi. Sakit bir yay axşamında şəhər bağlarının birində gənc, gözəl bir qadınla yanaşı iri, ala gözləri batan günəşin son işığını durğun göl kimi əks etdirən bir kişi oturmuşdu. Onların qabağında alagözlü, qıvrımsaçlı qəşəng bir oğlan uşağı oynayırdı. Birdən:

– Diqqət! – deyə radio səsləndi. – Bəstəkar Güllər xanımın "Yarımçıq qalmış portret haqqında mahnı" adlı əsərinə qulaq asın.

– Ana, səni deyir, – deyə uşaq yüyürüb gənc qadının dizlərini qucaqladı.

Elmar əlini oğlunun başına çəkərək gülümsədi.

*1943*

# QARI DAĞI

Şəhər otuz doqquz gün mühasirədə qalaraq, uzaq məmləkətdən qoşun çəkib gəlmiş şahla vuruşdu. Qırxıncı gün şahın iyirmi yaşlı cəsur oğlu Maliktac beş yüz nəfər seçmə pəhləvanla hasarın bir tərəfindən hücum edib şəhərə girdi. Onun ardınca bütün qoşun yol tapıb şəhərə doldu.

Yerli əhalinin inadından və təslim olmaq üçün dəfələrlə edilmiş təklifi rədd etmələrindən qəzəblənmiş şah, vəziri Taygöz Yusifi çağırıb kimsəyə aman verməməyi əmr etdi.

Taygöz Yusif şəhərin sağ qalmış yeddi min əhalisini uşaqdan-böyüyə qılıncdan keçirdi. Evlər dağıldı. Qan su yerinə axdı.

Üçgünlük qırğından sonra şah şəhərdən çıxıb yaşıl bir təpə üstündə çadırlar qurdurdu. Üç gün, üç gecə şadyanalıq etməyi, qalibiyyət badələri qaldırmağı qoşun əhlinə əmr etdi.

Qızıl işləməli, firuzə rəngli kuzələr yeddiillik Şiraz şərabları ilə dolduruldu. Əti məcun olan beşillik qara erkəklər kəsildi. Ovçular Qarabağ meşələrindən tükləri alov kimi yanan qırqovullar gətirdilər.

Hökmdar yeddi qızıl dirəkli çadırında, yeddi tirmə döşək üstündə əyləşdi. Atlas geyimli Nişapur sazandaları gəldi. Süfrələr döşəndi, qızıl qədəhlər düzüldü. İlk badələr qaldırılan zaman yetmiş yeddi şeypur şahlar şahının qələbəsi şərəfinə gurladı.

Lakin elə bu vaxt şahın qorxunc vəziri Taygöz Yusif içəri girib, hökmdarın hüzurunda yerə qədər təzim etdi. Şah boşalmış qədəhini yanındakı qara qula verib qaşlarını çatdı.

– Hardasan, vəzir?! – dedi. – Yoxsa, mənim qələbəmin təntənəsi sənin üçün mənasızdır?

Taygöz Yusif bir daha yerə qədər təzim edib:

– Qibleyi-aləm, – dedi, – mən aciz Yusif sənin sabiq qulunam. Şahlar şahının hüzuruna gecikməyimin səbəbi var.

Hökmdar vəzirin səsindəki qara xəbər əlamətini duyaraq:

– Nə olub, vəzir? – dedi. – Tez söylə!

Vəzir üçüncü dəfə təzim edib:

– Qibleyi-aləm yüz illərlə sağ olsun! – dedi. – Oğlun Maliktac xəstələnmişdir.

– Nə danışırsan, vəzir! – deyə şah ayağa qalxdı.

Şahzadə Maliktac qonşu çadırda qızdırma içində yatırdı, hər tərəfində yeddi qara qul əlləri döşündə sükut içində dayanıb, gözlərini ona zilləmişdi.

Hökmdar vəzirin müşayiəti ilə çadıra daxil olduqda, qullar yerə döşənib, alınlarını torpağa qoydular. Şah oğluna yanaşıb, barmaqlarında ləl-cəvahir sayrışan ağ əlini onun alnına qoydu:

– Oğlum, Maliktac! – deyə həyəcanla səsləndi.

Lakin xəstədən cavab gəlmədi. O zaman şah, rəngi ağarmış halda üzünü vəzirə sarı çevirib, qorxulu və titrək səslə:

– Bu saat hər tərəfə çaparlar göndərilsin, – dedi. – Qoy dünyanın bütün biliciləri buraya toplansın.

Şah bütün günü oğlunun başı üstündən tərpənmədi, gözlərini yummadı. Heç nə yemədi.

Səhəri vəzir qayıdıb:

– Qibleyi-aləm, – dedi, – şəhərdə ancaq tək-tək qocalar, uşaqlar qalıb, qırılan qırılıb, sağ qalanlar da gecə ikən meşələrə qaçıb. Çox axtarandan sonra bir falçı qarıya rast gəldik.

– Bəs, falçı nə oldu? – deyə şah qəzəblə soruşdu.

– Gəlmədi. Şahzadənin yanına gətirilməsini istədi.

– Aha! – deyə şah kibirlə gülümsədi.

– Mən onu ocağa atdırıb yandırardım, qibleyi-aləm, ancaq...

Şah vəzirin sözünü kəsib:

– Taxt-rəvan hazırlansın, – deyə əmr etdi.

Hökmdar öz rəiyyəti ilə birlikdə insan cəsədləri ilə dolu xaraba küçələrdən keçib, balaca bir komanın qabağında dayandı. Taxt-rəvanı qulların çiynindən alıb, yerə qoydular. Şahzadəni ehtiyatla içəri gətirdilər. Yarımqaranlıq evin içində ucaboylu bir qarı durmuşdu. Şah daxil olan zaman, o, yerindən qımıldanmadı, təzim etmədi, bir heykəl sükunəti ilə dayanıb durdu.

Şah keçib xəstənin baş tərəfində qoyulmuş döşək üstündə əyləşərək:

– Qarı, – dedi, – deyirlər sən cinlərin, uğursuz ruhların dilini bilirsən. Sağalmaz dərdlərə dəva edirsən. Budur, mənim oğlum Maliktac od tutub yanır. Məşum ruhlar onun huşunu oğurlayıb aparmışlar. Səndən əlac istəyirəm, qarı. Əgər, onu sağaltsan, evinin dirəklərini qızıla tutduracağam. Əgər, xəyanət etsən, cəhənnəm kimi zəbanə çəkib yanacaqsan.

Qarı:

– Mən anayam, – dedi və bir qab su alıb, taxt-rəvanın qarşısında yerə çökdü.

Sonra dodağının altında nə isə oxuyub, suya üfürdü və bir an kasaya diqqət edərək, ağır və zəhmli nəzərlərini qaldırıb:

– Ey şah, – dedi, – mən burada minlərlə qəzəbli ruh görürəm. Onlar xəbər alır: "Şah öz oğlunu çoxmu sevir?"

Şah vahimə ilə:

– Nə danışırsan, qarı? – dedi. – O mənim yeganə varisimdir. Böyük bir məmləkət gözünü ona dikmişdir. Mən yeddi il dua edib, yeddi min qurban kəsəndən sonra böyük Yaradan onu mənə əta edib. O böyüdü, Kəyan mülkündə birinci pəhləvan oldu.

Falçı təkrar suya baxıb dedi:

– Ağsaçlı bir qarı soruşur: "Şahzadənin anası varmı?"

Şah:

– Var, qarı, – dedi, – onun anası Xədicəbanu Yer üzündəki arvadların ən xoşbəxtidir. Çünki o mənə Maliktac kimi oğlu bəxş etmişdir. Tez ol, qarı, oğlumun dərdinə əlac et. İndi Xədicəbanunun yuxusuna qara ilanlar girir.

Qarı bayaqdan bəri, ilk dəfə olaraq, başını qaldırıb, xəstə şahzadəyə baxdı və elə bil ki, oğlanın solğun gözəlliyi onun gözlərini qamaşdırdı. Qarının kirpikləri qırpındı, bəbəkləri böyüyüb, quru bir parıltı ilə yandı.

– Bütün dərdi sinəsindədir, – deyə şah, ağır-ağır nəfəs alan oğluna baxdı.

Qarı xəstəyə yanaşdı. Damarları çıxmış quru və kobud əlini onun sinəsinə qoydu.

Xəstə göz qapaqlarını qaldırdı. Yaralı ceyran gözlərinə bənzər bir cüt qara, məlul göz arvada zilləndi. Qarının günəşdən və dərddən yanıb qaralmış heybətli üzü qəribə bir nurla işıqlandı. Axı, o, ana idi.

Sonra qarı dağlara gedib, bir ətək çiçək gətirdi. Onların şirəsini çəkib, qaşıq-qaşıq xəstənin boğazına tökdü. Gecə-gündüz yanından tərpənmədi.

Şəhərdə sağ qalmış yerliləri ona lənətlər yağdırdılar. Güneylərdə oturan qocalar onu gördükdə, gözlərini endirib ayaqlarının ucuna baxdılar, yadellilərin nəzərindən iraq yerdə görüşən arvadlar başlarını bulayıb:

– Eh, Ballı qarı imansız oldu, – dedilər.

Xəlvətə düşəndə uşaqlar onun dalınca düzülüb:

– Ay falçı, bəs, qızıl başmağın hanı? – deyə tənə etdilər.

Qarı həmyerlilərinin bütün bu nifrətini sükutla qarşılayıb, hər gün dağlara gedir, qucaq-qucaq çiçək gətirir, xəstəni müalicə edirdi. Axı, o, ana idi...

Nəhayət, yeddi gündən sonra şahzadə gözlərini açıb yemək istədi. On birinci gün isə, onun tamamilə sağalıb ayağa qalxdığını qoşun əhlinə xəbər verdilər.

Şah, falçıya bir kisə qızıl verib:

– Qarı, – dedi, – çiçəklərin hikmətini aç mənə söylə.

Qarı başını bulayıb:

– O sirri mən heç kəsə aça bilmərəm, hökmdar, – dedi. – Ancaq oğluna o çiçəklərdən çəkilmiş elə dərman verərəm ki, bir də azar üzü görməz.

Bu sözlərdən sonra qarı, qızılgül rəngli maye ilə dolu bir kasa gətirdi. Şah kasanı alıb, burnuna tutdu:

– Bu müşkdür, ənbərdir, nədir, qarı? Ətri insanı bihuş edir.

– O, dünyanın ən nadir çiçəklərindən çəkilib, – deyə qarı cavab verdi.

Hökmdar dərmanı yarısına qədər özü içib, qalanını da oğluna verərək:

– And içirəm ki, mən ömrümdə bu şirinlikdə şərbət içməmişəm, – dedi.

Şahzadə qalan şirəni son damlasına qədər içib, kasanı qarıya qaytardığı zaman falçı rahat nəfəs aldı.

Şah qarının üstünə daha bir kisə qızıl tullayıb, yanında dayanmış Taygöz Yusifə müraciətlə:

– Vəzir, – dedi, – o vaxt uğursuz ruhlar mənim şənliyimi pozmuşdu. İndi dünyada heç bir dərdim yoxdur. Qoşun əhlinə tapşır ki, üç gün, üç gecə elə bir şadyanalıq etsinlər ki, göydə gün üzü tutulsun.

– Atılan ox bir daha geri qayıtmaz, hökmdar, hər dəqiqənin bir hökmü var! – deyə Ballı qarı astadan dilləndi.

– Dəlimi olmusan, arvad? Nə danışırsan? – deyə şah qəzəblə yerindən qalxdı.

Və birdən o, mədəsində hiss etdiyi dəhşətli ağrıdan sarsılaraq, əl atıb vəzirin çiynindən yapışdı. Elə bu anda şahzadə də kökündən qırılmış sərv kimi silkələnib, arxasında dayanmış qara qulun qucağına aşdı.

– Zəhər! – hökmdarın sinəsindən vəhşi bir səs qopdu.

– Bəli, zəhər... – deyə Ballı qarı arxayınlıqla təkrar etdi.

Şah, yerdə ilan kimi qıvrılan oğluna baxıb:

– Vəzir, əlac! – deyə qışqırdı.

Və artıq ayaq üstündə dayana bilməyib, döşəyin üzərinə yıxıldı. Sonra başını qaldırıb:

– Qarı, – dedi, – heç olmasa, oğluma bir çarə elə. Axı, sən onu ölümdən qurtarmışdın, axı, sən deyirdin, mən anayam.

– Bəli, qibleyi-aləm! – deyə Ballı qarı ah çəkdi. – Mən anayam!..

Şah ilə oğlu dəhşətli əzablardan sonra öldülər...

Taygöz Yusifin əmri ilə qarını öz otağında qoyub qapını bağladılar. Sonra qoşun əhlinin hər biri onun koması üzərinə bir at torbası torpaq tökdü. Günün axırında günəşin son işığı Savalanın zirvəsindəki buludlarda saralıb sönən zaman qarının koması üstündə böyük bir təpə qalxdı. Sonra yağan yağışlar onun torpağını bərkitdi. Gələn bahar təpədə sarı tikanlı boz qanqallar bitdi. Təpəyə "Qarı dağı" dedilər.

Sonrakı əsrlərin külələri, selləri şəhərin xərabəliklərindən heç bir əsər qoymadı. Onun yeri hər bahar qızıl lalələrlə örtülən bir düzənlik oldu. Şəhərdən yadigar yalnız Qarı dağı qaldı. O vaxtdan bəri Qarı dağının altında bir çeşmə qaynayır. Uzaq mənzildən gəlib keçən yolçular onun suyundan içib, ürəklərinin yanğısını söndürürlər...

*1944*

## SU DƏYİRMANI

O gecə mən birinci dəfə idi ki, kəndimizin üst tərəfindən keçən dəyirman arxının yanında dayanıb onu gözləyirdim. Göy qübbəsini bəzəyən saysız-hesabsız ulduzlar və onların arasındakı üçgünlük Ay arx boyu düzülmüş söyüdlərin təzə açılan yarpaqlarını zəif-zəif işıqlandırırdı. Aşağı dərənin qaranlığında yalnız taxtapuşu seçilən dəyirmandan işıq gəlirdi. Mənim gözlədiyim qız, atasına – dəyirmançı Musa dayıya axşam yeməyi aparmışdı. Mən bunu gündüz özündən öyrənmişdim. Ona görə də, indi burada dayanıb, gözümü dəyirmandan gələn cığıra zilləmişdim. Yarım saatdan bəri idi ki, həyəcan və intizar içindəydim. Əslinə baxsan, yarım saat deyil, düz yarım il idi. Yarım il idi ki, hər gecə mən bu cür həyəcan və intizar içində səhərin açılmasını gözləyirdim. İndi isə, burada, ulduzların altında səhəri deyil, onun özünü gözləyirdim. Təzə açılmış söyüd yarpaqlarının xışıltısını, dəyirman çarxının üzərinə tökülən bahar suyunun coşğun şırıltısını dinləyərək onu gözləyirdim.

Mən də, bu gözəl yaz gecəsi də həyəcan və səadət içindəydik. Biz ikimiz də, mən də, bahar da, mənim arzularım da, baharın açdığı bu söyüd yarpaqları da gənc idik. Bizim üzərimizdən fırtına keçməmişdi. Biz həyəcan və coşğunluq içində irəliyə can atırdıq. Biz arzu və ehtiraslar selinə düşmüşdük! Biz təzə gəldiyimiz bu dünyaya nə isə yeni bir şey, yeni bir gözəllik bəxş etmək həvəsi ilə çırpınırdıq. Biz bu barədə düşünmürdük, lakin bu, belə idi. Bizim fərəhimizdəki sirr bundan ibarət idi. Bu, böyük və əzəmətli həyatın əbədi qanunlarından biri idi!..

Deyəsən, o gəlir... bu ahəstə ayaq səsləri onunkudur.

Mən bahar otlarının onun ayaqları altında necə xışıldadığını eşidirəm. Başqa vaxt karsala qulağım indi gör necə həssas olmuşdur. Qaraya çalan böyürtkən kolları arasından onun qara kəlağayılı başı görünür. Mən ona tərəf getmək istəyirəm, lakin yerimdən tərpənmirəm...

Nəhayət, o, yoxuşu qalxıb, mənim dörd-beş addımlığımdakı söyüd ağacına çataraq, əlini qaldırıb, onun bir budağından tutdu və nəfəsini dərə-dərə mənə baxıb gülümsədi. Gözləri eynilə bir cüt qaragilə kimi qaranlıqda parıldayırdı.

– Axşamın xeyir, Eyvaz, sən, doğrudan da, buradaymışsan...

– Necə yəni doğrudan da?

– Gündüz deyəndə, elə bildim zarafat edirsən...

– Eh, Bəyim... Sən hər şeyi zarafat hesab edirsən. Gəl, bir az burada oturaq.

– Yox, gedək Eyvaz, gecdir... – deyə o, ürkmüş halda ətrafa baxındı.

Mən saatımı işığa tutaraq:

– Gec haradan oldu? Hələ doqquz tamam deyil, – dedim.

– Yaxşı, bir az oturaq...

Biz arxın kənarındakı cavan söyüd ağacının altında, çayırla örtülmüş dikdirdə əyləşdik.

– Bu gün yuxarı tərəfin alağını eləyib qurtardıq. Sabah da dəyirmanın yanındakı bağı eləyəcəyik, – deyə o həvəslə danışırdı.

Mən bağ aqronomuyam, kənd təsərrüfatı texnikumunu bitirmişəm. O isə, bağ briqadiridir. Demək istəyirəm ki, söhbəti yersiz deyil. Dəyirmanın yanındakı bağı mən texnikumu bitirib gələndən sonra salmışıq. Orada əkdiyimiz alma, armud və heyva ağacları hələ körpə olsa da, bu yaz çiçəkləyibdir.

Ata-ana öz uşağına necə bağlanırsa, biz də o bağa eləcə bağlanmışıq. Hətta, artel sədri Qədir bir dəfə bizə irad tutaraq deyib ki: "Təzə Ay çıxanda köhnəni doğrayıb ulduz eləməyin. O biri bağlara az fikir verirsiniz..."

– Ağdamdan gətirib əkdiyimiz "Qızıl Əhmədi"lər yaman tutub, – qız dəyirmandan gələn işığa baxaraq sözünə davam edirdi. – Yadındadırmı, o vaxt deyirdilər burada "Qızıl Əhmədi" alma yetişməz...

Ulduzlarla üçgünlük Ayın solğun ziyası onun gözəl üzünü işıqlandırdı. Yavaş-yavaş əsən yel, altında oturduğumuz söyüdün yarpaqlarını hərdən onun üzünə toxundururdu.

– Ay Bəyim, – dedim. – Əkdiyimiz ağaclar bitdi... Bu gün-sabah meyvə gətirəcək... Amma biz...

O, yanakı üzümə baxaraq gülümsədi. Dillənmədi. Mənim nə demək istədiyimi, nəyə işarə vurduğumu duyurdu. Necə də duymaya bilərdi?.. O, kəndimizin ən gözəl, ən ağıllı qızı idi, mənim neçə vaxtdan bəri keçirdiyim halı görmürdümü? Əgər, bu vaxta qədər ürəyimi ona açmamışamsa, təqsir özümdə, öz cəsarətsizliyimdə deyildimi? Əslinə baxsanız, buna cəsarətsizlik də demək olmaz. Bilirsinizmi, mən bir az xudpəsənd adamam. Mən onda özümə qarşı güclü, mənim qəlbimdə olduğu kimi güclü bir meyl hiss etmək istəyirəm. Bu mümkündürmü? Bilmirəm... Lakin o, mənə o qədər mehriban, o qədər səmimidir ki, bəlkə başqa biri bundan ürəklənərək çoxdan öz qəlbini ona açardı.

Amma mən... Bu gün onu burada gözləyəcəyimi dedikdə, qız gülümsədi və heç bir söz söyləmədi. Demək, indi mənim öz qəlbimi ona açmağa haqqım vardır.

Aşağıda, qaranlıq dərədə dəyirmanın çarxı üzərinə tökülən su aramsız şırıldayır, başımız üzərində isə, təzə açılmış söyüd yarpaqları pıçıldaşırdı. Uzaq üfüqdə dağlar qaralır, göydə tez-tez ulduz uçurdu. Onların ardınca uzanan odlu şərid közərib sönürdü. Hava ətirli və mülayimdi...

Yanımda aramla nəfəs alan qızın gözləri bir cüt qaragilə kimi parıldayırdı.

Bütün gücümü, cəsarətimi toplayaraq:

– Bəyim, – dedim, – sən hər şeyi bilirsən. De görüm mənə cavabın nədir?

O, bir müddət – mənə bir əsr qədər uzun gələn bir müddət – sanki nəfəs belə almadan, kirpiklərini belə qırpmadan daş kimi hərəkətsiz qaldı. Gözlərinin parıltısında bir dalğınlıq və ciddiyyət hiss olunurdu.

Mən onun buz kimi soyuq əlindən tutaraq:

– Niyə dinmirsən, Bəyim? – deyə həyəcanla səsləndim.

O, əlini yavaşca çəkərək, küləyin havada yelləndirdiyi saçını kəlağayısının altına yığdı... Sonra üzümə həmişəki kimi mehriban, səmimi bir nəzər salaraq:

– Doğrusu, Eyvaz, – dedi, – bu barədə heç fikirləşməmişəm.

Ürəyim qırılıb ayağımın altına düşdü. Axı, sevgi də bu bahar kimi bizim düşüncəmizdən asılı olmayaraq gəlir.

Mən bunu ona demək istədim. Lakin demədim... Ürəyi dilə tutmaq olmaz!.. Baharı zorla çəkib gətirmək mümkün deyil! Aşağıda novdan tökülən su şırıldayırdı. Bəyim narahat idi. Mən bunu onun yaylığının ucunu oynatmağından hiss edirdim. Lakin susurdum. Deməyə bir sözüm yoxdu. Birdən o, əlini qolumun üstünə qoyaraq, mehriban səslə:

– Eyvaz, – dedi, – kənddə iki yaxşı oğlan varsa, biri sənsən... Ancaq... qoy mən bir az fikirləşim.

– Neynək, – dedim, – fikirləş.

Bu sözlərdən sonra Bəyim sanki öz qəlbində bir rahatlıq hiss etdi... hər iki əli ilə yaylığını düzəldərək:

– Eyvaz, – dedi, – bu gün atam yenə də səni tərifləyirdi. Deyir, bu Bədirxanın oğlu bir-iki il də burada qalsa, kəndi cənnətə döndərəcək. Dəyirmanın altındakı bağı salandan bəri, elə bil, dünyanı ona vermisən.

Mən gülümsəyərək, daha doğrusu, özümü gülümsəməyə məcbur edərək susurdum. Bəyim isə, sevinc içində sözünə davam edirdi və mənə elə gəlirdi ki, o, atasının məni bəyənməsindən belə həvəslə danışmaqla həm mənim könlümü almaq istəyir, həm də özünə, öz qəlbinə təsir etməyə çalışırdı...

– Axı, özün bilirsən ki, atam hər adamı bəyənən deyil. Xüsusən də ki, cavan ola... Bu gün demişəm, ata, dəyirmanın üst tərəfini də toxmacarlıq eləyəcəyik, kefi yaman kökəlib.

Zarafatyana dedim:

– Demək, məni tərifləməyi səbəbsiz deyilmiş.

Qız mənim şənliyimə sevinərək dedi:

– Lap dilxor vaxtında dəyirmandan yaxşı bir söz dedin, qurtardı, o saat qaşqabağı açılacaq...

Doğrudan da, Musa dayının dəyirman əhvalatı bütün rayonda məşhur idi. Mən gözümü açandan onu dəyirmançı görmüşəm... Anamın deməsinə görə, atası Qubad da dəyirmançı imiş. Deyilənə görə, bu dəyirmanı da o tikmişdi.

Musa dayı dəyirmanın başına nə həngamələr açmamışdır!.. Daşları yuxarı qaldırmaq üçün mexaniki bir şey icad etmişdi. Ayağını onun üstünə qoyan kimi, o ağırlıqda dəyirmandaşı dərhal yuxarı qalxırmış. Sonra novdan tökülən suyu tənzimləmək üçün yenə də mexaniki bir şey qayırmışdı. Qış, yay, elə bir gün olmamışdı ki, Musa dayının dəyirmanı yatsın. Qonşu kənddə bir "od dəyirmanı" var. İl on iki ay Musa dayı bu dəyirmanla bəhsə girir, hamıya sübut etməyə çalışır ki, onun su dəyirmanı həmin "od dəyirmanı"ndan heç də geri qalmır. Bəzən qış bərk düşüb yolları qar alanda, şəhərdən mazut-filan gətirmək çətinləşəndə, "od dəyirmanı" işləmədiyi üçün o kəndin adamları da bizim dəyirmana gəlirlər. Bu zaman Musa dayının kefi, necə deyərlər, lap doxsan doqquz olur.

– Hə, deyəsən, qazınız yatıb, – deyə, o qonaqlara sataşır və onların dənini böyük həvəslə, hamıdan qabaq üyüdüb yola salır...

Lakin, deyəsən, mətləbdən uzaqlaşdım. Əlbəttə, əgər, Musa dayı Bəyimin atası olmasaydı və onu hamıdan, hətta, keçən il ali məktəb qurtarıb, indi rayon mərkəzində yaxşı bir tikinti mühəndisi olan oğlu Rəşiddən belə çox istəməsəydi, mən həyatımın ən əziz anlarını xatırladığım bir zamanda ondan bu qədər danışmazdım. Bəyimi çox istəyən, sevən hər kəs mənim də əzizimdir.

... Mən təzətər söyüd yarpaqlarının pıçıltısında sanki qızın qəlbinin döyüntüsünü eşidirdim. Mən onun gəncliyi ilə üçgünlük Ayın işıqlandırdığı bu körpə söyüd yarpaqları arasında qəribə bir ahəng duyurdum. Mənə elə gəlirdi ki, onun aramla aldığı nəfəs bu bahar gecəsinin canı, ruhudur. Mən hər şeydə xəyali bir sonsuzluq, bir əbədiyyət hiss edirdim. Sanki yanımda oturan, mənə mehriban sözlər danışan bu qızın, ulduzların zərif işığını əks edərək qaranlıqda parlayan qara gözləri ilə bu gecə, bu əzəmətli kainat bir yaranmışdır. Biz Musa dayıdan, onun keçən yay su üstündə mənim anam Bədirxanla savaşmasından (anam bizim kəndin cuvarıdır), sonra hər ikisinin xeyli müddət küsülü qalaraq, yığıncaqlarda bir-birinə tikanlı sözlər atmalarından, daha bilmirəm nələrdən söz salaraq gülür, bir dəfə də olsun, özümüz barədə danışmırdıq.

Birdən ayaq tappıltısı eşidib, geri baxdıq. Qaranlıqda yüklü bir at, onun ardınca da uzunboğaz çəkmə geyib belini enli qayışla qıvraq bağlamış ucaboylu bir oğlan çıxdı. Bu, mənim uşaqlıq yoldaşım Şahlar idi. O, iki çuval yüklənmiş atını dəyirmana enən cığıra salaraq:

– Axşamınız xeyir, – deyə yanımızda ayaq saxladı. – Nə yaxşı yerdə oturmusunuz!

Sonra inci kimi düzülmüş dişlərini ağardaraq gülümsəyib əlavə etdi:

– Gedib Musa dayıya deyəcəyəm...

– Bax, gecə iti açıb buraxaram ha, – deyə mən də eyni zarafatla cavab verdim. (Şahlar bizimlə qapı-qapıya qonşu olan bir qıza nişanlanmışdı. Görüş yerləri də bizim bağçanın alt tərəfi idi.)

– Onda susdum, – o, məzəli bir hərəkətlə əlini ağzına qoydu.

Tələsik atın ardınca qaçdı. Sonra yenə ayaq saxlayaraq:

– Eyvaz, – dedi, – sizə qonaq gəlib...

– Kimdir?

– Bilmirəm. Bir cavan oğlandır... Deyəsən, Gəncədəndir... Evinizi göstərdim, getdi...

Şahlar cığırı enərək, böyürtkən kolları arasında gözdən itdi.

– Gedək, Eyvaz! – deyə Bəyim ayağa qalxdı, – yəqin ki, qonaq səni gözləyir.

– Eybi yoxdur, əyləş.

– Yox.

O, daha oturmadı. Mən naəlac qalaraq, ayağa qalxdım. Biz, dəyirman arxının üstündən salınmış balaca körpüdən keçərək, kəndə sarı

yönəldik. Pıçıldaşan söyüd yarpaqları, novdan tökülən bahar suyunun şırıltısı, aşağı dərədə qaralan dəyirman arxada qaldı. Bu, məni kədərləndirirdi. Elə bil ki, bu gedişlə mən, nə isə, əziz bir şeydən ayrılırdım. Sanki mən onları və indi yanımda ürəyinin döyüntüsünü eşitdiyim Bəyimi bir də heç bir zaman bu qədər yaxından görməyəcəkdim. Elə bil ki, bu, mənim həyatımda əvvəlinci və axırıncı gecə idi... Qəribə idi, bu uğursuz hiss mənim ürəyimə haradan girmişdi?

– Bu vaxt sizə gələn qonaq kim ola? – deyə Bəyim kəndin işıqlarına baxaraq soruşdu.

– Bilmirəm. Mənim Gəncədə elə bir tanışım yoxdur.

Kəndimizin işıqları getdikcə yaxınlaşırdı, demək, biz yenə də ayrılırdıq. Yenə də mənim narahat gecəm başlanırdı. Eh... Bəyim, sənsiz keçən bu yaz gecəsinin nə qədər uzun olduğunu, məni nə xəyallarla yorduğunu bircə bilsəydin!.. Odur, qoşa çinar arasından sizin pəncərəniz görünür.

– Bir az dayan, Bəyim...

– Yox, Eyvaz... Gecdir.

– Sabah axşam yenə də həmin yerdə görüşəkmi?

– Bilmirəm... Vaxtımız olsa, görüşərik... Hələlik, sağ ol.

Sonra elə bil ki, mənim könlümü sındırmamaq üçün düz gözlərimə baxaraq, qaranlıqda gülümsədi və çevrilib iti addımlarla darvazalarına tərəf getdi.

– Gecən xeyrə qalsın, Bəyim.

O, başını döndərib, eyni mehribanlıqla:

– Sağ ol, – deyə darvazalarından içəri girdi.

Mən, uzun zaman yerimdən tərpənə bilmirdim. Mən bu bahar gecəsi ilə yalqız qalmışdım. Mən, pəncərənin tül pərdəsi arxasındakı işıqlı otaqda onun kölgəsinin ora-bura necə hərəkət etdiyini görürdüm. Yəqin ki, o, indi anası ilə danışır və mənim buraya mıxlanıb qaldığımı heç ağlına da gətirmir.

“Eh... tərpən, Eyvaz... qonaq səni gözləyir...” Mən ağır addımlarla uzaqlaşdım. Gecə mənim məhəbbətimi bir əfsanəyə, bir nağıla döndərmişdi. Göydə sayrışan ulduzlar, budaqlarda xışıldayan bahar yarpaqları mənə və mənim iztirablarıma qarşı tamamilə biganə idi. Axı, bu kədər, bu ümidsizlik nə üçündür? O mənə demədimi ki, kəndimizdə iki yaxşı oğlan varsa, biri sənsən... Demədimi ki, qoy bir az fikirləşim... Nə olar, qoy fikirləşsin. Mən bu düşüncələrlə həyətimizə girib,

evimizin artırmasına çıxdım. Stolun başında anamla qabaq-qabağa oturub, söhbət eləyən qonaq ayağa qalxaraq, şabalıd rəngində olan iri və canlı gözləri ilə mənə baxıb, xəfifcə gülümsədi. Bir anlıq mənə elə gəldi ki, bu adamı haradasa görmüşəm...

Mən qonaqla əl tutuşaraq:

– Əyləşin, əyləşin, – dedim, – xoş gəlmisiniz.

– Hüseynin yoldaşıdır, – deyə anam bildirdi. – Adı Humaydır. Bizim MTS-ə işləməyə gəlib.

Hüseyn mənim əmim oğludur. Gəncə Kənd Təsərrüfatı İnstitutunun axırıncı kursunda oxuyur. Humay şəhər dəbi ilə tikilmiş təmiz, lakin bir qədər nimdaş boz pencəyinin qoltuq cibindən bir kağız çıxarıb mənə verdi.

Hüseyn yazırdı ki, məktubu təqdim edən oğlan institutu qurtarıb, MTS-ə mühəndis-mexanizator təyin edilmişdir. Daha sonra Hüseyn dönə-dönə xahiş edirdi ki, onun bu dostuna yaxşı hörmət eləyək.

Mən məktubu oxuyub qurtarandan sonra Humay mənə açıq və şən bir nəzər salaraq:

– Kənddə mehmanxana olmadığı üçün bu gecəlik sizi narahat etməyə məcbur oldum, – dedi.

– Bu nə sözdür, gözümüz üstə yeriniz var...

– Ya Hüseyn, ya onun dostu... Elə bil öz evindir, – deyə anam Humayın stəkanını, götürərək o biri otağa keçdi.

Biz xeyli müddət ordan-burdan söhbət etdik. Məlum oldu ki, Humay Gəncədə yaşayan qoca bir müəllimin oğludur.

O, ayağa qalxaraq, mənim kitab şkafıma yaxınlaşdı.

– Baxmaq olarmı?

– Xahiş edirəm, burada özünüzü öz evinizdəki kimi hiss edəsiniz.

Humay şkafın qapısını açaraq, kitabları nəzərdən keçirirdi. Mən aqronom olsam da, lap uşaqlıqdan bədii ədəbiyyat maraqlısıyam. Tələbə olanda da əlimə düşən pulu kitaba verərdim. Odur ki, indi balaca bir kitabxanam vardır.

Humay, Çexovun külliyyatından bir cild götürüb baxır, mən də onu nəzərdən keçirirdim. Çox arıq olmasına baxmayaraq, yaraşıqlı oğlan idi. Yaşı iyirmi beşdən artıq olmazdı. Orta məktəbi qurtarandan sonra iki il orduda xidmət etdiyi üçün ali məktəbə gec daxil olubmuş. Əlləri və üzü xəstəlikdən yeni qalxmış adamlarda olduğu kimi, arıq və solğun

idi. Lakin iri şabalıdı gözlərində canlı, qaynar bir ifadə var idi. Bu da onun üzündəki solğunluğa sanki bir həyat və atəş verirdi. O, gözlərini qırpmadan mənə baxdıqda, mən, bu arıq, solğun adamda, nə isə, tükənməz bir qüvvə, həyatla güclü bir bağlılıq hiss edirdim. Elə bil ki, o, bu saat səni heyrətdə qoyan fövqəladə bir iş görəcəkdi. Elə bil ki, sənin bilmədiyin bir çox sirlər ona məlum idi. Gözləri şabalıdı rəngdə olan, yana daranmış qalın və yumşaq saçları, düz və yaraşıqlı burnu, gülümsəyərkən görünən qar kimi ağ dişləri ilə üzündəki solğunluq arasında bir ahəng hiss olunurdu.

O, Stendalın gündəliklərindən ibarət cildini götürüb vərəqləyərək:

– Bunu oxumusunuzmu? – deyə məndən soruşdu.

– Oxumuşam.

– Romanlarına söz yoxdur. Ancaq gündəlikləri xoşuma gəlmir.

– Nə üçün?

– Hər gün ziyafət, hər gün bal, hər gün gözəl qadınları ziyarət... Adam lap təngə gəlir, – deyə o, üz-gözünü turşutdu.

Sonra qətiyyətlə əlavə etdi:

– Bu böyük adamların fikirləri ilə əməlləri arasında çox zaman qəribə bir ziddiyyət görürsən. Bəzi həkimlər kimi, sənə deyirlər şərab içmə, amma özləri küpün dibindən əl çəkmirlər. Jan Jak Russo cəmiyyətin ədalətsizliklərindən danışır. Uşaqları tərbiyə etmək haqqında cildlər dolusu öyüd-nəsihət verir. Amma öz övladlarını, anadan olan kimi, aparıb uşaq evinə verirmiş. Siz buna nə deyirsiniz?

– Bizim üçün onların fikirləri maraqlıdır. Adamlar ölüb gedir, fikirlər, ideyalar isə yaşayır.

– Düzdür. Ancaq irəli sürdüyün ideyanı, birinci növbədə, özünə tətbiq etmək, onun doğru olduğunu öz həyatınla sübut etmək sənin vətəndaşlıq borcundur. Məsələn, biz bilirik ki, həqiqi insan cəmiyyətin xeyrini öz şəxsi nəfsindən həmişə üstün tutmalıdır. Bu, öz-özlüyündə bir ideyadır, elə deyilmi? Lakin bir anlığa təsəvvür edin ki, bizlərdən hər birimiz bu ideyanı təbliğ etdiyimiz halda, gecə-gündüz öz xeyrimiz haqqında düşünsəydik, onda nə olardı?

O, açıq pəncərədən qaranlıq bağçaya baxaraq susdu.

Anam bizim üçün qayğanaq gətirərək:

– Humay, – dedi, – gərək bizi bağışlayasan, vaxtsız oldu.

– Çox yaxşıdır, xala, – deyə Humay təklif gözləmədən gəlib əyləşdi.

Onun özünü bizdə belə sərbəst hiss etməsi mənə olduqca xoş gəlirdi.

Şamdan bir az sonra işıqları söndürüb, mənim otağımdakı çarpayılarda uzandıq.

Humayın gəlişindən duyduğum xoş təəssüratı Bəyim haqqındakı xəyallarım əvəz etdi: "Qoy bir az fikirləşim". Bu sözlərin hər bir hərfi bir ulduz olub, açıq pəncərədən görünən səmadan mənə baxaraq, qəlbimə ümid və səadət işığı salırdı...

Bu sözlər bahar gecəsinin lal musiqisi kimi mənə fərəhli nəğmələr oxuyurdu.

Bu sözlər mənə, bir neçə saatdan sonra açılacaq bahar səhəri kimi təzə və parlaq bir həyat vəd edirdi.

"Bəyim sözübütöv qızdır. Əgər, o, "Qoy bir az fikirləşim." dedisə, demək, ümid çoxdur."

... Səhər çaydan sonra kəndə çıxmağa hazırlaşdığımız vaxt Humayın çamadanını götürdüyünü görərək soruşdum:

– Yoxsa, evimiz xoşunuza gəlmədi?

– Əksinə, – dedi. – Bu gecə özümü lap öz evimizdəki kimi hiss eləmişəm. Ancaq daha sizə əziyyət vermək istəmirəm.

– Nə əziyyəti var, – deyə anam mənim əvəzimə cavab verdi, – üç otaqdır, ya sən, ya da Eyvaz...

O tərəddüd edirdi. Mən çamadanı onun əlindən alıb yerə qoydum.

... Hər ikimiz şad halda bağçadan çıxıb, maşın-traktor stansiyasına tərəf yollandıq. Bizim rayonda iki maşın-traktor stansiyası var... Onlardan biri rayonun mərkəzində, digəri isə, bizim kənddə yerləşir.

Küçədə Bəyimə rast gəldik. Onun ağ və göyçək üzündə parlayan qara gözləri bir neçə saniyə Humayın üzünə zilləndi.

– Tanış olun, Bəyim, – deyib Humayı ona təqdim etdim.

Bəyim qızararaq onunla əl tutuşdu.

Biz Bəyimdən ayrılıb yolumuza davam etdikdə, Humay məndən soruşdu:

– Bu qız kimdir?

– Bağ briqadiridir. Dəyirmançı Musanın qızıdır.

Humay daha heç nə demədi. Mən istəyirdim ki, o danışsın. Qızın haqqında nə isə bir söz desin. Lakin susurdu. Üzü qayğılı ifadə almışdı.

Biz maşın-traktor stansiyası yerləşən binanın yanına çatıb dayandıq.

– Acanda birbaş evə getməyi yaddan çıxarmayın.

– Yaxşı, – deyə o, ciddi ifadə ilə cavab verdi.

Mən ondan ayrılaraq, dəyirmanın yanında saldığımız cavan bağa getdim. Günəş üfüqdən xeyli yüksəlmişdi.

Qızlar, cərgə ilə əkilmiş körpə ağacların dibindəki alaqları təmizləyirdilər. Bəyim məni görərkən gülümsəyib yanıma gəldi. Təzə yarpaq açmış balaca ağaclara işarə ilə:

– Görürsənmi, – dedi, – necə gümrahdırlar!

Sonra saçlarının qıvrımlarını yaylığının altında gizlədərək tamamilə biganə halda soruşdu:

– O səhərki oğlan nə üçün gəlib?

– MTS-də mexanizator işləyəcək.

– Traktorçudur?

– Yox, mühəndisdir.

Mən, Humayın haqqında bildiklərimin hamısını ona söylədim. O, diqqətlə qulaq asıb, daha heç nə soruşmadı.

– Bəyim, – dedim, – bu gecə səni dünənki yerdə gözləyəcəyəm.

– Yox, Eyvaz, mən bu gecə kinoya gedəcəyəm. Təzə film gəlib. Özü də, deyirlər, ancaq bircə gecə göstəriləcək.

– Neynək, mən də ora gələrəm.

– Gəl, – deyə o, fikri dağınıq halda cavab verdi.

Mən ondan ayrılaraq, təzə bağın qurtaracağında saldığımız şitilliyə getdim. Bura balaca bir meşəni xatırladırdı. Beş mindən artıq müxtəlif növ şitilimiz vardı. Bütün qonşu kəndlər gəlib bizdən şitil aparırdılar. Bu da sədrimiz Qədirə ləzzət verirdi: “Qoy bizim sağlığımıza aparıb əksinlər” deyirdi.

Mən, tər yarpaqları günəş işığında parlayan bu kiçik ağaclara qarşı qəlbimdə bir ünsiyyət, bir doğmalıq hiss edirdim. Mən onların arasında dolaşır, hər birini diqqətlə nəzərdən keçirirdim. Onlar işıq və səadət içində olan körpə uşaqlara bənzəyirdilər. Biz onları kəndimizin Şahlar kimi zarafatcıl gəncləri ilə, Bəyimlə birlikdə əkib becərirdik. Onlarla birlikdə bizim qəlbimizdə gözəl duyğular, gözəl arzular böyüyürdü. İstər-istəməz düşünürdüm: “Kim bilir, indi baş-başa verən bu körpə şitillərdən hər biri hansı bağda çiçək açıb bar verəcək? Kim bilir, bizim qəlbimizdə indi bala quşlar kimi qanad bağlayan arzular hayana uçub gedəcək?”

Gün günorta yerinə əyilmişdi. Humayı tapıb, nahara aparmaq lazım idi.

Şitillikdən çıxıb, yavaş addımlarla dəyirmana sarı getdim. Hava sakit və isti idi. Dəyirmanın qabağındakı çəmənlikdə bir palanlı atla iki

eşşək otlayırdı. Onlardan bir qədər aralıda böyük yük maşını dayanmışdı. Üst tərəfdəki böyürtkən kollarının arasından üzüaşağı sallanan, yanları yaşıl yosun bağlamış nov və ondan tökülən suyun altında qıjıltı ilə hərlənən çarx sərin kölgəlik içində idi. Novun üstündə bənövşə rəngli cırcıramalar uçuşaraq hey səslənirdilər.

Mən dəyirmana çatdığım zaman bizim artel sədri ilə Humayın cığırla aşağı endiklərini görüb dayandım. Onlar köhnə dostlar kimi nə barədəsə ucadan danışıb-gülürdülər. Bizim bu artel sədri Qədir qəribə adamlardan biri idi. Qırx səkkiz yaşı olduğu halda, saçlarında bir dənə də ağ tük yox idi. Baxanda otuz beşdən artıq yaş vermək olmazdı. Əynində sürməyi parçadan köynək və şalvar, ayaqlarında yumşaq xromdan uzunboğaz çəkmə vardı. Həddindən artıq yoğun belini enli kəmərlə möhkəm bağlamış, başına yaşıl furajka qoymuşdu. Kefi kök olanda və ya mühüm bir iş görəndə, furajkanın dalını qaldıraraq, gözünün üstünə endirirdi. Peysəri və üzü qıpqırmızı idi. Çəp olmasa da, adama baxarkən başını buğa kimi azca yana əyib, gözlərini qıyırdı. Ona görə də, ilk dəfə rast gələnlər onu çəpgöz hesab edirdilər.

Yüz on səkkiz kilo ağırlıqda olmasına baxmayaraq, toylarda "tərəkəmə" oynayır, atı qızğın çaparağında düşüb-minirdi. Nə qədər məxfi söz danışır-danışsın, üç ağaclıqdan eşidilirdi. O, kəndimizdə çoxbilmiş adamlardan biri hesab olunurdu. Lakin, eyni zamanda, uşaq kimi şən və sadədil idi.

Keçmişdə, cavan vaxtında bir dəfə hirslənərək, zəhmindən atlar qulun salan bir bəyi götürüb su arxına basdığına görə, adına "Dəli Qədir" deyirmişlər.

Qədir gecə məktəbində yeddinci sinfi bitirmişdi. "Dumanlı Təbriz", "Qılınc və qələm" romanlarını oxumuşdu. "Koroğlu", "Qaçaq Nəbi" və "Tufarqanlı Abbas" dastanlarını əzbər bilirdi. Texnikaya böyük marağı vardı. Harada təzə bir maşın gördümü, gözlərini qıyıb diqqətlə baxardı. Lakin artelin təzə "Pobeda"sına çox nadir hallarda minir, həmişə atla gəzirdi. Bizim tərəflərdə ən yaxşı at Qədirdə olurdu. At adı eşidəndə, elə bil, kişiyə ilham gəlirdi. Qaşlarını çataraq, öz alapaça ürgəsindən böyük vəcdlə danışmağa başlayırdı...

– Aqronom, ay aqronom, – deyə o, hələ xeyli aralıdan məni səslədi. – Səhərdən bəri qonağını gəzdirməmiş yer qoymamışam. Gətirmişəm, bir Musa kişinin dəyirmanını da görsün.

Qədirin Musa dayıya da, onun dəyirmanına da bərk azarı var idi. Hər iki-üç gündən bir gərək dəyirmana baş çəkib, Musa dayının "ixtira" etdiyi şeylərin necə nəticə verdiyinə diqqət yetirə idi. Kəndə təzə bir adam gəldimi, Qədirin ona, birinci növbədə, göstərdiyi yer üç il bundan qabaq tikdirdiyi balaca "SES" idisə, sonra mütləq dəyirman olurdu.

– Necədir, kəndimiz xoşuna gəlirmi? – deyə mən Humaydan soruşdum.

– Çox xoşuma gəlir, gözəl perspektivi vardır.

– Hələ harasıdır!.. Gedək bir dəyirmana baxın, görün Musa kişi nə işlər düzəldib! – deyə Qədir qabağa keçərək dəyirmana girdi.

Biz də onun ardınca dəyirmana daxil olduq. Sürətlə hərlənən dəyirmandaşının o tərəfində dayanmış Musa dayı, əlinin ununu çırparaq, üçümüzlə də görüşdü. Bu, əlli yaşında, uzun, arıq, lakin dəmir kimi möhkəm bir adamdı. Şən baxışlı gözlərində, arıq, ovurdları batıq üzündə sərt bir ifadə vardı. Müştüyü qırmızı qarağat çubuğundan qayrılmış demisi daim ağzında tüstülənirdi. Paltarı köhnə oldu, təzə oldu, fərqinə varmazdı. Ancaq həmişə ən bahalı gümüşü dəridən qazağı papaq qoyurdu. Bütün yaz, yay, payız nazik corabla yüngül məst geyirdi. Bayaq dediyim kimi, mən gözümü açandan Musa dayını dəyirmançı görmüşəm. Əvvəllər onun əlində həmişə ovxarlanmış dəhrə olardı. Ancaq bir neçə ildir ki, daha dəhrə götürmür.

– Bax, görürsünüzmü, – deyə Qədir, Musa dayının düzəltdiyi mexaniki aparatları böyük həvəslə qonağa göstərdi.

Musa dayı demisini tüstülədə-tüstülədə sükut içində dayanıb baxırdı. Qədir izahat verib qurtarandan sonra Humay işgüzarlıqla:

– Vaxta ki, – dedi, – kənddə "SES" var, niyə dəyirmanı elektriklə işlətmirsiniz?

– Elektriklə? – Qədir təəccüblə ona baxdı.

Musa dayının gözlərində qəribə işıltı əmələ gəldi.

– Əlbəttə! – deyə Humay qəti ifadə ilə təsdiq etdi. – Bu daha çox xeyir verə bilər; kəndiniz də böyükdür.

Musa kişi demisindən dərin bir qullab alaraq, batqın səslə cavab verdi:

– Qonşu kənddə od dəyirmanı var. Ancaq bizimki heç vaxt ondan geri qalmayıb. Bir də ki, onun unu hara, bununku hara! Yerlə göy qədər təfavütü var.

– Hansının unu yaxşı çıxır? – deyə Humay maraqla soruşdu.

– Əlbəttə, su dəyirmanının unu!

– Ola bilməz! – deyə Humay qəti etiraz etdi. – Görünür, o kənddə dəyirmanı yaxşı işlədə bilmirlər.

Musa dayı cavab vermədi. Bu da onun bərk dilxor olduğunu göstərirdi.

Humay, Musa dayıya deyirdi:

– Sənin su dəyirmanının bir gündə üyütdüyünü elektrik dəyirmanı iki-üç saatda üyüdər!

– Düzdür, – deyə Qədir təsdiq etdi.

Musa dayı ona acıqlı-acıqlı baxaraq soruşdu:

– Ömründə bir dəfə bizim camaatdan dəyirman barədə şikayət eşidibsənmi?

– Qəribə söz danışırsan, – deyə sədr qızışdı. – Çox da şikayətlənən olmayıb. Vaxt aparmağına nə deyirsən?

Sonra Humaya üz tutdu:

– Doğrusu, indiyə qədər ağlımıza gəlməyib. Heç bilirsən camaatın bu taxıl üyütməyə nə qədər vaxtı gedir? Sən demişkən, böyük kənddir. Birdən elə olur ki, adam iki-üç gün növbəyə durur. Bir də, axı, elektriklə işləsə, bu bir dəyirmanlıq su da havayı axmaz.

– Havayı niyə axır? Bəs o nədir? – deyə Musa dayı təzə salınan bağı göstərdi.

– Oraya ildə cəmi iki-üç dəfə su lazım olur. Amma sən, il on iki ay havayı axıdırsan suyu. Qabağında elə bir yer də yoxdur ki, əkib-becərəsən. Axı, yayda bu suyun hər damcısı bir qızıla bərabər olur.

Musa dayı yaşıl qanovuzdan tikilmiş tənbəki kisəsini açıb, demisini hirsli-hirsli dolduraraq:

– İndi dediyin nədir? – deyə Qədirdən soruşdu.

– Dediyim budur ki, incinerin sözü ağlıma batır. Dəyirmanı tokla işlətmək lazımdır.

– Mən ölsəm də, o novun suyunu sovmaram, – Musa dayı acıqlı halda dəyirmandaşının o biri tərəfinə keçdi.

– Camaat deyəndən sonra sovarsan, – Qədir furajkasının dalını qaldırdı.

Bu vaxt Bəyim içəri girib salam verdi, atasından soruşdu:

– Çay qoymuşuq, sənə də gətirimmi?

– İstəmirəm! – deyə Musa dayı qəzəblə cavab verdi.

Bu, görünməmiş bir iş idi. Əslində, davakar bir adam olan Musa dayının öz qızına güldən ağır söz dediyini hələ indiyə qədər eşidən olmamışdı. Bəyim qızararaq əvvəlcə Humaya, sonra da atasına baxıb, cəld dəyirmandan çıxdı.

– Bizə acığın tutub, daha qızın üstünə niyə qışqırırsan, – deyə Qədir, Musa dayını məzəmmət etdi.

Bayaqdan bəri kənardan söhbətimizə qulaq asan yaşlı bir kəndli:

– Ay Musa, – dedi, – nahaq acıqlanırsan. Düzdür, bu dəyirmanı sənin rəhmətlik atan usta Qubad tikib, ancaq daha indi elektrik zamanıdır.

Musa dayı hirslə yana tüpürdü və qocaya cavab vermədi.

Biz dəyirmandan çıxıb gedəndə, Qədir qaqqıldayıb ucadan gülərək:

– Siz öləsiniz, – dedi, – bu Musa kişi dəsgahlı adamdır. Elə bilirsiniz, o tokla işləməyin xeyrini başa düşmür?

– Əgər, başa düşürsə, niyə etiraz edir? – deyə Humay təəccüblə soruşdu.

– Əvvəla, ona görə ki, bayaq o qoca deyən kimi, bu dəyirmanı onun atası tikib...

– Nə olsun atası tikib, indi ki, camaatındır.

– Nə qədər də olsa, ata yadigarıdır, ayrıla bilmir. İkinci əsas məsələ də odur ki, dəyirmanda işləməyin gəliri çoxdur. Axı, Musa kişi bir az tamahkar adamdır... Közü öz qabağına eşməyi xoşlayır. Ancaq sən ona qulaq asma. Balaca bir layihə hazırla, əvvəlcə özümüz baxaq, sonra da verək camaatın müzakirəsinə.

Axşam düz səkkizin yarısında mən, arxası üstə çarpayıda uzanaraq, qəzet oxuyan Humaydan soruşdum:

– Bu gecə təzə film göstəriləcək, getmək istəyirsinizmi?

– Nə filmdir?

– “Canlı meyit.”

– Gedək, – o, həvəslə ayağa qalxaraq, qəzeti stolun üstünə qoydu.

Bizim, “Mədəniyyət sarayı” deyə gurultulu bir ad verdiyimiz üç yüz adamlıq balaca klubumuz kəndin aşağı tərəfindəki açıqlıqda yerləşir. Klubun qabağında saldığımız kiçik bağçanın ağacları indi adam boyu qalxıb, çiçək açmışdır. Ağacların altı yaşıl yoncalıqdır. Ərik ağaclarının çəhrayı çiçəkləri arasında Sabirin yarımbüstü görünür. Biz bu balaca klubumuza o böyük şairin adını qoymuşuq.

Divarları təzə əhənglənmiş klubun qabağına çoxlu adam toplanmışdı. Demək olar ki, bütün cavanlar burada idi. Oğlanlar bizim yerlərin

dəbinə uyğun boğazlı çəkmə geymiş, günlüyü uzun furajka qoymuş, köynəklərinin üstündən enli qayış çəkmişdilər. Bizim cavanların hamısı yaxşı geyinməyi, bahalı zabit kəməri bağlamağı, ən gözəl xromdan uzunboğaz çəkmə tikdirməyi sevirdilər.

Qız-gəlinlər sarı, qırmızı, yaşıl parçalardan əlvan paltar geyib, təzə ipək kəlağayı örtmüşdülər. Bir dəstə gəncin ortasında dayanmış dostum Şahlar furajkasını yan qoyaraq, yenə, nə isə, məzəli bir şey nağıl edir, gənclər də gülməkdən uğunub gedirdilər. Təzə mahud frenc geymiş Musa dayı da bir qədər aralıda iki kişi ilə dayanıb, demisini tüstülədirdi. Bütün tərsliyinə baxmayaraq, o, ömründə bir kino buraxmazdı. Bizi görərkən qaşqabağını töküb, üzünü o yana çevirdi.

Humay buna əhəmiyyət verməyərək:

– Salam, Musa dayı! – deyə gülümsədi.

– Salam! – Musa dayı üzünü döndərmədən, sərt ifadə ilə cavab verdi.

Biz onların yanından keçib kassaya yaxınlaşanda, Bəyimi üç yoldaşı ilə gördük. Bəyim bilet alıb, geri dönəndə, bizi görüb, nə üçünsə qızardı. Sonra gülümsəyərək:

– Eyvaz, – dedi, – bilet almısınız?

Mənim cavabımı gözləmədən təkrar kassaya tərəf dönüb:

– İkisini də verin, – deyə pul uzatdı.

– Sən dayan, Bəyim, – mən mane olmaq istədim.

Lakin, o, biletləri alaraq, kassadan aralandı.

– Nə üçün siz zəhmət çəkirsiniz? – deyə Humay ona müraciət etdi.

Bəyim, Humayın üzünə baxmadan, ciddi və utancaqlıqla:

– Bir zəhməti yoxdur, – deyib biletləri mənə uzatdı.

Onun əynində krepdeşindən lap son dəblə tikilmiş qolları uzun don, balaca və yaraşıqlı ayaqlarında qara lak tufli, zərif ipək corab var idi. Bir qədər geri sürüşmüş ağ kəlağayısı altından qara saçlarının zərif qıvrımları görünürdü. Gözləri, gözəl və ağ üzündə bir cüt qaragilə kimi parıldayırdı.

Bizim kənddən çıxmış ziyalılar çoxdur. Onların içində həkim, mühəndis, hətta, elmlər namizədi də vardır. Yay zamanı, onlar istirahət üçün çox vaxt öz kəndimizə gəlirlər. Hər axşamçağı biz həmin bu klubun qabağına toplaşır, ordan-burdan söhbət edirik, tar çalırıq, hətta, bəzən teatr tamaşaları da hazırlayırıq. Belə zamanlarda hamının diqqətini cəlb edən qızlardan biri, bəlkə də birincisi Bəyim olur. Demək istəyirəm ki, o, çox oğlanlarla tanışdır. Lakin, mən heç bir vaxt onu

indiki vəziyyətdə görməmişdim. Ən gözəl, ən adlı-sanlı oğlanlarla belə, çox sərbəst deyib-danışan Bəyim indi qəribə bir gərginlik içində idi. Mənə elə gəlirdi ki, o, baxışlarını qəsdən ancaq mənim üzərimdə saxlamağa çalışırdı.

Humayın üzündə isə, ciddi və doğrusunu deyim ki, bir az təşəxxüslü ifadə var idi. Biz tamaşa zalına daxil olduqda, o, geri çəkilərək qızları qabağa buraxdı və qəsdən məni özü ilə Bəyimin arasına saldı. Bəlkə, qısqanclıqdan doğan bu müşahidələr mənim gərgin və narahat hisslərimlə bağlı aldanışdır? Biz dinməzcə oturub, baxırdıq. Ekranda gördüyüm aləm məni əsəbiləşdirirdi. Orada, nə isə, insanın nəfəsini daraldan, boğucu bir şey var idi. Mən Protasovun faciəsini görmək istəmirdim. Mənə nə olub? Nə üçün hər şey əsəblərimə toxunur?

– Bəyim, – deyə əyilib onun qulağına pıçıldadım, – sabah axşam səni dünənki yerdə gözləyəcəyəm.

O, gülümsəyərək, başını buladı. Bəli, gülümsəyərək... Bu, daha yaxşı idi. Bu, bahar fırtınası başlamazdan əvvəl çaxan şimşək kimi gözəl və cazibədar idi.

– Niyə gəlmək istəmirsən, Bəyim?

– Bir dəfə getdik, bəsdir. Daha nə var? – dedi.

Sonra birdən qulağıma tərəf əyilərək pıçıltı ilə soruşdu:

– Sənin qonağının adı nədir?

O, gülümsəyib dedi:

– Humay...

– Humay ki, qız adıdır.

Onun bu yarımqaranlıqda çətin seçilən üzü mənə hər zamankından daha gözəl, daha təravətli göründü. Mən ürəyimdə həm ağrı, həm də sevgi hiss edirdim. Yoxsa qısqanırdım? Yox! Min dəfə yox! Mən özümə bu qədər yaxın olan səadətin birdən-birə quş kimi uçub getməsini istəmirdim. Mənə elə gəlirdi ki, yanımda döyüntüsünü duyub-eşitdiyim ürək təkcə onun deyil, bütün həyatın qəlbidir! Mən isə, həyatı, yaşamağı sevirəm. Mən onun əlindən tutaraq, demək istəyirdim: "Bəyim!.. Əzizim! Bu dünyada hər kəsin bir ulduzu var. Mənim taleyimə də sən düşmüsən. Sən olmasan, mən yaşaya bilmərəm".

... Biz kinodan çıxanda, saysız-hesabsız ulduzlarla əhatə olunmuş Aypara kəndin yuxarı tərəfindəki bağların üzərində idi. Uzaqdan dəyirmanın səsi və qurbağaların qur-quru eşidilirdi. Adamlar dəstə-dəstə söhbət eləyə-eləyə evlərinə gedirdilər.

Bəyim özünəməxsus sadə, mehriban və şən bir dillə Protasovu zəiflikdə, “bir arvaddan ötrü başını itirməkdə” təqsirləndirir, “kişi gərək möhkəm olsun” deyirdi. O nə üçün belə deyirdi? Nəyə işarə edirdi? Humay isə, Bəyimin əksinə olaraq, Protasovun arvadını təqsirləndirirdi. Bütün bu mühakimələr məni əsəbiləşdirirdi. Mənə elə gəlirdi ki, Humayla Bəyimin danışıqlarında, nə isə, ürəyimi, izzəti-nəfsimi yaralayan bir şey var...

O gecə Humayla uzun zaman ordan-burdan danışdıq. Humay bayaq kənddəki sükutunun əksinə olaraq, indi söhbətinə ara vermirdi. O, hər şeydən: kəndimizdən, Qədirin məzəli hərəkətlərindən, Musa dayıdan danışırdı, lakin bir dəfə də olsun, Bəyimdən söz salmırdı.

– Bizim qızlar necə, xoşunuza gəlirmi? – deyə zarafatyana soruşdum.

O, qaşlarını çatıb, açıq pəncərədən görünən qaranlıq bağçaya baxaraq, xeyli susdu. Sonra mənə sarı dönərək, eyni ciddiyyətlə soruşdu:

– Bəyim harada oxuyub?

– Bizim onilliyi bu il qurtarıb. İmtahan vaxtı xəstə olduğu üçün ali məktəbə gedə bilmədi.

– Yoxsa, atası qoymayıb?

– Xeyr, Musa dayının sizin təklifinizə razı olmadığına baxmayın. Elmlə, mədəniyyətlə arası sazdır... Bizim kənddə ən yaxşı radioqəbuledici, ən yaxşı avadanlıq onun evindədir. Azərbaycan dilində çıxan qəzet və jurnalların çoxuna abunə yazılıb.

Hər zaman olduğu kimi, mən, indi də Musa dayıdan, onun ailəsindən böyük həvəslə danışırdım. Humay isə, daha heç bir şey soruşmurdu. Yalnız haçandan-haçana:

– Qəribədir, – deyə öz-özünə danışırmış kimi astadan dilləndi. – Musa dayı qəzet və jurnallara abunə yazılır, amma öz xeyrindən ötrü dəyirmanın elektriklə işləməsinə razı olmur.

O susdu, üzü yenə də fikirli və tutqun ifadə aldı.

Anam içəri girib, bizə axşam yeməyi təklif etdi.

Humay:

– Mən gecələr yemirəm, – dedi.

– Mənim də iştaham yoxdur, ana!..

Sonra gündüzkü əhvalat yadına düşdü. Dedim:

– Ana, bu gün Musa dayıda dəsgah var idi... Humay deyirdi, vaxta ki, kənddə “SES” var, dəyirmanı nə üçün su ilə işlədirsiniz?

Anam Humaya diqqətlə baxaraq soruşdu:

– Yəni, elektriklə işlətmək mümkündür?

– Əlbəttə, – deyə qonağın əvəzinə mən cavab verdim.

– Unu-zadı nə cür çıxar?

– Lap kefiniz istəyən kimi, – deyə Humay gülümsədi.

Sonra mənə müraciətlə əlavə etdi: – Görürsünüzmü, Bədirxan xalanı da, hər şeydən əvvəl, unun nə cür çıxacağı maraqlandırır.

– Daha, bəs, dəyirman nə üçündür? – deyə anam gəlib boş stullardan birində oturdu. – Əgər, bir elə iş eləsəniz, pis olmaz... O dəyirman bir qol suyu avara eləyib.

– Bilirsinizmi, – deyə mən Humaya izah etdim: – Anam kəndin cuvarıdır. O yay olmaz ki, su üstündə Musa dayı ilə üzləşməsin.

– Siz cuvarsınız? – deyə o, təəccüblə anama baxdı.

Anam bir az tündləşərək, kəskin Qarabağ şivəsi ilə:

– Necə bəyəm? Mən cuvar ola bilmərəm? – dedi və iti baxışlı gözlərini, meydan oxuyurmuş kimi, Humaya zillədi.

– Axı, cuvarlıq çox dava-dalaşlı işdir.

– Davaya qaldı, anama qaldı...

– Sən də qoy görək, – arvad mənə acıqlandı.

Sonra Humaya sarı dönərək:

– Bura bax, qardaşoğlu (o cavan oğlanlara həmişə, kişi kimi, qardaşoğlu deyir), – dedi, – sən lap yaxşı şey fikirləşmisən. Səhər bir yerdə gedib Qədirə deyərik.

– Qədir bilir, özü də razıdır, – dedim.

– Onda, qurtardı, getdi... Camaat da razı olar. Musa elə bilir, atası Qubad ki, o dəyirmanı tikib, tay heç kəs yaxına gedə bilməz. Qızını gördünüzmü?

Humay bərk qızardı və cavab vermədi.

– Görüb, ana, indicə bizimlə kinodaydı.

– Bir mahala dəyən candır. Göyçək, ağıllı, kamallı, hər sözü-söhbəti yerində...

– Az təriflə, ay arvad, sonra Humayla aramızda dava düşər.

– Eh... bilirəm ki, sizdə elə kəramət yoxdur.

Anam qalxıb, o biri otağa keçdi.

Biz işığı söndürüb, çarpayıya uzandıq. Lakin yata bilmirdik. Humay tez-tez bu böyrü üstündən o birinə çevrilirdi.

Sevgi ilə bahar əkiz yaranmışdır. Sevgi heç bir zaman bahardakı qədər cazibədar, möhtəşəm və narahat olmur. Budur, bütün kəndin yuxu-

ya getdiyi, yalnız dəyirmanın qıjıltısı ilə qurbağaların səsinin eşidildiyi bu bahar gecəsində bəzən olur ki, haradansa ürəyimə tikanlar sancılır... Bəzən bütün ağrılar unudulur, hər sevgi anı bir əbədiyyət qədər uzun, bir əfsanə kimi gözəl olur...

"Lakin, bütün bunlar, bu iztirablı dəqiqələr, bu şirin anlar nə üçündür?" deyə mən filosofluq edirəm. Bu zaman pəncərənin pərdəsini yelləndərək içəri dolan yaz küləyi sanki özü ilə yeni duyğular gətirir. Sanki bahar mənim bu bədbin düşüncələrimə qarşı üsyan edir. Sanki bahar mənə həyatın, böyük və əbədi həyatın nəfəsini duydurmaq istəyir.

... Səhər çay içib, evdən çıxdıq. Humay artel idarəsinə, mən isə, bağlara yollandım. Mən kəndin ayağında Bəyimə rast gəldim. Onun təzəcə yuyulmuş gözəl ağ üzü səhər-səhər açılmış nərgiz kimi zərif və təravətli idi. Saçlarının qabaq tərəfdəki qıvrımları hələ yaş idi. Qara gözlərində sevinc şəfəqləri oynayırdı.

– Sabahın xeyir, Eyvaz! Bu gecə niyə yatmırdın?

– Mən? Mən yatmışdım!..

– Bəs, gecə artırmanızda gəzən kim idi?

(Yadımdan çıxıb deyəm ki, Bəyimgilin eyvanından bizim ev aydınca görünür.)

– Bilmirəm. Yəqin bizim qonaq imiş.

– Hə... – deyə, o, sözü uzatdı.

Üzü dərhal ciddi ifadə aldı. Mən soruşdum:

– Bəs, sən nə üçün o çağacan yatmamışdın?

– Bilmirəm. Elə yaxşı gecəydi ki, heç yuxum gəlmirdi.

– Amma mən daş kimi yatmışdım.

– Yatmayıb nə qayıracaqdın? Cavan oğlansan. Yazın yuxusu da ki, şirin olur...

Onun gülə-gülə dediyi sözlərin hər biri köz kimi ürəyimin başına yapışırdı. Mən istəyərdim ki, "daş kimi" yatdığım üçün Bəyim məni məzəmmət etsin, aramızda giley-güzar olsun. Lakin, görünür... yox, deməyə dilim gəlmir... Bir də, axı, nə üçün mən ondan belə şeylər umuram? Buna mənim nə haqqım var?

... Axşam Humaydan soruşdum:

– Keçən gecə, deyəsən, bədxab olmuşdunuz?

– Bəli, gördüm yata bilmirəm, durub çıxdım eyvana. Nə bildiniz?

– Mənə Bəyim dedi... O sizi görürmüş...

– Haradan? – Humay dərin heyrət içində mənə baxdı.

– Oradan, bax, qabağında böyük iydə ağacı olan o ikimərtəbə evin eyvanını görürsünüzmü? Oradan!..

Sevənlərin öz adi gözlərindən başqa bir də ürəklərinin gözü olur və bu göz onların sevgisi ilə əlaqədar olan hər şeyi fövqəladə bir doğruluqla görüb duyur. Ona görə də, Humay nahaq yerə iydə ağacı ardından görünən o eyvana baxmamağa cəhd edirdi.

– Bu gün nə ilə məşğul oldunuz? – deyə mən aramızdakı gərgin sükutu pozmaq üçün soruşdum.

O, ağır bir yükdən qurtarmış kimi, dərindən nəfəs alıb, həvəslə söhbətə girişdi:

– Dəyirmanı elektrikləşdirmək üçün balaca bir layihə düzəldib verdim Qədir kişiyə, sonra da MTS-in həyətində olan maşınları nəzərdən keçirdim.

– Dəyirman məsələsində Musa dayı lap dəli olacaq.

O, qaşlarını çatıb, Musa dayının eyvanına tərəf ötəri bir nəzər salaraq:

– Nə etməli? – dedi, – camaatın xeyri dəyirmanın elektriklə işləməsindədir!..

... Səhəri gün, təxminən saat birdə, mən qəlyanaltı eləmək üçün velosipedlə evə qayıdarkən, klubun yanından keçən yolda Humayla Bəyimin dayanıb söhbət etdiklərini gördüm... Velosiped altımda büdrədi və mən qeyri-ixtiyari olaraq yerə düşdüm.

Humay nə isə deyir, Bəyim də gözlərini aşağı dikərək, kələğayısının ucunu oynada-oynada onu dinləyirdi. Hər ikisinin üzündə ciddi, gərgin və həyəcanlı ifadə vardı. Mən özümü danlayaraq: “Qəribə adamsan, – deyirəm, – nə olsun. İki tanış adam küçədə bir-birinə rast gəlib, beş kəlmə söz danışa bilməz? Yaxşı deyil... Burada dayanıb, onlara baxdığımı görsələr, ürəklərinə yüz cür şey gələ bilər. Kişi kimi yaxınlaş, salam ver”.

Lakin mən öz rəyimin əksinə, velosipedə minib, yavaşca geri dönərək, başqa yolla getdim.

... Anamın gətirdiyi xörəyə əlimi vurmayıb, Humayı gözləyirdim. Yarım saat keçdi, o gəlmədi, bir saat keçdi, gəlmədi. Hava bu gün elə bürkü idi ki, adamın lap ürəyi qısılırdı.

– Sən çörəyini ye. Səhər də dilinə heç nə vurmamısan. Humay gələr, onun da payını qızdırıb verərəm, – deyə içəri girən anam təkid etdi.

Mən qəribə bir narahatlıq içində ayağa qalxıb:

– İştaham yoxdur, – deyə stoldan uzaqlaşdım.

– Sənə nə olub, bala? Çörəkdən-sudan niyə kəsilmisən?

– Mənə nə olacaq, ay arvad? – deyə gülümsədim. – Bayaq düşərgədə bir az yemişəm. Ona görə də, indi ürəyim istəmir.

Anam inanıb, o biri otağa keçdi. Mən, iradəmin əksinə olaraq, aşağı, düşüb velosipedə mindim, birbaş kluba sarı getdim. Tini burulanda Bəyim qarşıma çıxdı. Velosipedi saxlayıb düşdüm. O da, istər-istəməz (mən bunu, ani olaraq, onun üzündə yaranan narahat ifadədən hiss etdim), ayaq saxladı.

– Haradan gəlirsən, Bəyim?

O, bir az özünü itirərək:

– Klubdan, – deyə astadan cavab verdi.

İkimiz də susduq. İkimiz də gərgin həyəcan içində idik.

Nəhayət, səsimə mümkün qədər mehriban ahəng verməyə çalışaraq:

– Nə oldu, Bəyim, – dedim, – fikirləşdinmi?

Qəribədir, o bu sualı gözləyirmiş kimi, tələsik və soyuq ifadə ilə:

– Bilirsənmi, Eyvaz, – dedi, – bizim evlənməyimiz baş tutan iş deyil.

– Nə üçün?..

– Mən lap uşaqlıqdan səni bir qardaş kimi istəmişəm.

Sonra həyəcanla üzümə baxaraq əlavə etdi:

– Xahiş edirəm, inciməyəsən.

Mən gülümsəyərək:

– Niyə inciyirəm ki? – dedim və yavaşca velosipedə minib, yoluma davam etdim...

Ətrafına ulduzlar düzülmüş Aypara ilə işıqlanan bahar gecəsi həyəcan və fərəhlə nəfəs alırdı. Gecə, qızılgüllərin, yasəmənlərin ətri ilə dolu ılıq havası ilə üzümü oxşayaraq, qulağıma təsəlliverici səslər pıçıldayırdı. Gecənin mehribanlığında bir intəhasızlıq, bir ehtişam var idi.

Bayaqdan bəri, köklənmiş tar simləri kimi tarım çəkilən əsəblərim, elə bil ki, boşalırdı. Elə bil ki, cümlə dərdlərin loğmanı olan ana təbiət bizə bəxş etdiyi həyatın gözəllikləri haqqında fərəhli mahnılar bəstələyirdi.

Lakin sən o həyatın özü deyildinmi, Bəyim? Səndən əli üzülən bir adam necə iztirab çəkməyə bilərdi? Evinizin böyründən keçib gedirdim. Sən, Ay işığında yarpaqları gümüştək parlayan iydə ağacı-

nın ardında, eyvanınızda dayanıb, bizim evə sarı baxırdın. Lakin artıq bunun mənə aidiyyəti yox idi. Mən indi göydəki ulduzlara necə baxırdımsa, sənə də eləcə baxırdım. Yox, mən düz demədim. Əgər, sən bir ulduz olub, göylərdə parlasaydın, mən bütün gündüzü gecənin xəyalı ilə yaşayardım. Mən səni tuş tutub, bütün ömrüm boyu fərəh və səadət içində irəliləyərdim. İndi mən sənsiz harada qərar tutub dayana bilərəm? Əgər, sən məni mənim yüzdə birim qədər sevsəydin, ömrüm nəhayətsiz bir səadət içində keçərdi. İndi ki, sevmədin, yenə də xoşbəxtəm. Çünki sən xoşbəxtsən! Əgər, bu qədər müddətdə sən məni gələcək bir ər kimi sevə bilmədinsə, bu səninmi günahındır? Axı, sevgi də bu gecə, bu bahar kimi gəldiyi zaman bizim rəyimizi soruşmur. Əgər, soruşsaydı, and içərəm ki, sən məni sevərdin. Axı, sən bilirdin ki, mənim yüz canım olsaydı, birini də səndən əsirgəməzdim.

Mən xəfif səslərlə dolu zəmilərin arasındakı cığırla gəlib dəyirmanın üst tərəfindəki söyüdlüyə, srağagün axşam Bəyimlə birlikdə oturduğumuz yerə çıxmışdım. Lakin indi bura mənə, obası köçüb getmiş bir yurd kimi yiyəsiz və qərib görünürdü.

Gumbultu ilə arxa tullanan qurbağaların səsində, aşağıda dəyirman çarxına tökülən suyun şırıltısında indi payız çiskinitək kədərli bir şey duyurdum.

Ürəyim elə yaman sıxılırdı ki... Mən özümdə sentimental bir qüssə deyil, tamamilə aydın, fiziki ağrı və iztirab hiss edirdim.

Axı, mən bilirdim ki, həyat yalnız bizim bir qıza olan məhəbbətimizdən ibarət deyil... Mən bunu lap yaxşı bilirdim. Mən yaşamağı sevən, cəmiyyətimizə xeyir verməkdən hədsiz nəşə duyan zəhmətkeş bir adamam; atam da, babam da belə olublar. Mən sabun köpüyü kimi boş xəyallara, avara üzüntülərə nifrət edirəm. Lakin... Balzak deyir ki, "sevgi – gənclik ruhunun çiçəklənməsidir". Bu, doğrudan da, belədir. Mənim qəlbimdə bahar coşğunluğu ilə açılmış çiçəklər isə, birdənbirə tufana düşmüşdü. Bu tufan o qədər güclü idi ki, özümdə hədsiz fiziki qüvvə hiss etdiyim halda, gələcək güləş yarışlarında birinci çıxmaq arzusu ilə hər səhər ağır daşları oynatdığım halda, uşaq kimi başımı itirmişdim.

Ancaq zərbə nə qədər güclü olursa-olsun, onu mərdliklə qarşılamaq lazımdır! Mənim yeganə təsəllim bu olacaq! Əgər, mən bunu, yəni, öz mərdliyimi itirsəm, demək, həqiqətən məhv olmuşam!

Görəsən, Musa dayı bu saat nə edir?

Mən yoxuşu enib, dəyirmana yaxınlaşanda, Musa dayının novun yanındakı dikdirdə demi çəkdiyini gördüm.

– Salam, Musa dayı, burada niyə oturmusan?

– Elə-belə... Sən bu vaxt burada nə gəzirsən?

– Kənddən gəlirəm, dedim görüm dəyirmanda növbət var, ya yox? Səhər bir az dən üyütmək istəyirik.

– Olar...

Bizdən bir az aralıda iki çılpaq at xırıltı ilə otlayırdı. Sıx böyürtkən kolları arasında hərlənən çarxın səpələdiyi soyuq su zərrələri üzümüzə toxunurdu. Havada buğda ununun qoxusu duyulurdu.

Ağzındakı deminin odu közərir, Musa dayının tutqun üzünü və dərində qaralan gözlərini işıqlandırırdı. Mən danışmaq istəyirdim.

– Musa dayı, dünənki söhbətin axırı nə oldu?

O, demini ağzından götürüb, qaranlıqda tüpürdü:

– Bir şey ki, Qədirin başına girdi, fələk gəlsə, çıxara bilməz.

– Camaat da istəyir...

– Cəhənnəmə ki!.. Dədə-babadan yadigar qalan bir budur, qoy bunu da uçurub-dağıtsınlar. Özün bilirsən ki, mən heç vaxt elin xeyrindən-şərindən kənarda qalmamışam. Əgər, bu su dəyirmanından indiyə qədər bir adam narazılıq eləmiş olsaydı, bu kənddən bir adam ayrı dəyirmana dən aparsaydı, sabah birinci mən özüm baltanı götürüb, o novu çilik-çilik elərdim. İndi ki, heç bir narazılıq yoxdur, niyə özünüzdən iş açırsınız?

– Vaxt gələcək ki, kənddə hər işi elektrik görəcək, Musa dayı.

– Görəcək, görsün də... Elə gərək bu dəyirmandan başlayasınız?

Musa dayı hirslə əlini yellədi.

Bir xeyli müddət sükutla keçdi. Birdən Musa dayı mənə tərəf dönərək:

– Sən o qonağına deynən ki, farağat otursun, – dedi. Kəndi bir-birinə qatmasın. Onu göndəriblər MTS-ə, getsin işini görsün.

– Qonaq bizim xeyrimiz üçün deyir.

– Lazım deyil onun xeyri bizə.

Bu zaman dəyirmandan bir kəndli çıxaraq, üzünü qaranlığa tutub:

– Ay Musa! – çağırdı. – Gəl bizi yola sal.

Musa dayı dinməz-söyləməz qalxıb, ağır addımlarla uzaqlaşdı.

Qaranlıqda “dəh” deyə-deyə atları dəyirmana tərəf sürən kəndlinin səsi və ayaq tappıltıları eşidilirdi...

... Mən, ulduzların altında dəniz kimi hərəkətə gələn zəmilərin arası ilə kəndə doğru gedə-gedə düşünürdüm: “Bəlkə, mənim bütün bu narahatlığım, bütün bu iztirablarım axmaq bir qısqanclığın nəticəsidir. Bəlkə, mən, Don Kixot kimi havayıca özümdən çıxıram?”.

Lap qulağımın dibindən kiçik qanadlarını ılıq və ətirli bahar havasına çırparaq bir quş da uçub keçdi. Yəqin ki, qızquşu idi. Qaranlıq zəmilərin arasında şərid kimi ağaran cığırla irəliləyib, balaca təpəni aşandan sonra Bəyimgilin evi göründü.

Birdən, pəncərədən düşən çıraq işığının qabağını kəsən yarpaqların kölgəsində iki nəfərin durduğunu gördüm. Onlar idi. Bəyimlə mənim əziz qonağım! Aradan neçə saniyəmi, yoxsa neçə saatmı keçdi, bilmirəm. Nəhayət, onlar əl tutuşaraq ayrıldılar. Qız dönüb evlərinin darvazasına tərəf qaçdı. Oğlan da çevrilib, yavaş-yavaş yola doğru getdi.

... Mən pillələri qalxıb evimizə girdiyim zaman Humayı otağın içində var-gəl edən gördüm. Onun üzündə xoşbəxt təbəssüm var idi. Bu, məhəbbətin elə böyük bir anı idi ki, insan öz riqqət və nəcibliyi ilə bütün dünyanı ehtiva etmək istəyir.

– Eyvaz, idarədə kim vardı? – deyə o, nəşə ilə soruşdu.

İri şabalıdı gözləri elə parıldayırdı ki, adamın lap xoşu gəlirdi...

– Mən idarəyə getməmişdim, – deyə içərimdəki gərginliyi boğmağa çalışaraq cavab verdim.

Xeyli müddət nə o danışdı, nə də mən dindim.

Birdən Humay heç gözlənilmədən:

– Eyvaz, – dedi, – mən evlənmək istəyirəm.

– Zarafat edirsiniz?

– Xeyr, ciddi sözümdür.

Mən öz-özümə təskinlik verdim:

“Nə olsun, burada təəccüblü nə var ki? Bir-birini istəyəndən sonra niyə evlənməsinlər?” Lakin kürəklərimin arası elə gizildəyirdi ki, elə bil, bədənimə titrətmə gəlirdi. Elə bil, ürəyim qırılıb min arşınlıq quyuya düşürdü.

– Deməli, bizim kəndin suyu şirin imiş, – deyib gülümsədim. – Yaxşı, xeyir işin təqsirkarı kimdir?

O, stul çəkib oturaraq ciddi ifadə ilə:

– Mən Bəyimlə evlənmək istəyirəm, – dedi.

Mən, üsulsuz tərpənərək, qrafinin böyründəki stəkanı salıb sındırdım.

– Bax, bu qabın sınmağı yaxşı əlamətdir, – deyə zarafat etdim. – Sonra, dünyagörmüş təcrübəli adamlar kimi, təmkin və işgüzarlıqla əlavə etdim: – Bəyim ağıllı qızdır. Onunla yaxşı ailə qurmaq olar. Yəqin ki, siz öz aranızda bir qərara gəlmisiniz.

– Bəli, danışmışıq.

– Daha nə deyirsiniz? (Guya ki, o bir söz deyirdi.) Başqa şeylər asandır. Evlənməyiniz barədə mənə görə hər nə qulluğunuz olsa, hazıram. Gecəniz xeyrə qalsın.

– Çox sağ ol, Eyvaz!

Cəld yatağa girib, yorğanı başıma çəkdim. "Görəsən, Humay niyə mənə belə riqqətlə təşəkkür edir? Yoxsa, qız ona bir söz-zad deyib? Eh, deyəndə nə olar ki? Yatmaq lazımdır."

... Səhər yuxudan oyananda Humayı açıq pəncərə qabağında dayanmış gördüm: onun çiyinləri üzərindən Musa dayının evinə tərəf baxdım, sərin kölgəli eyvanda tüstülənən ağ samovarın yanında üzü bəri dayanmış Bəyim gözümə dəydi.

Əlac yox idi. Mane olsam da, salamlaşmaq lazım idi.

– Sabahınız xeyir, Humay!

O, diksinib geri çevrildi:

– Sabahın xeyir, Eyvaz! Görürsən, nə gözəl havadır...

– Bizim kəndin nəyi gözəl deyil ki...

Əl-üzümüzü yumaq üçün aşağı düşdük. Bahar ömrünün ən coşğun çağlarını keçirirdi. Alma, ərik, şaftalı ağacları tamam çiçəklənmişdi. Qızılgül kolunun üstündə nəlbəki boyda iri güllər açılmışdı. Onların qırmızı yarpaqları üzərinə düzülmüş şeh damlaları səhər günəşinin incə şüalarını göz qamaşdıran parlaqlıqla əks etdirirdi.

Quşların həyəcanlı səsi bir-birinə qarışaraq, coşğun bir simfoniyanı xatırladırdı. Belə bir vaxtda canından artıq sevdiyin bir qızdan əlinin həmişəlik üzüldüyünü hiss eləmək çox ağırdır.

– Eyvaz, rəngin niyə qaçıb, xəstə-zad deyilsən ki?

– Xəstə niyə oluram? – mən iki pudluq daşı qəsdən sol əlimdə beş dəfə qaldırıb-endirərək xeyli uzağa tulladım.

– Afərin! – Humay uşaq kimi sevindi. – Hüseyn deyirdi ki, sən bir dəfə bura qastrola gəlmiş pəhləvanı dörd dəqiqədə məğlub etmisən.

– Pəhləvanı məğlub etməyə nə var ki? – deyə zarafatla cavab verdim.

... İşə gedəndə Bəyimə rast gəldik. (Yəqin ki, səhər-səhər burada görüşməyi dünəndən sözləşmişdilər.) O, hər ikimizə eyni şən və xoşbəxt təbəssümlə baxıb salam verdi.

Mən özümü bacardığım qədər gümrah və şad göstərməyə çalışaraq:
– Əleykəssalam! – deyə keçib getmək istədim.
Lakin o, qolumdan tutaraq, həmişəki sərbəst və mehriban ifadə ilə:
– Eyvaz, – dedi, – lap Aya-günə dönmüsən. Hardasan, görünmürsən?
– Nə bilim, Bəyim, – dedim, – iş, güc...
– Rəşid gəlib. Səni soruşurdu.
– Doğrudanmı? Məndən ona salam de.
– Çox uzaqdasan? Niyə özün gəlib görüşmürsən? Günorta üstü Humayı da götürüb gələrsən.
– Nə olar, götürüb gələrəm... İndi məni bağışlayın, doqquzda sədrlə görüşməliyəm. Hələlik! Cəld uzaqlaşdım.
– Eyvaz, bax, gözləyəcəyik ha! – deyə Bəyim arxadan səsləndi.
Sözün açığı, yaman qəzəbləndim. "Əgər, bütün qızlar sənin kimidirlərsə, lənət sizin hamınıza! Gör bir zərrə qədər də olsa, vicdan əzabı çəkirmi?.." "Humayı da götür, gəl bizə." Bir qədər keçdikdən sonra, "Axı, Bəyim nə üçün vicdan əzabı çəkməlidir? deyə özümü məzəmmət etdim. Onun bir qəlbi var, birini də sevir. Sənə söz-zad verməmişdi ki..."
Ancaq bunu demək asandır. Sən gəl ürək üçün təsəlli, rahatlıq tap!
Mən bir yerdə dayana bilmirdim. Bu bağdan o bağa keçir, qarşıma hər kəs çıxırdısa, söhbətə tuturdum.
Nəhayət, gün günortadan əyildiyi zaman Bəyimin tapşırığını yerinə yetirmək üçün Humayın dalınca MTS-ə getdim. Yolda Şahlarla rastlaşdıq.
O, gülə-gülə:
– Eyvaz, – dedi, – sənə demədim ki, fürsəti əldən vermə?
– Nə olub?
– Guya ki, bilmirsən?
– Bəyimlə Humayın əhvalatını deyirsən?
– Yoxsa, sənə təsir eləmir?
– Eh... Nə çoxdur dünyada qız!..
– Afərin, bax, bunu yaxşı dedin. Bir qız ki, məni istəmədi, mən onu heç dünəndən istəmirəm...
– Vəssalam!
– Lap istəyir dünya gözəli olsun!
– Lap istəyir mələk olsun!
– Amma öz aramızdır, mühəndis pis oğlan deyil.

– Bəyim pis oğlanı istəyər?

– Doğrusu, bu məsələdən sonra əvvəllər onu görəndə əllərim yaman gicişirdi.

– Nə danışırsan, Şahlar?

– Amma indi baxıb görürəm, qıyılmalı oğlan deyil. Sən öləsən, o gələndən bəri MTS-in maşınları saat kimi işləyir. Deyirlər, başı çıxmadığı iş yoxdur. Amma, bura bax, Musa dayı ona qız verməyəcək...

– Nə üçün?

– Necə nə üçün? Xəbərin yoxdur? Məsələ qaldırıb ki, dəyirmanı elektrikləşdirsin. Musa dayını da ki, tanıyırsan, dəyirman dədəsindən qalıb, elə bilir ziyarətgahdır. Sən ölməyəsən, dəsgah olacaq... Belə hara gedirsən?

– MTS-ə.

– Niyə?

– Humayı götürüb, Musa dayıgilə gedəcəyəm. Bəyim bizi qonaq çağırıb.

– Sənin məhəbbətindən qətiyyən baş açmıram. Xudahafiz.

Şahlar acıqlı halda uzaqlaşdı.

Mən onun arxasınca baxaraq gülümsədim: “Burada baş açılmayacaq nə var ki?”

Maşın-traktor stansiyasının geniş həyəti cürbəcür kənd təsərrüfatı maşınları ilə dolu idi. Humay bir dəstə cavan mexanizatorla “S-86” traktorunun açılmış motoru yanında dayanıb, onlara nə isə izah edirdi. Başı söhbətə o qədər qarışmışdı ki, mənim gəldiyimi belə hiss etmədi. Qədir də burada idi. Hamıdan qabaqda dayanaraq, gözlərini qıyıb, mühəndisin sözlərinə diqqətlə qulaq asırdı.

Humay tez-tez əyilib-qalxır, əli ilə motorun yağlı hissələrinə toxunaraq, fikirlərini əyani surətdə başa salırdı. Onun gözləri indi hər zamankından daha parlaq və canlı görünürdü.

Mən, mane olmamaq üçün, qiraət otağına gedib, qəzetlərə baxdım...

... Biz Qədiri də dartıb özümüzlə birlikdə Bəyimgilə apardıq, o da mənim kimi, Rəşidlə bərk dost idi.

– Qorxuram Musa kişi bizi qova, – deyə o, bərkdən güldü. Bu gün dəyirmanın tokla işləməyi barədə qərar çıxarmışıq.

Mən, Şahların bayaqkı sözlərini xatırladım: “Doğrudan da, onlara niyə gedirəm? Yaxşısı budur ki, bir şey bəhanə elə, geri qayıt”. Lakin qayıtmadım.

Biz qoşa çinarın altından keçib, qırmızı darvazadan içəri girdik, taxta pilləkənlə Musa dayının evinə qalxdıq.

Üzərinə ağ süfrə çəkilmiş stolun arxa tərəfində qoyulmuş enli taxta çarpayıda yastığa dirsəklənib kitab oxuyan Rəşid ayağa qalxdı, qabağımıza yeriyərək, hər birimizlə görüşdü. Sonra stulları göstərdi:

– Əyləşin.

Bəyim də gəlib bizə salam verdi və dərhal qayıdıb getdi.

Rəşid ucaboylu, gözəl, gülərüz bir oğlandı. Atasının gözləri kimi, bir az dərində olan qara gözləri ilə qonağa diqqət yetirərək dedi:

– Əgər, səhv etmirəmsə, siz bizim MTS-in mühəndisisiniz?

Qədir təsdiq etdi:

– Özüdür ki, var.

– Atamın kürkünə yaman od salmısınız. Acığından bu gün hamımızla dalaşıb. Mənə deyir ki, sən ispalkomla danış, qoymasın dəyirmana əl vuralar... Deyirəm, ay ata, dəyirmanın sahibi arteldir, ispalkom nə deyəcək?

Rəşid gülümsəyərək, stolun üstünə qoyulmuş açıq “Kazbek” qutusundan bir papiros götürüb yandırdı.

Eyvanın o biri başındakı kürənin üstündə nə isə bişirən Kəklik xala kök bədənini yırğalaya-yırğalaya gəlib, bizə “xoş gəldin” elədi. Onun əynində qolları enli boz köynəklə qara arxalıq, uzun tuman, başında ağ haşiyəli bənövşəyi kəlağayı var idi.

– Necəsən, ay bizim dağların kəkliyi? – Qədir ona sataşdı.

– Hər halda, səndən qıvrağam. – Kəklik xala onun köklüyünə işarə vuraraq, dil altında qalmadı.

– Elə olar da! Kişini qupquru qurudub, özün, maşallah, gündən-günə ətə-cana gəlirsən.

– Bəsdir ha! – Kəklik xala məclisdə yad qonaq oturduğu üçün həya ilə yaylığını ağzına çəkdi.

Qədir gülərək:

– Eybi yoxdur, – dedi, – bunlar da öz uşaqlarımızdır, sirrinizi heç yerdə açmarıq.

– Bizim təzə inciner bu oğlandır?

– Hə, budur, ana, – deyə Rəşid cavab verdi, – adı da Humaydır.

Kəklik xala gülümsədi:

– Deyirəm, a kişi, niyə acıqlanırsan? İndi tok əyyamıdır. Görmürsən, fermanın qoyunlarını da tokla qırxırlar. O gün qız deyirdi ki, bir

azdan taxılbiçən maşın da tokla işləyəcək, traktor da... A kişi, deyirəm, indi ki, belədir, sən bu su dəyirmanı ilə ortada tək qalıb nə qayıracaqsan?

– Elədir, ana, – Rəşid ciddi təsdiq etdi.

Sonra bizə müraciətlə:

– Bilirsinizmi, – dedi, – o dəyirmanı sudan ayırmaq atama ağlasığmaz bir iş kimi görünür. Neçə dəfə olub ki, gecə bu eyvanda oturduğu yerdə birdən çayını yarımçıq qoyub, ayağa qalxıb ki, gedirəm dəyirmana, novun suyu azalıb. Soruşmuşuq "nədən bildin?", deyib "səsindən".

– Lalın dilini anası bilər, – deyə Kəklik xala dönüb kürənin yanına getdi.

Bəyim stolun süfrəsini dəyişdi, sonra bizə çay gətirdi. O, heç kəsə baxmırdı. Hətta, Humaya da... Xoşbəxt istəklilər həmişə belədir. Onların gözlərini bir-birinə zilləmələrinə ehtiyacları yoxdur. Etdikləri əhd-peyman onların qəlblərini birləşdirib bir qəlb etmişdir. Onlar gözləri ilə baxmasalar da, bir-birini görürlər.

Bəyimin öz əlləri ilə dəmləyib tökdüyü çay, çiçək kimi silib təmizlədiyi stəkanlar mənə doğma, eyni zamanda, uzaq və həsrətli duyğular təlqin edirdi. Elə bil ki, içərimdə, nə isə, şüşə kimi hey sınıb-tökülür, çilik-çilik olurdu. Bəyim mürəbbə qablarından birini mənim qabağıma çəkərək:

– Eyvaz, – dedi, – mürəbbə götür.

– Sağ ol, Bəyim.

Müsahiblərin arasında söhbət qızışmışdı. Humay, Rəşidə deyirdi:

– Yeni dəyirman barəsində sədrlə də aramızda mübahisə var. Mən bu fikirdəyəm ki, köhnə dəyirmanın balaca qaranlıq otağı bizim düşündüyümüz elektrik dəyirmanı üçün yaramaz. Binanın özünü də təzələmək lazımdır.

– Şübhəsiz! Sədr buna niyə etiraz edir ki? – deyə Rəşid soruşdu.

Qədir, qırmızı ətli ovurdlarını şişirdərək nə isə fikirləşdi. Sonra gözlərini qıyıb başını yana əydi:

– Axı, dəyirman gəlin-zad deyil ki, bəzək-düzək vuraq. Maşınları yaxşı işlədi, bəsdir. Bir də, filan qədər xərc töküb, təzə bina tikmək nəyə lazımdır?

– Məsələ bəzək-düzəkdə deyil. On il bundan qabağa qədər biz, bax, onun içində olurduq. – Rəşid həyətin sağ tərəfindəki balaca kərpic

binanı göstərdi. Ancaq güzəranımız yaxşılaşandan sonra baxdıq ki, daha ora bizə əl vermir. Təzə aldığımız çarpayıları qoymağa yer tapmırıq. Ona görə də, bu evi tikdik.

– Doğrudur, – deyə Humay hərarətlə təsdiq etdi. – Hətta, mən deyirəm ki, dəyirmanın əsas binasından başqa, dən üyütməyə gələnlər üçün də bir-iki otaq tikək. Balaca bir qiraətxana düzəldək. Bəs necə?.. İşi görmə, gördün əsaslı gör! Yarımçıqdan mətləb çıxmaz.

– Bəs, dəyirmanın köhnə binası nə olsun? – deyə Qədir ondan soruşdu.

– Nə olacaq? Uçurdub daşından istifadə edərik. Yerində də Eyvaz gözəl bir bağça salar.

Qədir dedi:

– Əşi, sən ölməyəsən, onda Musa bizi topa tutar!

Rəşid gülümsəyərək:

– Mən sizin fikrinizə tamamilə şərikəm, – deyə Humaya müraciət etdi.

Sonra o, Qədirə tərəf döndü:

– İstəsəniz, yeni dəyirman binası üçün sizə yaxşı bir layihə düzəldərəm.

– Daha nə deyirsiniz? – Humay sədrə baxdı.

Qədir ağ dəsmalla tərini silərək:

– Görürəm ki, sən Musa kişiyə qənim kəsilmisən, – deyə Humayla zarafat etdi. – Qoyun bir heyətlə məsləhətləşim, görüm nə deyirlər?

– Heyət təsdiq edəcək.

– Təsdiq eləsə, mənim də bir sözüm yoxdur.

Sonra o, məzəli bir ifadə ilə boynunun ardını qaşıyaraq əlavə etdi:

– Ancaq dəyirmanın binası sökülәndə, gərək mən alapaça ürgəni minib kənddən qaçam.

Hamımız gülüşdük. Gəlib stəkanları yığışdıran Bəyim:

– Qədir dayı, bax, atama sataşma ha! – deyə onu hədələdi.

– Canım üçün, Bəyim, Bədirxandan o qədər qorxmuram, nə qədər ki, atandan qorxuram.

Humay etiraz etdi:

– Bədirxan xala çox mehriban arvaddır.

– Yaman! – Qədir başını buladı. – Qoy pambığın suyu başlasın. Gör necə mehriban olur!..

Bəyim qab-qacaq düzərək, anasının çəkdiyi plovu gətirib stolun üstünə qoydu. Qardaşı və Qədir nə qədər təklif etdilərsə də, özü gəlib bizimlə oturmadı. Kəndimizin köhnə adətlərindən bir çoxu hələ öz hökmündə idi. Qadınlar, xüsusən ərlik qızlar kişi məclisində oturub, çörək yeməzdilər ki, "ayıbdır".

Kəklik xala gözəl yeməklər bişirməsi ilə məşhur idi. Toylarda asılan qazanlara gərək o, heç olmazsa, bir nəzər salıb, göstəriş verə idi.

Biz çörək yediyimiz zaman Musa dayı eyvana çıxıb ədəblə, lakin quru və sərt bir ifadə ilə:

– Hamınız xoş gəlmisiniz, – dedi.

– Keç, əyləş, əşi, – Qədir qaşıqla dolu düyünü ağzına apararaq, böyründəki kürsünü göstərdi.

– Siz yeyin, mən çay içəcəyəm...

– Deyəsən, ürəyinin yanğısı hələ sönməyib.

Musa dayı Qədirin nəyə işarə vurduğunu hiss edərək, cavab verməyib, dilxor halda otağa keçdi. Qədir çiyinlərini qısaraq xısın-xısın güldü. Rəşid də gülümsədi.

Sonra mən Bəyimin iri nazik stəkana necə səliqə ilə çay töküb içəri apardığını gördüm.

Çörəkdən sonra biz soyuq Qarabağ dovğası içib, ordan-burdan söhbət edirdik. Bəyim söhbətdə iştirak etmir, üzərinə iydə budağı əyilmiş məhəccərə söykənib, həyətə baxırdı. Görəsən, nə düşünürdü?

Köklüyünə baxmayaraq, məclisdə hamımızdan az yeyən Qədir dəsmalla üzünün tərini silib Rəşidə deyirdi:

– Bu Humayı Allah bizə yaxşı yetirib. Gərək toku möhkəm işə salaq. O boyda dəmirçixanamız var, dəhnəmiz var.

– Bütün bunları elektrikləşdirmək üçün siz, hər şeydən əvvəl, mühüm bir tədbir görməlisiniz, – Rəşid əvvəlcə Qədirə, sonra da Humaya baxdı.

Qədir soruşdu:

– Nə tədbir?

– "SES"-i gücləndirmək lazımdır.

– Doğrudur, – deyə mühəndis təsdiq etdi. – İndiki "SES"-in elə böyük işlərə gücü çatmaz.

Qədir gözlərini qıyaraq fikirləşdi. Sonra qəti dedi:

– Böyüdərik. Su var, pul var, mühəndis də var. Daha nə lazımdır? Sərin düşdü, durun enək bağçaya. Musanın ağacları bu il yaman bar gətirib. Eyvaz, aşağı bağlardakı heyvalara qarışqa daraşıb, görmüsənmi?

– Sabah hamısını əhəngləyəcəyik.

Biz bağçaya endiyimiz zaman Humay ayaq saxlayıb, Bəyimə nə isə dedi. Qız lap güclə sezilən bir təbəssümlə altdan-yuxarı ona baxaraq dinmədi.

... Rəşidin verdiyi o kiçik qonaqlıqdan xeyli keçmişdi. Tökülmüş çiçəklərin yerində yaşıl meyvələr görünürdü. Zəmilər biçildi, tayalar vurulurdu. Ot çalımı çoxdan qurtarmışdı. Yük maşınları tez-tez dəyirman dərəsinə enərək, daş, qum, ağac boşaldıb qayıdırdı. Yetmiş ildən bəri ara vermədən səslənən su dəyirmanı ömrünün son günlərini yaşayırdı. Daim sükut içində olan Musa dayının demisi ağzından düşmürdü. Bu az müddətdə qonağın şöhrəti bütün rayona yayılmışdı. Onu tez-tez qonşu kəndlərə aparırdılar. Məsləhət alırdılar. İşi nə cür qurmuşdusa, MTS-in maşınları saat kimi işləyirdi.

Bir axşam çörək yeyəndən sonra o:

– Eyvaz, – dedi, – istəyirəm Musa dayının yanına elçi göndərəm, ağlın nə kəsir?

Mən fikirləşdim: “Görəsən, bu dəyirman əhvalatından sonra Musa dayı bizim qonağın elçisinə nə cavab verər?” Və dedim:

– Əlbəttə, göndərmək lazımdır.

– Ancaq bilmirəm kimi göndərək?

Mən heç bir kəsi xatırlaya bilmirdim. Qəribə idi, elə bil ki, kəndimizdəki adamların adları tamam yadımdan çıxmışdı.

– Bədirxan xalanı göndərsək, necə olar?

– Hə... gör heç ağlıma gəlirmi?.. Yaxşı tapmısınız. Musa dayı ilə bacarsa, ancaq anam bacarar. Su üstündə tez-tez dalaşsalar da, bir-birinin xətirlərini istəyirlər. Ay ana, bir bura gəl görək...

Humay həyəcanla ayağa qalxdı. Anam o biri evin qapısını açıb içəri girdi. Mən ona dedim:

– Elçi getmək lazımdır.

Arvad təəccüblə üzümə baxdı:

– Kimin üçün?

– Humay üçün.

– Humay kimin kürəkəni olmaq istəyir?

– Musa dayının?

– Hansı Musa dayının?

– Dəyirmançı...

– Nə olar, Bəyim qızların padşahıdır.

Sonra anam Humaydan soruşdu:
– Bircə de görüm, atan nə iş görür?
– Müəllimdir.
– Hə... Bəs, anan?
– Anam yoxdur, ögey anam var.
– Qardaş-bacın necə, var?
– Xeyr, təkəm.
– Ay arvad, – dedim, – belə anket doldurmaqda fikrin nədir?
– Nə olacaq, kimin üçün elçi getdiyimizi gərək bilək, ya yox?
– Doğrudur, doğrudur, – deyə Humay cəld təsdiq etdi.
– Yaxşı, ana, indi nə vaxt gedirsən?
– Nə vaxt məsləhətdir?
– Lap elə sabah!
– Nə olar...
– Ancaq bir az ehtiyatlı danış. Musa dayının xasiyyətini bilirsən.
– Mənə tərslik eləyə bilməz. Qızın "hə"sini almısınız?
– Eh... Göydə!.. Bəs onsuz olar? – deyə mən təəccüblü bir ruh yüksəkliyi ilə cavab verdim. Lakin, bununla belə, otağın havası mənə azlıq edirdi. Humayla anamı evdə qoyub, bayıra çıxdım.

Gecə isə, həmişəki tək sakit və əzəmətli idi. On dörd gecəlik Ay düz Bəyimgilin evlərinin dalındakı qoşa çinarın üstündə dayanmışdı. Yarpaqları Ay işığında gümüş kimi parıldayan iydə ağacının ardındakı eyvanda heç kəs yox idi. "Bir dünyanın işinə bax, Bəyim! Səni başqasına istəmək üçün mən öz anamı elçi göndərirəm... Nə olar ki?.. Yəqin mənim yerimə sən də belə edərdin. Adam düşmən gülləsinin yarasına dözür. Halbuki sən mənim bu dünyada ən çox istədiyim, sevdiyim bir insansan!.."

Səhər bütün günü Bəyimi görmədim. Yalan nə deyim, qəsdən görməməyə çalışdım. Nə qədər də olsa, ağırdır. Görməyəndə yenə birtəhər dözmək olur. Bu bağdan girib, o birindən çıxdım. İki dəfə Şahların mənimlə danışmaq istədiyini hiss edərək, cəld uzaqlaşdım. Nə deyəcəyini gözlərindən bilirdim. Dünyada bu sual-cavabdan da pis şey varmı?!

Axşamçağı camaat işdən qayıdandan sonra anamı geyindirib-kecindirib qonşumuz Tükəz xala ilə birlikdə Musa dayının evinə göndərdik.

Humay yaman həyəcan keçirir, bir yerdə dayana bilmirdi.

– Siz nahaq yerə narahat olursunuz, – mən ona təsəlli verirdim. – Qızın rəyi olandan sonra kim nə deyə bilər?

– Musa dayı məni görəndə üzünü o yana çevirir. Heç ağlım kəsmir ki, razılıq versin. Ancaq, yenə də, adam göndərmək lazım idi, – deyə o, gözlərində ciddi və ağıllı bir ifadə olduğu halda otaqda gəzinirdi.

– Çalışarıq razı olsun, olmasa, ayrı bir yol taparıq. – Humay mənim nə demək istədiyimi başa düşərək, eyni ciddi ifadə ilə:

– Yox, – dedi, – razılıq verməsə, çətin olacaq.

– Niyə axı?

– Qız atasının razılığı olmadan ərə getmək istəmir. Yaxşı da eləyir.

– Yaxşı eləyir?

– Əlbəttə.

– Mən sizi anlaya bilmirəm. Tutaq ki, Musa dayı heç razılıq vermədi, qız da onun sözündən çıxmadı. Bəs, onda nə olsun?

– Çalışıb Musa dayını razı salmaq lazımdır. Mən bu əqidədəyəm ki, evlənən üçün ata-ananın rəyi əsas şərtlərdən biridir. Tutaq ki, Musa dayı, onun ata yadigarını dağıdıb, ayrı bir şəklə saldığım üçün mənə nifrət edir. Biz, yəni, Bəyimlə mən, bunu bir gerilik əlaməti hesab edərək, nəzərə almaya bilərik. Çünki cəmiyyətin xeyri dəyirmanın indi su ilə deyil, elektriklə işləməsindədir. Demək, məntiq bu konfliktin bizim xeyrimizə həll olunmasını tələb edir, elə deyilmi?

– Elədir...

– Ancaq, axı, Bəyimi böyüdüb boya-başa çatdıran Musa dayıdır. Axı, onun ömrünün ən yaxşı çağları Bəyimə, bir də camaat üçün işləyən o su dəyirmanına sərf olunub... İndi bunları onun əlindən alıb, özünü də rədd etmək böyük ədalətsizlik olmazdımı?

Bu zaman anam hirsli-hirsli içəri girdi.

– Nə oldu, ay arvad? – deyə mən həyəcanla soruşdum.

O mənə cavab verməyərək Humaya dedi:

– Lap günü sabah qızın qolundan tutub gətirərsən, eşitdinmi? Qoy ondan sonra dəyirmançı Musa ha atılıb-düşsün.

– Bir başa sal, görək nə dedi?

– Deyir, qızı o dəyirmanın boğazına atıb öldürərəm, amma ona vermərəm. Dedim, heç özündən çıxıb-eləmə. Bu, keçmiş zəmanə deyil... Ondan adam olmaz, vəssalam. Nə qədər eyham vururuq ki, qızla-oğlan alışıb-verişiblər, başa düşmür. Götür gəl, qoy qalsın yana-yana. Onda ağıllanar.

... Ertəsi gün, dəyirmanın qabaq tərəfində saldığımız alma bağının yanında Humayla Bəyimi dayanıb danışan gördüm. Qızın üzü solğun idi. Gözlərində kədər və təlaş var idi. Mən salam verib keçəndə, nəzərləri bir an üzümdə dayandısa da, fikrinin çox uzaqlarda olduğunu hiss etdim. Yəqin ki, bu anda mən onun üçün tamamilə yad bir adam idim.

Nahardan sonra Humay pencəyini geyərək:

– Eyvaz, – dedi, – xahiş edirəm mənimlə bir yerə gedəsən.

– Haraya?

– Yolda deyərəm.

Həyətdən çıxıb sükut içində bir qədər gedəndən sonra Humay dilləndi:

– İstəyirəm Musa dayı ilə şəxsən özümüz danışaq.

Doğrusunu deyim ki, Humayın sözü məni ürkütdü. Çünki evlənmək istəyən oğlanın qız barəsində gedib onun atası ilə danışması (xüsusən atası ilə) indiyə qədər bizim kənddə görünməmiş bir iş idi. Qorxurdum ki, Musa dayı Humaya ağır bir söz deyə, mən də pis vəziyyətdə qalam.

– Bəlkə Qədirə deyək, bir-iki ağsaqqal da götürüb...

O, sözümü kəsərək:

– Yox, – dedi, – özüm danışacağam. Əgər, sən getmək istəmirsənsə...

– Nə üçün? Gedək!..

Mən vaxtilə fövqəladə qəhrəmanlıqlar haqqında düşünərdim. İndi öz dostumun işi üçün Musa dayının yanına getmək nədir ki?..

Su dəyirmanı hələ işləyirdi. Onun qabaq tərəfindəki açıqlıqda isə, bizim camaatın dili ilə desək, təzə "tok dəyirmanı" tikilirdi. Binanın layihəsini Rəşid vermişdi. O hərdən gəlib, işin gedişinə baş çəkirdi. Srağagün də gəlmişdi. Gülə-gülə bizə deyirdi ki, "maşını düz sürdüm dəyirmana. Yaxşı ki, atam orada deyildi..."

Usta Qara ilə şagirdləri hörgünü xeyli qaldırmışdılar.

Musa dayı, adəti üzrə, novun bəri tərəfindəki böyürtkən kollarının kölgəsində oturub demisini tüstülədirdi. Bizi görəndə üzünü o yana çevirdi. Bir istədim deyəm ki, Humay, gəl sən bu daşı ətəyindən tök, ancaq demədim.

Humay, köhnə dost kimi, tamamilə sərbəstcə:

– Salam, Musa dayı, – dedi və kişinin gözlərindəki qəzəbə əhəmiyyət verməyərək, otların üstünə əyləşib, mənim də oturmağıma işarə etdi.

Əyləşdim. Sonra Humay heç tərəddüd etmədən:

– Musa dayı, – dedi, – mən sizinlə danışmağa gəlmişəm.

Musa dayı bir neçə saniyəlik sükutdan sonra bizə tərəf baxmadan soruşdu:

– Nə barədə?

– Mən sizinlə Bəyim barədə danışmaq istəyirəm...

Musa dayı iti və sərt bir hərəkətlə üzünü bizə tərəf çevirib, heyrətlə əvvəlcə mənə, sonra Humaya, sonra yenə mənə baxdı. Sanki kişi Yer üzündə görünməmiş qəribə bir şey eşitmişdi. Birdən barıt kimi açılaraq, dəyirmanın şırıltısını batıran qəzəbli səslə mənim üstümə qışqırdı:

– Ə , Bədirxan oğlu, bunun haradan çıxdığını bilmirəm, bəs, sən heç utanıb-qızarmırsan?

Humay pərt, lakin sakit halda dedi:

– Niyə təhqir eləyirsiniz, biz ki, bir pis iş eləməmişik?

Musa dayının dərindən baxan gözlərindən od tökülürdü:

– Üzünüzdə həya olsa, adamı adam yerinə sayarsınız! Mənim qızım sizin üçün su dəyirmanı deyil ki, iclasa qoyasınız. Adam göndərdin, cavabını da aldın.

Humay təslim olmaq istəmirdi:

– Bəyim sizin fikrinizlə razı deyil.

– Mənim qızımın adını tutma! – Musa dayı göy kimi guruldadı. – Eşitdinmi? Mən uşaq böyütməmişəm ki, hər dərədən keçən onun adını tutsun.

– Mən dərədən keçən deyiləm, Musa dayı!

Kişi yanıb-yaxılaraq, bu dəfə cavab verməyə söz tapmadı. Birdən ayağa qalxıb, əsəbi addımlarla uzaqlaşdı. Humay onun ardınca baxa-baxa qaldı.

– Görəsən, dəyirmana görə belə edir, yoxsa, ümumiyyətlə, məndən zəhləsi gedir? – deyə öz-özü ilə danışırmış kimi soruşdu.

– Əlbəttə, Musa dayını ən çox hirsləndirən dəyirman məsələsidir. Ancaq, ola bilsin ki, sənin buralı olmamağının da bir az təsiri var. Eşitdiyimə görə, keçmişdə bizim camaat "gəlmə" adama qız verməzmiş.

– Niyə?

– Kim bilir...

Kəndin girəcəyində Qədirə rast gəldik.

– Haraya belə? – deyə gözlərini qıyaraq soruşdu.

Humay, Musa dayı ilə olan söhbətimizi nöqtəsinə qədər ona danışdı.

Qədir əllərini bir-birinə vuraraq bərkdən güldü:

– Əşi, – dedi, – bir tərəfdən kişinin ata-baba yadigarını uçurub dağıdırsan, o biri tərəfdən də qızına elçi göndərirsən. Belə şey olar?

– Yaxşı, bəs indi neyləyək? – deyə Humay soruşdu.

Qədir iri ətli əllərini kəmərinə keçirib, ovurdlarını şişirdərək fikirləşdi. Sonra dedi:

– Qızla maşına əyləşib "Zaqs"a getməkdən başqa ayrı çarəsi yoxdur. "Pobeda" sizin qulluğunuzda, ancaq elə tərpənin ki, Musa kişi xəbər tutmasın. Yoxsa, mənimlə ömürlük qanlı-bıçaq olar ki, maşın verib, qızımı qaçırtmısan. Yaxşı olar ki, Kəkliklə, Rəşidlə məsləhətləşəsiniz.

– Onlarla kim danışsın?

– Mən danışaram, – deyə Qədir cavab verdi.

... Artıq hər şey hazır idi. Kəklik xala ilə Rəşid razılıq vermişdilər. Sabah Humay ilə Bəyim kəbin kəsdirməyə gedəcəkdilər.

Humay maşın-traktor stansiyasının yaxınlığında özü üçün ev tutdu. Evin sahibi Hüseynəli dayı dünyagörmüş, ürəyiaçıq bir kişi idi. Humayın mənzilini lap gəlin otağı kimi bəzətdirdi. Demək, o, bizdə axırıncı dəfə qalacaqdı. Ayrılıq həmişə kədərlidir.

Humay, adəti üzrə, başını aşağı salaraq, otaqda var-gəl edirdi, nə isə fikirləşirdi. Birdən mənim qarşımda dayanaraq:

– Eyvaz, – dedi, – neçə gündür mən səni birtəhər görürəm.

– Nə cür?

– Elə bil, nə isə, bir sıxıntı keçirirsən.

– Ola bilər.

Sonra sakit və ciddi ifadə ilə əlavə etdim:

– Bilirsənmi, ağırdır, birdən-birə unutmaq olmur.

– Nəyi?

– Sevdiyin, istədiyin qızı.

– Sən kimi sevirdin?

– Bəyimi.

Sükut.

O, başını aşağı salaraq ahəstə səslə cavab verdi:

– Mən bunu hiss edirdim. Ancaq niyə əvvəldən demirdin?

– Nə mənası vardı ki?..

Humay dinmədi.

Bəlkə də, mən bunu açmamalı idim. Lakin o mənim dostum, qonağım idi. Mən belə böyük bir sirri ondan gizli saxlaya bilməzdim.

– Səhər saat neçədə şəhərə gedəcəksiniz? – deyə mən uzun və gərgin sükutu pozaraq soruşdum.

O, başını qaldıraraq dərin, ciddi bir nəzərlə üzümə baxdı:

– Saat yeddidə!

... Səhər şəfəq sökülən zaman Qədirin "Pobeda"sı qoşa çinarın altında dayandı. Mən, anamla Humayı maşında qoyaraq, düşüb Musa dayının darvazasını üç dəfə yavaşca taqqıldatdım. (Musa dayının dəyirmanda qaldığını dürüst öyrənmişdik.) İki dəqiqə çəkmədi ki, Kəklik xala ilə Bəyim gəldilər. Qızın üzündəki solğunluq və kədər məni heyrətə saldı. Görünür, ən xoşbəxt dəqiqələrin də özünə görə dərdi olurmuş!

Kəklik xala da həm kefsiz, həm də həyəcanlı idi. Humay qızı qarşılamaq üçün maşından çıxmaq istədi.

– Lazım deyil. Sən otur, – deyə mane oldum.

Sonra Bəyimin əlindəki çamadanı alıb, maşına qoydum. Anam qıza dedi:

– Gəl, bala, gəl otur.

Bəyim sanki bu sözdən diksinərək, başını qaldırıb, gözlərini həyəcan içində ona zilləmiş anasına baxdı. Birdən hər ikisi qucaqlaşdı. Qız üzünü anasının geniş, ətli köksünə sıxaraq ağlayırdı. Həmişə üzügülər olan Kəklik xala da uşaq kimi ağlayırdı. Mən üzümü yana çevirdim.

Anam dedi:

– Tay yaxşı, Kəklik, ağladın, ürəyini boşaltdın, qoy qız otursun.

Kəklik xala yaylığının ucu ilə gözlərini silib, qızının üzündən öpdü:

– Get, bala, xoşbəxt olasan!

Bəyim, dinməz-söyləməz, kimsənin üzünə baxmadan, gəlib maşının dal tərəfində, anamın yanında oturdu.

– Sür! – deyə Humay həyəcanlı səslə şoferə dedi.

Maşın toz qopara-qopara uzaqlaşdı. Gözlərinin yaşı hələ də qurumamış Kəklik xala ilə mən dayanıb onun ardınca baxırdıq. Maşın isə, getdikcə uzaqlaşırdı. Nəhayət, o, səhər günəşi ilə işıqlanmış mavi üfüqdə gözdən itdi...

Mən, biçilmiş buğda zəmilərinin arası ilə yavaş-yavaş irəliləyirdim. Dərz ilə dolu bir maşın gəlib yanımdan keçdi. Maşının üstündə yabasını dərzə sancmış Şahlar məni görüb gülümsədi:

– Sabahın xeyir, aqronom! – qışqırdı.

Onun gözəl üzü sevinc və xoşbəxtliklə parlayırdı.

Mənim yolumla çarpaz kəsişən cığırla, əyinlərində qırmızı, sarı, yaşıl paltar olan bir dəstə qız-gəlin keçib gedirdi. Onlar bir-biri ilə zara-

fatlaşır, bərkdən gülüşürdülər. Məni görərkən dəmirçi Muradxan dayının qızı gözəl Əsmər yoldaşının qulağına nə isə pıçıldadı. Sonra hər ikisi bir an çevrilib mənə tərəf baxaraq, utancaq, mehriban və bakirə bir ifadə ilə gülümsədi. Bir dəfə Bəyim gülə-gülə mənə demişdi ki, "Eyvaz, Əsmər səndən yaman çox danışır".

Dünyada Bəyimin iti və həssas nəzərlərindən nə yayına bilərdi?!

Uzaqdan çaparaq bir atlı gəlirdi. Bu, Qədir idi. O, bir əli ilə cilovdan, digər əli ilə furajkasından yapışaraq, atın üstündə quş kimi oturmuşdu.

Mənə çatanda cilovu çəkdi. Alapaça ürgə iki dəfə şahə qalxıb cilovu gəmirə-gəmirə dayandı.

– Nə oldu? – deyə Qədir gözlərini qıyaraq soruşdu.

– Getdilər!

Sədr daha heç bir söz deməyərək, bir yerdə aram tapmayan ürgənin cilovunu buraxdı.

Zəminin kənarındakı yaşıl otluqdan çil-çil turac pırıltı ilə havaya qalxıb, ayrı bir yerə düşdü.

Mən yoluma davam edərək, dəyirman aşırımını endim. Heç nədən xəbəri olmayan Musa dayı böyürtkən kollarının kölgəsində oturub, üzü o tərəfə, demi çəkirdi.

Usta Qara ilə şagirdləri təzə dəyirmanın divarlarını hörürdülər. Mən onların yanından keçib, bağa getdim. Bu gün alaq otlarını təmizləyəcəkdik...

*1954*

## YUN ŞAL

“ZİL” markalı maşınımız sonsuz kimi görünən geniş çölü keçərək, nəhayət, axşam toran qovuşan vaxt çox da hündür olmayan dikdirin üzərində yerləşmiş üç-dörd balaca, kərpic evdən ibarət fermaya çatdı.

Mən sürücü Mikolaya:

– Düş gör, – dedim, – Südabə adlı qız bu evlərin hansında yaşayır?

– Evdə olsa nə deyim?

Mən bir qədər fikirləşəndən sonra:

– De ki, qohumlarınızdan biri gəlib, sizi görmək istəyir...

İri gövdəli sürücü Mikola maşından düşərək, palçığa bata-bata altdan-yuxarı yüyürdü və yoxuşun başına çatıb, sükut içində divarları ağaran evlərin arasında görünməz oldu, mən papiros çıxarıb yandırdım. Çox çəkmədi ki, dikdirin üstündə sürücü ilə yanaşı, ucaboy bir qadın da göründü. O, əlini qaranlıq üfüqə doğru uzadaraq, sürücüyə, nə isə dedi. Yavaş yeriməyə hövsələsi çatmayan Mikola qayıdıb üstdən-aşağı yuvarlandı, yoxuşun yarısında sürüşüb şappıltı ilə yerə dəyərək:

– “Çort”, – deyə səsləndi.

Dərhal ayağa qalxaraq maşına çatanda səbrsizliklə soruşdum:

– Nə oldu?

– Deyir, evdə yoxdur, o qaralan təpənin dalında, ağıllardadır.

– Maşını döndər oraya.

Evlərlə ağılların arası daha bərk palçıq olduğundan, maşın bir kilometrdən də az məsafəni xeyli çətinliklə gəlib çıxdı.

İri qoyun itləri qəzəblə hürüşərək, tökülüb maşını dövrəyə aldılar.

– Ay it! Ay it... – kərpic hasarın ardından səslər eşidildi.

Sonra iki çoban yüyürüb gələrək, itləri qovub bizə yaxınlaşdı.

– Südabə xanım burada işləyir? – deyə Mikola başını kabinədən çıxarıb soruşdu.

– Bəli, bizim zootexnikimizdir, – başında saçaqlı dəri papaq, çiynində yapıncı olan çoban cavab verdi.

– Deyin şəhərdən qohumları gəlib, onu görmək istəyir.

Yapıncılı çoban, yaşca özündən kiçik yoldaşına dönərək:

– Yüyür Südabə bajını çağır, – dedi.

Sonra mənə müraciətlə:

– Düşün, içəri buyurun.

– Sağ olun, – dedim, – yol üstəyik.

Ağıldan boğunuq tüstü qalxır və yuyulmamış yun qoxusu gəlirdi.
Südabə gənc çobanla birlikdə tələsik addımlarla maşına yaxınlaşdı.
– Məni soruşan kimdir?
Maşının qapısını açaraq:
– Mənəm, – dedim.
O, bir neçə saniyə heç nə demədi.
Sonra:
– Sən hara, bura hara? – deyə təəccüblə pıçıldadı.
Mən maşından düşən işıqda onun ağ, qızılgül ləçəyitək zərif üzünə baxaraq:
– Gəl içəri, bayır soyuqdur, – dedim.
Və o, tamam qeyri-şüuri bir hərəkətlə qalxıb yanımda oturanda qapını örtdüm.
Yapıncılı çoban, maraqla bizə baxan gənc yoldaşına him elədi və onlar dönüb ağıla getdilər.
– Mən də qoyunlara baxmaq istəyirəm, – deyərək Mikola, yəqin ki, bizi tək qoymaq lazım gəldiyini hiss edib kabinədən çıxdı.
– Get, – dedim. – Ancaq mənim kim olduğum barədə onlara heç nə demə.
Biz tək qaldıq.
– Niyə bu vaxtacan evə getməmisən? – deyə soruşdum...
– Qoyunlarımız doğmağa başlayıblar...
– Sənin üçün burada çox çətin keçmir ki?
– Əvvəllər çətin keçirdi... İndi öyrəşmişəm.
– Evinizdən məktub alırsanmı?
– Alıram, tez-tez alıram.
– Nə üçün mənim məktubuma cavab yazmadın?
Üzümə ani və məyus bir nəzər salaraq dinmədi.
– Niyə susursan, Südabə?
– Axı, nə mənası var idi ki?
Doğrudan da, nə mənası var idi? Cavab yazsaydı belə, bu məktublaşma nə qədər davam edə bilərdi? Mən ki, heç bir zaman evlənməyəcəyimi ona mərd-mərdanə demişdim. Ona görə yox ki, Südabə pis qız idi, yox! O, Bakıda beş qızın biri idi. Ona görə ki, gələcək üçün mənim bir sıra elmi planlarım var idi və o əqidədəydim ki, bunların həyata keçirilməsi üçün, hələlik, subay qalmağım lazımdır. Lakin, bununla belə, onun "nə mənası var idi ki..." deməsi ürəyimi ağrıtdı.

– Sən inciməkdə haqlısan, – dedim. – Mən sənin şəhərdə qalmağına kömək eləmədim.
– Mən ki, bu barədə sənə heç bir söz deməmişdim.
– Yadındadırmı, son kursda oxuduğun zaman bir dəfə işarə vurmuşdun.
– İşarəni başa düşməmək də olardı, – o, yenə də üzümə ani bir nəzər salaraq, zarafatla cavab verdi.
– Yox, mən başa düşmüşdüm, mən anlayırdım, ancaq... bilirsənmi, o zaman mən ağır bir çətinlik qarşısında qalmışdım. Mən sizin ikinizdən birinizi – ya səni, ya da bacımı şəhərdə işə düzəldə bilərdim. Anam, qohumlar... (Südabə ilə bacım institutu bir yerdə qurtarmışdılar.)
O mənim sözümü kəsib, bacımı soruşdu:
– Firəngiz necədir?
– İşləyir. Bu yaxınlarda toyları olacaq.
Südabə mehribanlıqla gülümsədi:
– Bilirəm. Özü yazmışdı.
– Məgər, siz məktublaşırsınız?
Qız başı ilə təsdiq etdi.
– Bəs, nə üçün Firəngiz heç mənə deməyib?
– Mən xahiş etmişdim ki, deməsin.
– Niyə?
– ...
Mən əsl məqamın çatdığını güman edərək:
– Südabə, – deyə təntənə ilə bildirdim, – sizin nazirlikdən xahiş etmişəm ki, sənin şəhərə dəyişilib, elmi sahədə işləməyinə icazə versinlər. Axı, sən institutu əla qiymətlə bitirmisən.
– Təşəkkür edirəm, ancaq nahaq zəhmət çəkmisən.
– Bəlkə, mənə acığın tutduğu üçün belə deyirsən?
O, kədərlə başını buladı. İkimiz də susub dinmirdik.
O, gözlərini qaldırıb mənə uzun bir nəzər saldı. Sanki üzümdə hər bir cizgini diqqətlə oxumaq istəyirdi.
– Şəhərə bir sözün-zadın yoxdur ki?
– Yoxdur, – deyə eyni mehribanlıqla cavab verdi.
Sonra birdən tərəddüdlə əlavə etdi:
– Anam üçün bir şal toxumuşam. Dedim, bəlkə...
– Ver aparım.
– Əziyyət olmaz ki?

– Nə əziyyət olacaq, sürücü ilə göndərərəm.

– Burada deyil, evdədir.

– Eybi yoxdur, gedərik, götürərəm.

Siqnalı basdım. Mikola ilə gənc çoban da gəldi və o, bu dəfə mənə əhəmiyyət vermədən təmiz Qarabağ şivəsi ilə:

– Südabə bajı, – deyə sevinclə bildirdi. – Qumral qoyunun bir cüt əkiz balası oldu.

Qız yerindən qalxaraq:

– Bir dəqiqə, – o, məndən üzr istəyib maşından düşdü.

Və gənc çobanla birlikdə qaranlıqda palçığı şappıldada-şappıldada ağıla sarı yüyürdü. İki-üç dəqiqədən sonra qayıdaraq:

– Oy, Cəmil, – dedi, – elə qəşəngdirlər, elə qəşəngdirlər, baxsan, xoşuna gələrlər.

O, mənim adımı əvvəllərdə olduğu kimi, mehriban, doğma, əziz bir ahənglə çəkdi və mən onun zərif üzünə həyat və gözəllik verən gözlərinin dərinliklərində alışan qığılcımları yenidən gördüm. Lakin o, mənim baxışlarımı hiss edərək kirpiklərini endirib susdu. Yalnız maşın fermaya çatanda:

– Düş gedək qonağımız ol, – dedi.

– Birdən söz-həkət olar.

– Mən söz-həkətdən qorxmuram!.. Siz bir az dincələrdiniz, mən də anamgilə balaca bir kağız yazardım.

Bu dəfə etiraz etmədim. Maşından düşdük. İndi göz-gözü görməyən bir qaranlıq olduğundan, o, cibindən balaca əl fənəri çıxarıb yandıraraq, yolumuzu işıqlandırdı.

– Sənin fənərin də varmış? – deyə zarafat elədim.

– Burada fənərsiz keçinmək olmaz. Sovxozda balaca bir "HES"imiz var. İndi onu böyüdürük. Ondan sonra işimiz yaxşı olacaq, bizə də işıq verəcəklər.

O sürüşdü, əl atıb qolumdan yapışdı. Mən onun əlinin tanış təmasını hiss edərək, Bakıda, dəniz kənarındakı körpə akasiya ağacları arasında gəzdiyimiz yay axşamlarını xatırladım. O bilirdi ki, biz evlənməyəcəyik. Bununla belə, heç bir zaman mən onu kədərli görməzdim. Yalnız bir dəfə ağlamışdı. Özü də ürəkdən, yana-yana ağlamışdı. Buna səbəb də mən olmuşdum. Mən ona elçi gəldiyini və qızın rədd cavabı verdiyini bacımdan eşitmişdim.

Elçi göndərən yaxşı oğlan idi. Ağıllı, gözəl, elmli! Ona görə də, axşam akasiya ağacları yanında görüşdüyümüz vaxt, söhbəti hərləyib bu məsələnin üzərinə gətirərək:

– Nahaq rədd eləmisən, – deyə ürəkdən təəssüf elədim. – O, çox yaxşı oğlandır.

Qız ilan vurmuş kimi dayandı. Diqqətlə üzümə baxdı. Mən heç bir zaman onun gözlərində belə ifadə görməmişdim. Mənə elə gəldi ki, o bu saat qışqırıb dünyadakı pis sözlərin hamısını üzümə çırpacaq.

Lakin o belə etmədi. Ağaca söykənib ağladı, ağladı... Ürəyi boşalandan sonra bu barədə bir kəlmə də söz demədən, yenə də sakit halda qoluma girdi.

... Biz yoxuşu qalxaraq, Südabənin neft çırağı ilə işıqlanmış balaca və isti otağına daxil olduq. Qapıya yaxın yerdə kiçik dəmir soba yanırdı. Evin ortasında, üzərinə təmiz ağ süfrə salınmış miz, üç-dörd kürsü qoyulmuşdu. Köhnə arakəsmənin arxasında qızın çarpayısı yerləşmişdi. Pəncərənin qabağındakı balaca yazı stolunun üstündə batareya ilə işləyən bir "Rekord" qəbuledicisi, sellüloiddən qayrılmış şəffaf mürəkkəbqabı, "Azərbaycan kənd təsərrüfatı" jurnalının bir neçə nömrəsi və açıq kitab vardı.

Südabə mənim paltomu və papağımı alıb sadə taxta asqıya keçirdi.

– Əvvəlcə çay içmək istəyirsiniz, yoxsa...

– Yaman acıq, – dedim.

Sonra sobanın üstündəki balaca qalaylı qazana işarə ilə:

– Qorxuram, bundan bir şey olmasın, – deyə zarafat elədim.

İçəridəki ucaboylu qadın əyilib Südabənin qulağına nə isə pıçıldadı və qız gülümsəyərək:

– Xala sizin üçün plov bişirmək istəyir, – dedi.

– Çox sağ olun!

– Bu qonağın düyü xörəyindən xoşu gəlmir, – deyə o, stolun üstünə çəngəl-bıçaq qoyaraq qadına cavab verdi.

Sonra təmiz boşqablara çəkilmiş qovurmanı gətirib bizim qabağımıza düzdükdə:

– Bəs özünə? – deyə soruşdum.

– Özüm də oturacağam. Bu gün nahara gəlməyə macalım olmayıb.

Lakin o, bizim kimi həvəslə yemirdi. Ağzını yavaş-yavaş tərpədərək mənim necə iştaha ilə yediyimə tamaşa edirdi. Keçmişlərdə, təsadüfən bir yerdə nahar elədiyimiz zamanlarda olduğu kimi, xəfif, fərəhli bir təbəssümlə tamaşa edirdi.

Çörəkdən sonra Südabə bizə çay töküb verərək, özü evlərinə məktub yazmağa başladı.

Mən onun çoxdan manikürsüz, dibdən kəsilmiş təmiz dırnaqlarına baxırdım. Mən onun soyuqdan azca çatlamış əllərində indi sərt, yabanı bir gözəllik duyurdum. Mən ixtiyarsız olaraq, başımı qaldırıb onun üzünə baxanda isə diksindim... sanki bu mənim indiyə qədər görüb tanımadığım tamam ayrı, yad və uzaq bir sima idi. Lakin, bununla belə, çırağın sarı ziyası ilə işıqlanmış həmin bu yad simada mənim dünyada birinci dəfə görüb hiss etdiyim heyrətli bir gözəllik var idi. O, tünd-şabalıdı saçlarını yumrulayıb sancaqlamışdı. Aşağı enmiş kirpikləri gözlərinin altını kölgələndirmişdi. Bu iri kölgədəki əsrarəngizlik, düz burnu, uzun və şəffaf boğazının sol tərəfindəki qara xal onun ağ, qızılgül ləçəyitək zərif üzünün gözəlliyinə qeyri-adi bir ahəng verirdi. Mən əvvəllərdə də bunu hiss edirdim. Lakin indi... qaranlıq düzün ortasındakı bu balaca otaqda, neft çırağının sarı ziyası içində bu gözəlliyin ahəngi mənim üçün tamamilə yeni idi. Yeni bir nəğmə idi... Birdən bayırda, mənim keçib gəldiyim geniş düzənlikdə qalxan küləyin soyuq uğultusu bu sözsüz nəğməmi batırdı. Ürəyimdə ağır, çox ağır bir pərişanlıq hiss edərək, bütün həyat tərəfindən unudulmuş kimi qəribsədim.

O, məktubu bitirərək, qalxıb arakəsmənin dalından təzə toxunmuş bir yun şal gətirdi, zərfi də onun arasına qoyaraq, səliqə ilə qatlayıb balaca çit parçasına bağladı.

Artıq paltolarımızı geymişdik. O, şalı mənə uzatdıqda birdən dayandı. Bir an bayırdakı küləyin uğultusunu dinlədi. Sonra:

– Bəlkə qalıb səhər gedəsiniz, – dedi, – biz xala ilə o biri otaqda yatarıq.

Bu zaman əlində odun parçaları içəri girən ucaboylu qadın da:

– Qalsanız yaxşıdır, – deyə təsdiq etdi. – Yaman qarlayır, bu saat yolu-rizi tutacaq. Allah eləməmiş, birdən düzdə azarsınız.

Mən:

– Heç nə olmaz, – deyə şalı qızdan alıb, balaca əl çamadanına qoydum.

Və qadının təsvir etdiyi təhlükə ehtimalı məndə anlaşılmaz bir ruh yüksəkliyi doğurdu. Südabə daha təkid etmədi və mənim sözümə baxmayaraq, bizi ötürmək üçün yoxuşun ayağına, maşının dayandığı yerə qədər gəldi. Qaranlıq çöldə külək uğuldayır, seyrək qar səpələyirdi. Mikola yerinə keçəndən sonra mən:

– Südabə, – dedim, – nə üçün inad edirsən, nə üçün şəhərə gəlmək istəmirsən?

O mənim əllərimdən tutaraq keçmişlərdə, fərəhli axşam görüşlərindən qayıdıb ayrıldığımız zamanlarda olduğu kimi yaxın, doğma, əziz bir ahənglə:

– Cəmil, – dedi, – mən səndən inciməmişəm.

Nəfəsi daraldığı üçün bir an susdu. Sonra sözünə davam edərək dedi:

– Mən səni həmişə yaxşılıqla xatırlayacağam. Get, ancaq yaman soyuqdur! Özünü gözlə! Əgər, yolu itirsəniz, mənim işığımı tuş tutub, geri qayıdın. Çırağı səhərə qədər söndürmərəm. Bizim işıqlar lap Bakı yolunacan görünür.

Mən ondan ayrılaraq iti addımlarla gedib maşına mindim.

– Do svidaniya, – həmişə bizimlə azərbaycanca danışan Mikola bu dəfə qıza rusca müraciət etdi:

– Do svidaniya, – deyə Südabə cavab verdi. Mən onun səsində bir titrəyiş hiss elədim.

Maşın tərpənib qar örtmüş düzləri işıqlandıra-işıqlandıra irəlilədi. Mən pəncərədən başımı çıxarıb geri baxdım və ağaran qarın üzərində Südabənin qaraltısını seçdim. O hələ də eyni yerdə durub baxırdı. Sonra, xeyli sonra balaca, zəif bir işığın ağır-ağır yuxarı qalxdığını gördüm. Yəqin ki, bu onun əl fənərinin işığı idi.

Daha sonra maşın uzaqlaşdıqca tez-tez pəncərədən başımı çıxarıb geriyə, fermanın işıqlarına baxırdım və zaman keçdikcə onlar da bir-birinin ardınca sönürdü. Nəhayət, qaranlıq düzənliyin ortasında güclə seçilən tək bir işıq qaldı. Sonra o da yox olduqda, "doğrudanmı, o, çırağı söndürdü?" deyə kədərlə düşündüm. Lakin o tək işıq yenə də göründü və yalnız biz gəlib Bakı asfalt yoluna çıxandan bir qədər sonra tamam gözdən itdi.

Elə bil ki, çölü bürüyən qaranlıq daha qatı, soyuq və kədərli oldu. O zaman mən balaca əl çamadanını götürüb dizlərim üstünə qoydum. Lakin onu açıb əllərimlə şala təmas etdikdə, iki saat bundan əvvəl neft çırağının işığında məktub yazan qızın siması bütün o qəribə gözəlliyi ilə qarşımda görünüb və bir anda da məndən uzaqlaşdı. Mən çölü bürüyən soyuq qaranlıq içində ağır, dərin bir ümidsizlik, bir qəriblik hiss edərək yun şalın üzərinə yıxıldım...

Səhər gəlib evimizə çatdığım zaman bütün ailəmiz böyük yemək otağında əyləşib çay içirdi. İnstitutda professor olan və yaşına nisbətən

çox gənc görünən atam da, bacım Firəngiz və onun bakenbardlı, çəhrayı bənizli nişanlısı da, həmişə yaxşı geyinməyi sevən qədd-qamətli anam da buradaydı. Hamısı məni xoşbəxt və mehriban təbəssümlə qarşılayıb, ordan-burdan sorğu-suala tutdu. Yalnız bacım Firəngiz susub mənə təəccüblə baxırdı və mən bunu hiss edərək, tələsik öz otağıma keçib qapını örtdüm, daha doğrusu, bağladım. Sonra yun şalı çıxarıb, açarı həmişə özümdə olan böyük kitab şkafında gizlətdim. Axşam saat doqquzda yenə də otağımın qapısını bağlayıb, yun şalı sahibinə göndərmək üçün şkafdan çıxartdım. Çit bağlamanın qırçını arasından təzə, merinos yunundan toxunmuş şalın bir parçası görünürdü.

Bu yun şalı o toxumuşdu və indi mən onu həmişəlik olaraq öz sahibinə göndərməli idim. Mən pəncərədən başımı çıxararaq, aşağıda maşında gözləyən sürücüyə:

– Gedə bilərsən Mikola, bu günlük mənə lazım deyilsən, – dedim.

Maşın səslənib uzaqlaşdıqda, ürəyimdə ani bir yüngüllük hiss edərək, yun şalı çarpayımın böyründəki balaca stolun üstünə qoydum.

Lakin nə olursa-olsun, şalı sahibinə vermək lazım idi və mən o biri axşam yun şalı sürücü ilə göndərmədim, özüm götürüb apardım! Özü də yemək otağından deyil, o biri qapıdan çıxdım. Nə üçün? Bilmirəm. Heç nə bilmirəm.

Mən Südabəni qapılarına qədər çox ötürmüşdümsə də, nə evlərinə girmişdim, nə də ailəsi ilə tanış idim. Lakin bilirdim ki, o, atasının-anasının bircəciyidir. Onu da bilirdim ki, köhnə rus dili müəllimi olan atası üç il bundan qabaq pensiyaya çıxmışdır.

Balaca evin pillələrini qalxıb ümumi şüşəbəndə girdim və kəndirə sərilmiş paltarları yığışdırmaqda olan bir rus qadınından Möhsünzadəgilin hansı otaqda yaşadıqlarını soruşdum. Qadın çox həvəslə gəlib otağı göstərdi. Zəngi çaldım.

– Buyurun, – deyə içəridən kişi səsi eşidildi.

Mən daxil olduğum zaman ortada qoyulan balaca stolun arxasında oturmuş yaşlı kişi qəzet oxuyur, qapı tərəfdə oturmuş yaşlı qadın isə corab toxuyurdu. Onlar heyrət ediləcək qədər bir-birilərinə bənzəyirdilər. İkisi də bir yaşda görünürdü. İkisinin də saçları dümağ idi. İkisi də balaca, yumru və xoşsifət idi. İkisi də salamımı alıb, eynəklərinin altından maraqla mənə baxdı.

– Bu əmanəti Südabə göndərib, – deyərək bağlamanı stolun üstünə qoyanda ikisi də birdən ayağa qalxıb eynəklərini çıxartdı.

– Siz orada işləyirsiniz? – deyə kişi soruşdu.
– Xeyr, – dedim, – ezamiyyətə getmişdim.
– Əyləşin, əyləşin, – deyə ikisi də bir ağızdan təklif etdi.
Mən kürsü çəkib oturandan sonra özləri də əyləşdilər.
– Necədir, sınıq deyil ki? – deyə ana soruşdu.
– Xeyr, burdakından da yaxşıdır.
– Siz Südabəni burada görmüşdünüz?
– Bəli, görmüşdüm, – deyə cavab verdim.
Və onların maraqla mənə dikilmiş nəzərlərini öz üzərimdən yayındırmaq üçün:
– Şalın arasında məktub var, – dedim.
Ana tələsik bağlamanı açaraq zərfi götürüb cırdı və məktubu nəzərdən keçirmək istərkən ata eynəyini taxıb:
– Ver görüm, – deyə kağızı ondan alıb uca səslə oxumağa başladı:
"Əziz atam və anam!
Məktubunuzu dünən aldım. Məndən nahaq nigaran olursunuz. Lap yaxşıyam. Ana! Xahişini yerinə yetirib otağımda soba da qurmuşam. Xanım arvad yenə də mənimlə olur. Özümü soyuqdan gözləyirəm. Çörəyimi də vaxtında yeyirəm. Bu barədə arxayın olun. Sovxozda məndən çox razıdırlar. Dünən direktorumuz gəlmişdi, mənim işimi təriflədi. Deyir Möhsünzadə yoldaş gələndən bəri dördüncü ferma birinci yerə keçmişdir. Özümü də fermada yerli komitə sədri seçiblər. İndi mən də sovxoz rəhbərləri qarşısında məsələ qaldırmışam ki, ferma işçiləri üçün balaca bir hamam tiksinlər. Srağagün üç maşın bişmiş kərpic göndəriblər. Ana! Bu şalı öz merinosumuzun yunundan toxumuşam. Mənə mükafat vermişdilər. Yazın axırlarında gəlib sizi gətirəcəyəm, bir az burada qalasınız... Deyirlər, bu yerlərin baharı gözəl olur. Atamın qıçlarının ağrısı necədir? Rütubətli havada qoyma bayıra çıxsın. Bax, darıxmayın. Yazda gələndə sizin üçün televizor alacağam. Özünüzdən muğayat olun. İkinizi də bərk-bərk öpürəm.
Qızınız Südabə".
Ata hələ də məktuba baxırdı. Ana əllərini yun şalın üzərində gəzdirərək, "öz merinosumuzun yunundandır..." deyə şəfqətlə gülümsədi və mənə elə gəldi ki, yun şal ananın balaca bürüşük əllərinin təması ilə canlanır, xoşallanır. Mən yenidən özümü həyatda hər şeyi itirmiş adamlar kimi məyus və unudulmuş hiss edərək, ayağa qalxdım. Qocalar mənə çoxlu təşəkkür etdilər və mən xudahafizləşib çıxmaq istədikdə:
– Siz bir də ora qayıtmayacaqsınız ki? – deyə ana soruşdu.

Dünyada misli görünməmiş bir şey eşitmiş kimi yerimdə donub, gah kişinin, gah da qadının üzünə baxdım. Bu sual arvadın ağlına haradan gəldi? Mən ki, orada işləmirəm! Bayaq dedim ki, ezamiyyətə getmişdim. Bəs, bu qəribə sual ananın ağlına haradan gəldi? Mən bir də ora nə üçün getməliyəm ki?

– Bəli, – dedim. – Qayıdacağam, mütləq qayıdacağam!

– Qız üçün bir az ayın-oyun düzəltsək...

– Apararam.

– Nə vaxt gedəcəksiniz? – bu dəfə ata soruşdu.

Mən bir qədər fikirləşib:

– Üç gündən sonra, – deyə qətiyyətlə cavab verdim. – Nə göndərəcəksinizsə, hazırlayın, gəlib götürəcəyəm.

... "Bax belə!.. Bax belə!" deyə zehnimdə tez-tez təkrar edərək küçə ilə gedirdim və nədənsə, bu sözləri təkrar etdikcə, yerişimin sürəti də artırdı.

... Səhəri gün Nazirlər Sovetinə ərizə verəndən sonra, kimsəyə demədən şəhərə çıxıb özüm üçün bir nişan üzüyü aldım. Bu, bizim dədə-baba adətimizdir.

... Yenə də qaranlıq bir gecəydi. Yenə də qar yağıb ucsuz-bucaqsız düzənliyi örtmüşdü və ya kim bilir, bəlkə, bu elə beş-altı gün bundan qabaq biz bura gələndə yağan qar idi. Mən, əllərim rulda, gözlərim isə uzaqdan görünən ferma işıqlarına dikildiyi halda irəliləyirdim. Lakin mən indi "ZİL"də deyil, sovxozda mənim (baş mühəndis-mexanizatorun) sərəncamıma verilmiş balaca "QAZ-69"da gedirdim.

Mən irəlilədikcə, səhərə yaxın göydə ulduzlar sönüb, nəhayət, bir dan ulduzu qalana kimi, fermanın da işıqları bir-bir yox oldu. Qaranlıq düzdə tək bir işıq qaldı və mən o tək işığı tuş tutaraq, heç yerdə azmadan düz gəlib fermaya çıxdım...

*1957*

## QIRÇI VƏ QIRMIZI ÇİÇƏK

Qoca qırçı ilə şagirdi cavan oğlan şəhərin lap ucqar yerindəki birmərtəbəli evin damına çıxanda günəş yenicə doğurdu.

Onlar ikisi də ucaboylu, enlikürəkli idi. İkisinin də əynində kobud brezentdən mazuta batmış iş paltarı vardı. Oğlan başıaçıq idi. Zil qara saçları səliqə ilə yana daranmışdı. Qocanın başında köhnə, palıdı kepka var idi. Oğlanın üzü təmiz təraş edilmiş, incə qara bığları şəvə kimi parıldayırdı. Qoca sağ əlində kömür kimi qaralmış köhnə qəlyan tutmuşdu.

Onlar ağır addımlarla damı gəzib hər tərəfini diqqətlə nəzərdən keçirdikdən sonra oğlan soruşdu:

– Başlayaq?

Qoca başını tərpətdi: “Başlayaq”.

Oğlan cəld qayıdıb nərdivanla aşağı düşdü. Qoca tənbəki kisəsini çıxarıb tələsmədən qəlyanını doldurdu. Elə bu zaman onun gözləri qırın üstündə bitmiş balaca, qırmızı çiçəyə sataşdı. Günəşin təzə işığı altında bu çiçək qırın üstünə düşmüş yaqut kimi alışıb-yanırdı. Yenicə açılmış kiçik, incə yarpaqlar onu qayğı ilə dövrəyə almışdı.

Qoca, gözləri çiçəkdə olduğu halda, eyni yavaş hərəkətlə qəlyanını ağzına qoyub odladı. O, yaz və payız aylarında asfaltı deşib çıxan bu xırda çiçəkləri çox görmüşdü və hər dəfə də qocaya elə gəlmişdi ki, bu kiçik çiçək sevinclə ona baxıb nə isə deyir...

Lakin nə deyir? Qoca bu barədə fikirləşməmişdi, sadəcə olaraq, çiçəyin zühuru ilə onun dərin qırışları olan çöhrəsindəki sərt ifadə bir qədər yumşalmış, bu qədər balaca, bu qədər zərif bir varlığın qüdrəti onda riqqətli, mehriban duyğular oyatmışdı.

Günəş gömgöy səmanın nəhayətsizliyi içində yüksəlirdi. Qırı deşib çıxmış qırmızı çiçək yaqut kimi alışıb-yanırdı.

Qoca qəlyanını ağır-ağır tüstülədir və baxırdı. Sonra gözlərini çiçəkdən çəkib günəşin qalxdığı uzaq üfüqə zillədi. Elə bil ki, o, dünya bina olunandan indiyədək bu geniş göylərin fonunda bu heykəl sükunəti ilə dayanıb o uzaq və naməlum üfüqlərə baxırdı. Elə bil ki, bundan sonra da, dünya durduqca beləcə dayanıb o uzaq və naməlum üfüqlərə baxacaq.

Onun günəşdən, ayazdan yanıb qaralmış geniş alnındakı qırışlar kotan şumu kimi dərin idi.

Nərdivanla qalxan oğlanın qarasaçlı başı göründükdə, qoca irəliləyib onun qaldırdığı alətləri aldı, oğlan sıçrayıb damın üstünə çıxdı.

Sonra onlar damın qırını söküb yerə tökdülər. Damı tamam təmizləyib aşağı düşəndən sonra qoca döş cibindən bir təklik çıxarıb oğlana uzatdı. Oğlan:

– Məndə var, – dedi.

– Götür!

Oğlan pulu alıb iti addımlarla getdi.

Qoca divarın kölgəsindəki balaca dikdirdə oturub qəlyanını tüstülədirdi.

Qoca gəlib-keçən adamlara, maşınlara deyil, küçə boyu uzanıb gedən boşluğa baxırdı. Ətrafındakı bu qələbəlik ona çoxdan məlum idi. Elə bil ki, baxdığı uzaqlarda, nə isə, təzə bir şey görmək istəyirdi. Lakin o bu barədə düşünmürdü.

O, sadəcə olaraq baxırdı!

Nəhayət, oğlan tindən çıxaraq iti addımlarla yaxınlaşıb, gətirdiyi kağız torbanı yerə qoydu. Sonra o biri əlindəki qəzeti açdı.

Qoca soruşdu:

– Təzədir?

– Təzədir... Ancaq elə bir şey yoxdur. Baxmaq istəyirsən?

Qoca, qəlyanını ağzının yanında tutmuş olduğu halda, qəzeti alıb nəzərdən keçirməyə başladı.

Oğlan isə, torbadan bir dəstə qırmızı turpla bir dəstə vəzəri çıxardı:

– Bunları yuyum, gətirim, – deyib yandakı qapıdan həyətə girdi.

Qoca qəzetə baxandan sonra onu süfrə kimi yerə sərib, torbadakı çörəyi, pendiri, kolbasanı və iki şüşə pivə ilə karton stəkanları çıxarıb üstünə qoydu.

Oğlan göyərtini gətirib əyləşdi, şüşələrin ağzını açdı. Qoca tələsmədən cibindən sümük saplı çox qədim bir bıçaq çıxarıb açdı, pendirlə kolbasanı səliqə ilə doğradı.

Oğlan soruşdu:

– Axşam saat yeddiyə qədər damın qırını salıb qurtararıq?

– Qurtararıq, – qoca, oğlana ani bir nəzər salıb çörəyi götürdü, ehtiramla kəsdi.

"Saat yeddiyə qədər... Cavanlar üçün belə dürüst vaxtların əhəmiyyəti var."

O özü də vaxtilə usta Qaradan soruşardı: "Görəsən, axşam saat yeddiyəcən qurtararıq?"

O vaxtdan, az qala, altmış ilə yaxın bir zaman keçir. Vaxtilə ona uzaq görünən gələcək, əslində, nə qədər yaxın imiş...

... Onlar qəlyanaltı eləyib qurtarandan sonra oğlan qırıntıları qəzetə büküb zibil qutusuna atdı. Sonra, dünən gətirib asdıqları qır qazanının altını yandırdılar.

Altmış ilə yaxın idi ki, cəhənnəm kürəsi kimi zəbanə çəkib yanan bu ocaq qocaya tanış idi.

Əlli-əlli beş il bundan qabaq o da bu oğlan kimi, kürəyin qulpundan yapışaraq sallanır, əriməkdə olan qırı bu cür nəşə ilə qarışdırırdı. O zaman usta Qara da beləcə divarın kölgəsində oturub qəlyanını tüstülədə-tüstülədə ona, öz cavan şagirdinə baxırdı.

Qoca qırçı, yenə də vaxtın aldadıcılığı barədə düşünürdü. Aşağılarda, şəhərin gur yerində akademiyanın yerləşdiyi böyük binanın qədim zərləri qızıl kimi parıldayırdı. Bu bina öz incə, şairanə arxitekturası ilə qocanın gözəl vətəninin hər yerində məşhur idi.

Düz əlli beş il bundan əvvəl çərşənbə günündə usta Qara ilə o, həmin binanın damına qır salmağa başlamışdılar. Çərşənbə günü. Novruzun axırıncı çərşənbəsi. Onlar gün qalxana qədər işlədilər. Sonra o gedib xaşxaşlı təzə çörək, motal pendiri, vəzəri, göy soğan, bir çaynik də yaxşı dəmlənmiş çay alıb gətirdi.

Axşam isə, usta Qara onu qonaq apardı. Qapılarda tonqallar yanırdı. Uşaqlar sevinclə qışqıraraq bu tonqalların üstündən tullanır, göyə rəngli fişənglər buraxırdılar. Usta Qaranın arvadı Gülsüm bacı (Allah ona rəhmət eləsin, ustaya layiq adam idi) gətirib turşuqovurmalı plovu çəkdi. Üçü də qırmızı-ağ zolaqları olan döşəkçələrin üstündə oturub ləyaqət və hörmətlə plovu yedilər. Sonra Gülsüm bacı balaca, armudu stəkanlarda çay və xüşgəbar gətirdi... Elə bil ki, bütün bunlar dünən olmuşdu. Halbuki artıq bu dünyada nə usta Qara var idi, nə də Gülsüm bacı.

Oğlan kürəkdən sallanaraq, pıqhapıq qaynayan qır qazanını qarışdırır, qoca isə, divarın kölgəsində oturub baxırdı. Oğlanın günəşdən yanıb mis kimi qızarmış canlı qollarının tez-tez yumrulanıb qalxan əzələləri, tər damlaları yuvarlanan enli kürəyi qocanı fərəhləndirirdi: "Qırçılar nəsli möhkəm nəsildir".

Qoca, qəlyanının külünü yerə çırpdı, təzədən doldurub odladı. Sonra oğlana dedi:

– Yaxşıdır. Qoy qaynasın. Gəl otur, dincini al.

Oğlan bir-iki dəfə qırı qarışdırandan sonra kürəyi buraxdı, qazandan geri çəkilib cibindən yaylıq çıxardı.

Qoca birinci dəfəydi ki, oğlanda bu cür səliqə ilə yuyulub ütülənmiş yaylıq görürdü (oğlanın, yaşı səksəndən ötmüş nənəsindən başqa heç bir kəsi yox idi). Oğlan yaylıqla boyun-boğazının tərini silib:

– Mən, – dedi, – gedim bir stəkan limonad içim...

– Get! – deyə qoca həvəslə cavab verdi.

– Sənə də gətirimmi?

– Yox. Mən susamamışam.

Oğlan çevrilib sürətlə getdikcə qoca arxadan səsləndi:

– Buzlu içmə. Boğazın təzə yaxşı olub.

* * *

Oğlan aşağıda vedrələri, əriyib maye halına gəlmiş qırla doldurur, qoca isə, onları çəkib damın üstünə tökürdü.

... Artıq günəş qürubda idi, dam isə, hələ qırlanıb qurtarmamışdı. Qoca boşalmış vedrəni aşağı buraxaraq, şalvarının qabaq cibindən qədim iri saatını çıxarıb baxdı. Yeddi tamama on beş dəqiqə qalmışdı. Bir saat da işləsələr, qurtararlar.

Lakin qoca damın kənarına yaxınlaşıb, aşağıda vedrəni götürən oğlana xitabən:

– Doldurma, – dedi. – Bəsdir. Qalanını sabah eləyərik. Qolum ağrıyır.

Qoca, ürəyindəki incə hissləri dilinə gətirməyi sevmirdi. Qoca, oğlanın sifətindəki qayğını dərhal necə bir sevincin əvəz elədiyini və onun vedrəni yerə qoyub, brezent pencəyini necə cəld götürdüyünü gördü.

Qocaya başqa şey də lazım deyildi.

– Daha mənimlə ayrı işin yoxdur ki, – deyə oğlan altdan-yuxarı qışqırdı.

Qoca sakit səslə cavab verdi:

– Yoxdur.

– Onda mən getdim. Səhər tezdən buradayam.

Oğlanın axırıncı sözləri deməsi ilə tini burulub gözdən itməsi bir oldu.

... Lakin qoca, damı bu gün mütləq qırlayıb qurtaracaqları barədə ev yiyəsinə söz vermişdi (o, heç vaxt yalan danışmamışdı).

O, tələsmədən, nərdivanla enib qır qazanının yanına gəldi. Vedrələrin ikisini də doldurdu, təkrar dama qalxdı. Sonra vedrələri yuxarı çəkdi. O, bu minvalla işləyərək, çıraqlar yananda damı tamam qırlayıb qurtardı.

... Qoca qəlyanı damağında, ağır addımlarla sahilə çatıb oleandr kolları arasındakı skamyaların birində oturdu. Sahil adamla dolu idi. Lakin qoca dənizə baxırdı. İri, çıraqban gəmilər limanda lövbər salıb

dayanmışdı. Bir dəstə gənc oğlan, qız, təkadamlıq qayıqlarda avar çəkərək ötüşürdü. Uzaqda mayaklar yanıb-sönürdü. Dəniz isə asta-asta yırğalanırdı. Dənizin bu tərpənişində hər şeyə qarşı bir biganəlik var idi və qoca həmişə bu məğrur biganəliyi hiss edirdi.

Qoca iki dəfə daha qəlyanını doldurub çəkəndən sonra qalxdı. Onun yolu bayaq damına qır basdıqları evin yanından idi. O, bu evin küçəyə baxan pəncərəsi qarşısından keçəndə tül pərdə arxasından içərini gördü. İri elektrik çırağı altındakı ağ örtüklü stolun ətrafında ortayaşlı bir kişi ilə gənc qadın və iki oğlan uşağı oturub şam edirdilər. Radioda şən bir hava oxunurdu...

... Qoca, şəhər kənarındakı balaca otağına gəldi. Abajursuz lampanın tutqun işığında yeganə pəncərənin qabağına qoyulmuş dəmir çarpayı, ortada üzərinə köhnə müşəmbə çəkilmiş stol, onun ətrafındakı dörd stul və əhənglə ağardılmış divarlar göründü. Hər şey, çarpayının üzərindəki nimdaş yorğan-döşək kimi köhnə, lakin təmiz idi. Qoca tələsmədən pencəyini çıxarıb qapının yanındakı taxta asılqana keçirdi. Balaca mətbəxə gedib əl-üzünü yuyaraq, ağ məhrəba ilə qurulandı. Sonra taxçaya qoyulmuş bir banka qatığı götürdü (bu qatığı hər gün qonşudakı satıcı arvad gətirib buraya qoyardı), oturub dünəndən qalmış boyat çörəklə yedi.

... Qoca otağa qayıdıb balaca radioqəbuledicini qurdu və qəlyanını doldurub alışdırdı, oturub son xəbərlərə qulaq asdı.

Sonra diktor Xanın "Segah" oxuyacağını elan etdi. Vaxtilə o, Xana qulaq asmağı heç bir şeyə dəyişməzdi. Ancaq indi radionu bağladı. Oğlu Cahangir müharibədə həlak olandan sonra, qoca, "Segah"a qulaq asa bilmirdi. Ona görə yox ki, əsəbləri zəif idi... Ona görə ki, qocanın qəlbində əlavə kədərə yer yox idi.

... O, radionu söndürdü. Daha nə qalırdı? Heç bir şey... Əvvəllər oğlan tez-tez gecələr onunla söhbətə gələrdi. İndi on gündür... Düz on gündür ki, daha gəlmir. Qoca da səbəbini soruşmur. Cavan adamdan belə şeyləri soruşmaq olarmı?

... O soyunub işığı söndürdü, arxası üstə çarpayısına uzandı. Gözləri xeyli müddət otağın zülmətinə zillənib qaldı. Elə bil ki, bu zülmət bir əbədiyyət idi və o, bu əbədiyyətə qovuşmuşdu. Lakin onun şüuru işləyirdi. Bu şüur isə, işıq və ümidlər silsiləsindən ibarət idi. Qoca düşünürdü: "Oğlan səhər damın tamam qırlanıb qurtardığını görəndə, yəqin ki, təəccüb edəcək."

Sonra onlar qonşudakı evlərin damlarını qırlayacaqlar. Üç gün bundan qabaq ev sahibləri ilə danışıq aparıblar. Hələ indiyə qədər heç

kəs onun işindən narazı qalmamışdır. Buna görə də ona hörmət edirlər. Onun üçün növbəyə dururlar. Usta Qara da beləydi. İndi isə... O, cavan şagirdi haqqında düşündü və qır qazanını qüvvətlə, nəşə ilə qarışdıran oğlanın qədd-qaməti gözləri qarşısında olduğu halda yuxuya getdi.

... Səhərisi onlar ikinci evin damını qırlayırdılar. Yenə də qoca yuxarıda, oğlan aşağıda işləyirdi. Günün axırında oğlanın yanında ortaboylu, lap cavan bir qız peyda oldu. Əynində əhəngə bulaşmış kombinezon var idi. Bədəni dolu olduğundan, kombinezonun şalvarı ona dar gəlirdi.

Son dəbdə kəsilmiş saçlarının üstündən (yəqin ki, işdə mane olmasın deyə) qırmızı lent bağlamışdı. Üzünü təzəcə yumuş olduğundan saçlarının qabaqdakı qıvrımları hələ yaş idi. O, əlləri arxasında dayanıb, vedrəyə qır dolduran oğlana baxırdı.

Qoca əvvəl elə güman etdi ki, bu qız elə-belə yoldan keçəndir. Lakin sonra gördü ki, oğlan çevrilib ona nə isə dedi və qız gözəl, ağ dişlərini göstərib gülümsədi.

Qoca daha baxmadı... Damı qırlayıb qurtarandan sonra tələsmədən düşüb onların yanına gəldi. Oğlan qızı göstərərək:

– Usta, tanış ol, – dedi.

Qız qocaya yaxınlaşdı, altdan-yuxarı ona baxıb əlini uzatdı. Qoca onun balaca, təmiz əlini əzəcəyindən qorxurmuş kimi astaca sıxdı. Qız gülümsəyərək adını dedi.

Qoca qəlyanını çıxardıb odluğunu təmizləyə-təmizləyə qızdan soruşdu:

– Harada işləyirsən?

– Təzə tikilən kinostudiya binasında, – deyə oğlan qızın əvəzində cavab verdi, – elə işdən birbaşa bura gəlib.

Qız isə, yenə əlləri arxasında, qocaya baxaraq biaram gülümsəyir və sanki onun daha nə deyəcəyəni gözləyirdi.

Lakin qoca daha heç nə soruşmadı. Oğlan pencəyini götürərək:

– Yaxşı, usta, – dedi, – tay bir işin yoxdursa, biz gedək.

– Gedin.

Oğlan tərəddüd içində ona daha nə isə demək istədi, lakin heç nə deməyərək, geri dönüb qızla birlikdə getdi.

– Rəşid! – deyə qoca arxadan səsləndi və oğlan geri çevrildikdə, əli ilə yaxınlaşmasını işarə elədi.

Qoca cibindən bir üçlük çıxarıb xəlvətcə oğlana verdi.

Oğlan qara gözləri ilə gülümsəyərək soruşdu:

– Bəyəm almısan?

– Yox, hələ almamışam.
– Sağ ol.
Oğlan çevrilib yüyürərək qıza çatdı.
Bundan sonra hər gün işin axırında, saçlarına qırmızı lent bağlamış o qız gəlir və oğlanla gedirdi... Qoca, oğlandan heç nə soruşmurdu. "Lazım olanda özü danışacaq."
... Lakin bu qız peyda olandan bəri qoca tamam bir xəyal aləminə dalmışdı. O, demək olar ki, hər gün şagirdinə necə toy edəcəyi, sonra, əgər, oğlanları olarsa, ona usta Qaranın adını qoyacağı barədə düşünürdü. Hər gün, bu gələcək gənc ailə bütün aydınlığı ilə qocanın gözləri qarşısında canlanırdı. O, bu məhəllədəki evlərin qırını təzələyəndən sonra nə qədər pulları olacağını dəfələrlə haqq-hesab edir, toy üçün alacağı şeyləri bir-bir gözünün qabağına gətirirdi.
Oğlanın xəbəri olmadan qoca təmir idarəsindən əlavə sifarişlər qəbul edirdi. ... Lakin bir istirahət günü onun heç gözləmədiyi bir əhvalat oldu. Qoca hamamdan yenicə gəlib özünə çay dəmləyirdi. Elə bu zaman qapı yavaşca vuruldu. Qoca səsindən bildi ki, oğlandır.
Lakin oğlan bu dəfə tək deyildi. O, qızla gəlmişdi. Saçlarına qırmızı lent bağlayan həmin qızla! Uzun illərdən bəri birinci dəfə olaraq qoca yaman sevindi.
– Əyləşin. Xoş gəlmisiniz. – O, qıza müraciət elədi və təmiz hava gəlsin deyə tələsik otağın yeganə pəncərəsini taybatay açdı.
Oğlan da, qız da təzə paltar geymişdilər. Oğlan ağ köynəyin üstündən mavi qalstuk bağlamışdı. Qızın qolunda balaca qızıl saat var idi.
Birdən qoca hiss elədi ki, oğlan əvvəlki kimi qayğısız və sərbəst deyil. Günahkar adamlara oxşayır.
Qocanın sevincinə anlaşılmaz bir qorxu qarışdı.
– Bu gün yaxşı havadır, – deyə o gülümsədi.
Oğlan diqqətlə qocaya baxdı. O heç vaxt ustadan bu cür mənasız sözlər eşitməmişdi. Heç vaxt onun belə gülümsədiyini görməmişdi.
Sonra qoca tələsik mətbəxə keçib, qədim, güllü podnosun içində üç stəkan çay gətirdi.
Oğlan:
– Niyə zəhmət çəkirsən, ay usta, – dedi. – Qız gətirərdi.
– Zəhmət... nə zəhməti var, – qoca eyni təbəssümlə cavab verdi.
Sonra nəzərlərini oğlanın diqqətli baxışlarından yayındıraraq əlavə etdi:

– Siz oturun, mən bu saat gəlirəm.
Oğlan onun qolundan yapışaraq:
– Usta, – dedi, – biz çörək yemişik. Heç bir şey lazım deyil. Sən ac deyilsən ki?
Qoca eyni mülayim və çəkingən ifadə ilə "yox" mənasında başını tərpətdi.
– Onda, əyləş.
Birlikdə işlədikləri bu üç ildə oğlan birinci dəfəydi ki, onun bu cür ürkək, bu cür narahat oturduğunu görürdü.
– İçin, – deyə qoca stəkanlara baxdı. – Çay, isti yaxşıdır.
Birinci dəfəydi ki, oğlan onun səsində bu qədər mehribanlıq, nəvaziş hiss edirdi və bu hiss onun ürəyini ağrıdırdı.
Oğlan kəskin hərəkətlə balaca armudu stəkanı götürüb üç-dörd qurtuma boşaldaraq, təkrar nəlbəkiyə qoydu. Qoca əlini cəld stəkana uzatdı. Oğlan onun əlindən tutaraq:
– Tay içmirəm, – dedi.
Qoca, oğlana ani bir nəzər saldı:
– Bu səhər, – dedi, – İçərişəhərdən yenə iki nəfər gəlmişdi. Dedim işimiz çoxdur. Ayın on beşindən sonra...
Qız oğlana baxdı. Oğlan qaşqabaqlı halda nəzərlərini endirdi. Araya gərgin bir sükut çökdü. İndi qocanın təbəssümü daha narahat görünürdü.
Birdən oğlan başını qaldırıb düz onun gözlərinə baxaraq qəti və sərt ifadə ilə:
– Usta, – dedi, – mən tay sabahdan gəlməyəcəyəm.
Usta batqın səslə soruşdu:
– Hara gəlməyəcəksən?
– Qır salmağa.
– Niyə?
– Oxumağa gedirəm.
– Hara gedirsən?
– Oxumağa. Yol texnikumuna.
– Çətin olmaz?
Oğlan, onun nəyə işarə elədiyini anladı:
– Birtəhər dolanarıq, – dedi.
– Mən işləyəcəyəm, o oxuyacaq, – deyə saçlarına qırmızı lent bağlayan həmin qız amansızcasına əlavə etdi. – Bilirsinizmi, usta, tay qırçılığın dövrü keçib. Görürsünüz ki, indi təzə tikilən evlərin üstünə qır basmırlar.

Qoca düşündü: "Bəli... doğrudur... Təzə evlərin damına qır basmırlar."
Qız eyni amansızlıqla davam edirdi:
– Sizə baxmayın. Rəşid çox cavandır. O, gələcək haqqında düşünməlidir.
Qoca düşünürdü: "Elədir... Əlbəttə..."
– Doğrusu, Rəşid heç sizdən ayrılmaq istəmirdi. Ancaq...
Qız cümləsini bitirmədi. Buna ehtiyac da yox idi.
O, saçlarına qırmızı lent bağlamış həmin qıza baxaraq mehribanlıqla gülümsədi. Qız ona həddindən artıq balaca və həddindən artıq güclü görünürdü. Oğlan eyni sərt ifadə ilə gözlərini bir nöqtəyə zilləmişdi.
Qız çayını arxayınlıqla içib qurtarandan sonra özünün və oğlanın stəkanını götürüb (qoca çayını içməmişdi) mətbəxə apardı, tərtəmiz yuyub taxçaya qoydu və o geri qayıdanda oğlan dərindən nəfəs alaraq qalxdı, qoca da durdu.
Oğlan ona baxıb dedi:
– Tay biz gedək.
– Gedin.
– Sağ ol.
– Siz də sağ olun.
Onlar qapıdan çıxarkən, birdən qız geri dönüb qocaya yaxınlaşdı və onun qollarından tutaraq, ayaqlarının ucunda qalxıb cod saqqallı üzündən öpdü. Sonra bahar küləyitək otaqdan çıxdı.
... Qoca bir neçə saniyə durduğu yerdə dayandı. Otağın yarıqaranlığı içində o, çox sakit və qədd-qamətli görünürdü. Qoca birdən sanki nəyi isə xatırlayaraq, başını qaldırıb pəncərədən bayıra baxdı. Onlar çoxdan getmişdilər.
Qoca tələsmədən qəlyanını çıxarıb doldurdu, odladı. Onun üzündə bayaqkı mehribanlıqdan əsər-əlamət yox idi. Kepkasını götürüb başına qoydu, otaqdan çıxdı.
O, ağır addımlarla gedirdi.
O, həmişə istirahət günləri qırçıların yığıldığı bağa tərəf gedirdi.
Yaz günəşi gömgöy səmanın sonsuzluğu içində yüksəlir, aşağılarda isə, akademiya binasının zər naxışları qızıl kimi parıldayırdı. O, sabah qırlayacağı damlar haqqında düşünərək gedirdi.
O, həyatın – böyük və qüdrətli həyatın qanununu hiss edərək ağır addımlarla gedirdi.

*1962*

# TUFANDAN SONRA

*kinonovella*

Xorla oxunan qədim bir Azərbaycan mahnısı sıldırımlı dağlardan axıb dərələrə töküldü...

Mənim adım – Sarı Laçın,
Gəl, səni götürüm qaçım...
Üçtelli, dördtelli,
Beştelli durna...

Başı qarlı Murov dağının fonunda, yaşıl otlarla, təzə-təzə açılan lalələrlə dolu vadidə üç cavan oğlanla bir qız bu mahnını oxuya-oxuya çadır qururdular.

Elxan tək oxudu:

Ovçu əlindən yaralı durna.

Hamı təkrar etdi:

Ovçu əlindən yaralı durna,
Yaralı, yaralı, yaralı durna,
Ovçu əlindən yaralı durna...

Elxan məzəli bir əda ilə:

– Dünyanın qəribə təsadüfləri var, – dedi, – axı, necə olub ki, bizim bu Laçın (oğlanlardan birinə işarə etdi), məhz mahnıda deyildiyi kimi, sarı olub?

Laçın gülümsəyərək təkrar etdi:

Ovçu əlindən yaralı durna...

Hamısı birdən oxudu:

Yaralı... yaralı... yaralı... durna...
Uca dağların maralı durna...

Qız dedi:

– Amma heyf ki, bizim Laçınımız ovçu deyil...

Elxan soruşdu:
– Yəni, ovçuluqdan bu qədər xoşun gəlir?
– Xoşum gəlir də sözdür, – deyə qız cavab verdi.
Laçın dedi:
– Bizim evdə hara baxsan, ovçuluq haqqında kitab görərsən.
Qız gülümsədi:
– Mən, – dedi, – pələng kimi igid yırtıcılar ovçusunun pərəstişkarıyam, dovşan ovçusunun yox...
Elxan yerə sancdığı dirəyin dibini bərkidə-bərkidə:
– Ümumiyyətlə, – dedi, – ovçuluq humanizmə zidd bir peşədir... Mənim əlimdə ixtiyarım olsaydı, ovçuluğu qadağan edərdim.
Mərdan çadırın o biri dirəyini yerə sanca-sanca:
– Daha bundan da boş söz eşitmək olmaz, – dedi.
– Nə üçün? – deyə Elxan zarafatla soruşdu.
– Onda gərək qoyun-quzunu, toyuq-cücəni kəsib yeməyi də qadağan eləyəsən və biz, Şeyx Nəsrullah demişkən, "gündə bir xurma ilə təam eləyək", – deyə Laçın səhnədə gördüyü Şeyxin ifasına uyğun tərzdə cavab verdi.
Elxan:
– Mən, – dedi, – əminəm ki, gələcəkdə elə qida həbləri tapılacaq ki, daha ətə-çörəyə ehtiyac olmayacaq.
– O zaman, – Mərdan cavab verdi, – onsuz da, darısqal olan bu Yer planetində heyvan əlindən tərpənmək olmaz...
– Ayılar... qabanlar hücum çəkib evlərə dolar, – deyə Laçın bərkdən güldü.
... Mərdan artıq qurub qurtardığı çadıra işarə ilə Laçınla qıza dedi:
– Bu gəlinimizlə özündənbəyin...
– Taleyimizdən xeyli razıyıq, – deyə Laçın zarafatla arvadına göz vurdu...
Elxan dərindən nəfəs alaraq, şairanə bir əda ilə dedi:
– Bu güllü-çiçəkli dağlarda gecələr uzaqdan gələn şəlalə şırıltısını dinləyə-dinləyə əbədi məhəbbət anları yaşamağı nə ilə əvəz etmək olar?
Qız dedi:
– "Əbədi" sözünü tulla!
– Tullamayacağam, – deyə Elxan hərarətlə davam etdi. – Böyük hisslərlə yaşadığımız hər an, məncə, bir əbədiyyətdir.
– Bəs, kiçik hisslərlə? – qız soruşdu.

– Kiçik hisslər göbələk kimidir. Birini qoparanda, səhər yerində beşi bitəcək. Amma nəcib hisslər... Leyla, demək, "əbədi" sözü artıqdır?

– Elxan, yox, artıq deyil. Böyük hisslər məhv olsalar da, biz onları heç bir zaman unuda bilmirik... Onlar bizim üçün əbədi işıqdır.

... Mərdan qurub qurtardıqları ikinci ağ çadıra işarə ilə:

– Bu da bizim yemək otağımız, – dedi.

... Mərdan qurub qurtardıqları üçüncü ağ çadırı göstərərkən özü ilə Elxana işarə ilə:

– Bu da biz qarımış oğlanların xanəsi, – dedi.

***

... Gecə idi.

Mərdanla Elxan öz çadırlarındakı balaca, qatlama stolun ətrafında oturub, geoloji xəritəyə baxırdılar. Qabaqlarında iki stəkan çay buğlanırdı...

Elxan xəritədə bir yeri göstərərək:

– Mən, – dedi, – burdakı püskürmə suxurlarında civə ola biləcəyinə inanıram.

– Mən də inanıram, – deyə Elxan siqaret yandırdı, – bu tərəflərdə ən qədim süxurlar onlardır.

– Professorun mülahizəsinə görə, qızılı isə, burda axtarmaq lazımdır, – deyə Mərdan xəritədə başqa bir yeri göstərdi.

– İnsan ayağı dəyməmiş bu tufanlı dağlarda qızıl mədəni tapmaq mənə bir nağıl kimi görünür, – deyə Elxan gülümsədi, – elə bil ki, biz tilsimli bir qala fəth etməyə hazırlaşırıq.

Mərdan fikirli halda:

– Bu saat, – dedi, – bizim üçün civə qızıldan da əhəmiyyətlidir.

– Görək nə olur... – deyə Elxan papirosundan dərin bir nəfəs aldı. – Səninlə Laçın bir çox ekspedisiyalarda olmusunuz... Təcrübəniz var... Amma Leyla ilə biz birinci dəfədir.

– Vətənimiz zəngindir, – deyə Mərdan dərindən nəfəs alaraq cavab verdi. – Bizi əliboş qaytarmaz...

– Görək, – deyə Elxan tranzistorun düyməsini basdı və "Gecələr... ay gecələr..." mahnısı ətrafa yayıldı.

... Və bu mahnı oxunduqca, gözlərimiz qarşısında Murov dağının sirlərlə dolu qaranlıq gecə mənzərələri gəlib-keçirdi...

... Əzəmətli dağ siluetləri arasında iki işıq görünürdü.

... Və mahnı davam edirdi: "Gecələr... ay gecələr..."

***

... Sonra bu mahnını qəflətən yuxarılardan qopub, üzüaşağı dərəyə yumalanan hansı bir qaya parçasınınsa gurultusu əvəz etdi.

... Öz çadırlarında, qatlama çarpayıda əri ilə yanaşı uzanaraq, xəyal dolu nəzərlərini məchul bir nöqtəyə dikmiş Leyla diksindi:

– Eşidirsən?

Laçın yuxulu gözləri ilə gülümsəyərək:

– Daşdı, yəqin ki, pələngin ayağının altından qaçdı, – deyə zarafatla cavab verdi.

– Yox, – deyə Leyla qalxıb, çılpaq qolu ilə yastığına dirsəklənərək cavab verdi, – pələng çox ehtiyatla hərəkət edir. O, heç vaxt möhkəm olmayan yerə ayağını basmaz...

– Nə bilirsən?

– Eşitmişəm... Mənim dayım məşhur ovçu idi. Bir dəfə Talış meşələrində bir pələng vurmuşdu...

... Və elə bu zaman bayırda yenə tappıltı eşidildi.

– Maral! – deyə Leyla qəribə bir sevinclə səsləndi və tappıltı uzaqlaşıb eşidilməz olanda, o, dərindən nəfəs alaraq, başını təkrar yastığa qoyub:

– Görəsən, – dedi, – bizim axtarışlarımızdan bir şey çıxacaq?

– Nə üçün şübhə edirsən? – deyə Laçın soruşdu...

Leyla yenə də gözlərini məchul bir nöqtəyə zilləyərək:

– Bilmirəm, – dedi. – Nə üçünsə həmişə bu barədə düşünəndə, mən çox həyəcanlanıram.

Laçın:

– Birinci dəfədir, ona görə, – dedi.

Sonra zarafatla əlavə etdi:

– Geoloqun taleyi təkcə özündən asılı deyil...

Leyla dərindən nəfəs alaraq:

– Yəqin ki... – deyə pıçıldadı.

***

... Günəş qalxıb dağları, meşələri brilyant kimi şəffaf işığa qərq etdi. Murov dağının döşü ilə sanki günəşdən qaçan süd kimi ağ duman layları sürətlə qərbə tərəf sürünürdü...

... Çadırların qabağında dayanmış Mərdan əli ilə sol tərəfi göstərərək dedi:

– Laçınla Leyla, demək, siz ora! Biz isə, bura! Saat beşdə, düşərgədə görüşərik.

Sonra gülümsəyərək əlavə etdi:

– Sizə də, bizə də uğurlu səfər!

... Bellərində dəri heybələr, ayaqlarında dağ-daşa, palçığa davamlı qalın çəkmələr olan Laçınla Leyla əl-ələ tutaraq, üzüaşağı götürüldülər.

– Ehtiyatlı olun! – deyə Mərdan arxadan qışqırdı...

– Arxayın olun! – deyə Laçın sol əlindəki dəmir uclu ağacı havada yellədi.

– Onların xoşbəxtliyi mənə ləzzət verir, – deyə Elxan gülümsədi.

***

... Gümüş kimi parıldayan dağ çayı özünü daşlara, qayalara çırparaq nərildəyirdi. Laçın hansı uzaq zamanlardasa yerin dərinliklərindən qalxan nəhəng qayaya çevrilmiş süxuru çəkiclə parçalayırdı. Leyla lupa ilə kiçik süxur qırıntılarını tədqiq edirdi...

– Hələ ki, bir əlamət görünmür, – deyə o, nəhayət, başını qaldıraraq Laçına müraciət etdi.

Laçın süxuru parçalamaqda davam edərək:

– Geoloq üçün ən vacib məsələlərdən biri səbr etməyi bacarmaqdır, – dedi.

... Leyla lupa ilə nəzərdən keçirdiyi yeni süxur parçasını tullayaraq:

– Heç nə yoxdur, – deyə ümidsizliklə səsləndi.

– Sən indidən belə əsəbiləşməyə başlasan, qızıl tapanacan bizdə can qalmaz, – deyə Laçın zarafatla cavab verdi.

Leyla soruşdu:

– Yəni, sən bizim bir şey tapacağımıza inanırsan?

Laçın, çəkiclə qayaya yeni zərbə endirərək:

– Biz, – dedi, – bir şey yox, iki şey tapacağıq, qızıl və civə!

Sonra dikəlib, alnının tərini silərək saatına baxdı:

– Saat beşə işləyir. Sən tərpən düşərgəyə, yeməyə bir şey hazırla.

– Bəs sən? – deyə Leyla soruşdu.

– Mən hələ bir saat da işləyəcəyəm. Süxur gətirərəm, çadırda tədqiq edərik.

– Yorulmamısan?

– Yox, tərpən!..

... Leyla uzaqlaşanda Laçın arxadan qışqırdı:
– Gözlə, azarsan.
– Azaram, gəlib taparsan, – deyə qız zarafatla cavab verdi.

***

Leyla sıldırım qayaların arası ilə aşağı enirdi.
... Yamaclar, vadilər təzə-təzə açılan bahar çiçəkləri ilə dolu idi və Leyla gedə-gedə bu çiçəklərdən yığıb iri bir buket düzəltdi...
... Və nəhayət, Leyla dağı enib, meşəyə girdi.
... Leyla irəlilədikcə, sığırçın, sarıköynək zümrüd yarpaqların arasından ona baxaraq həyəcanla səslənirdi.
... Birdən zanbaq kimi gömgöy səma qaraldı...
Və şiddətli külək meşəni hərəkətə gətirdi.
... Külək güllə kimi vıyıldayaraq ağacların budaqlarını Leylanın üzünə çırpırdı...
... Sonra dalbadal göy gurultusu eşidildi...
... Dalbadal ildırım çaxıb, təlatümdə olan meşəni və göz açmağa imkan tapmayan qızı işıqlandırdı.
... Sonra dolu qarışıq şiddətli yağış başladı.
... Yağış və dolu zorla yeriyən qızı amansızlıqla döyəcləyirdi.
Qız hara getdiyini bilməyərək yıxıla-qalxa irəliləyirdi...
... Və nəhayət, o, balaca meşə açıqlığına çatdıqda, əynində başlıqlı neylon plaş, çiynində quşla dolu heybə və tüfəng olan ucaboylu bir adamın on beş-iyirmi addım aralıda dayanıb, ona baxdığını gördü.
... Neçə vaxtdan bəri qorxu və əzab içində yorulub əldən düşmüş qız insan gördüyünə sevindi.
Oğlan əlinin dalı ilə gözlərinə çırpılan yağış suyunu silərək, qıza yaxınlaşıb soruşdu:
– Bu tufanda hardan gəlib, hara gedirsiniz?
Qız bunun iyirmi yeddi-iyirmi səkkiz yaşında çox yaraşıqlı bir oğlan olduğuna yalnız indi diqqət yetirərək:
– Mən geoloqam, – dedi, – düşərgəmizə gedirəm.
– Düşərgəniz hayandadır?
– Bilmirəm, – deyə qız şiddətlə yağan yağışın arasından onun belindəki patron kəmərinə baxaraq cavab verdi, – yolu itirmişəm...
– Kompasdan, xəritədən yoxunuzdu?
– Kompas da, xəritə də Laçının yanında qaldı.
– Laçın kimdir?

– Mənim yoldaşım.

Sonra qız gülümsəyərək əlavə etdi:

– Yəqin ki, bu dolu ilə yağış indi ona da divan tutdu. Biz axtarışa bir getmişdik. Mən bir az tez qayıtdım ki, yeməkdən-zaddan hazırlayım... O cür gözəl havada birdən-birə bu cür tufan qopacağı kimin ağlına gələrdi.

– Bu dağların havasına inanmaq olmaz, – deyə oğlan ciddi ifadə ilə cavab verdi, – indi belədir, bir saat sonra başqa cür olacaq...

... Sanki qızın qorxusu və yorğunluğu bir andaca yox olub getmişdi. O, təkrar gülümsəyərək:

– Görünür, – dedi, – bu yerlərin havasını öyrənməkdə səhv etmişik. Siz ovçusunuz?

– Xeyr, elə-belə... həvəskaram... Vaxt olanda, çıxıram. Siz, düşərgənizin təxminən hansı səmtdə olduğunu da bilmirsiniz?

– Bizim düşərgəmiz, – deyə qız ruhla cavab verdi, – Göy gölə tökülən dağ çayının sağ sahilindədir.

– Göy gölə tökülən çay çox yerlərdən keçir... Özü də xeyli uzundur... – deyə oğlan bayaqdan bəri ilk dəfə xəfifcə gülümsədi, sədəf kimi ağ və yaraşıqlı dişlərini göstərdi...

– O da düzdür... – deyə qız qəribə bir qayğısızlıqla təsdiq etdi.

Sonra həvəslə soruşdu:

– Siz ancaq quş vurursunuz?

– Hər nə düşdü...

– Bu yerlərdə pələng, şir olmur?..

– Yox, olmur...

– Ayı necə?

– Ayı olur.

– Heç vurmusunuz?

– Yox.

– Yəqin rast gəlməmisiniz?

– Çox rast gəlmişəm... ancaq vurmamışam.

– Nə üçün axı?

– Çünki mənə hücum eləməyib...

– Yalnız buna görə?

– Ümumiyyətlə, ayıya güllə atmağı xoşlamıram.

Bu zaman göy şiddətlə guruldadığı üçün qız lap bərkdən soruşdu:

– Vəhşi qaban necə?

– Qaban vurmuşam, – deyə oğlan hövsələdən çıxaraq, cavab verdi və qızın qayğısızlığına təəccüb edərək, ciddi ifadə ilə əlavə etdi:

– Tufan bərkiyəcək. Siz düşərgəyə tez çatmalısınız.

– Bəs siz? – deyə qız öcəşirmiş kimi gülümsəyərək soruşdu.

– Mənimlə işiniz yoxdur, – deyə oğlan sərt ifadə ilə cavab verdi. – Deyin görüm, sizin düşərgəniz Taya daşa yaxındır?

– Taya daş... Taya daş nədir?

Oğlan büsbütün əsəbiləşərək:

– Yaxşı, – dedi, – gəlin gedək...

– Hayana gedək?

– Bilmirəm. Hər halda, meşədə qalası deyilik ki...

... Və onlar yenidən şiddətlənən yağış altında yollarına davam etdilər.

... Oğlan plaşını çıxarıb qıza uzadaraq:

– Alın, geyinin, – dedi, – çimdiyiniz bəsdir.

– Yox... yox... lazım deyil. Mən, onsuz da, islanmışam. Özüm də soyuğa öyrəncəliyəm... Uşaqlıqdan üzgüçülüyə getmişəm.

– Siz üzgüçüsünüz?

– Bəli...

Və qız gülümsəyərək əlavə etdi:

– Hələ, desəniz, üzgüçülük üzrə Bakı çempionu da olmuşam. Leyla Cəfərzadə. Eşitməmisiniz?

– Yox... eşitməmişəm...

– Nahaq yerə.

Oğlan özünü saxlaya bilməyib, bərkdən güldü:

– Vallah, qəribə qızsınız...

– Siz də qəribə oğlansınız... Özünüz ovçu olduğunuz halda, ölkənin məşhur idmançılarından xəbəriniz yoxdur. Qəzet-zad oxumursunuz?

– Yox, oxumuram.

– Nə üçün? – Qız təəccüb etdi.

– Çünki bütün qəzetlər tutuquşu kimi eyni şeyi təkrar edirlər, – deyə oğlan yarızarafat cavab verdi.

– Bəs, dünyadan necə xəbər tutursunuz?

– Radio... Televiziya... Maraqlı jurnallar... kitablar...

... Onlar meşənin qurtaracağında sıldırım qayalardan ibarət bir təpəyə çatıb dayandılar.

Qayaların arası ilə üzüaşağı gurultulu sellər axırdı...

– Biz bu dağın o biri tərəfinə keçməliyik, – deyə oğlan irəlini nəzərdən keçirərək bərkdən səsləndi...

***

İliklərinə qədər islanmış Laçın çiynində dolu heybə, sel-suyun içi ilə yıxıla-qalxa irəliləyirdi...

... Və nəhayət, o bir qədər aralıdakı ağ çadırları görərək şən bir səslə oxudu:

Mənim adım – Sarı Laçın...
Gəl, səni götürüm qaçım,
Üçtelli... dördtelli,
Beştelli durna.

... Lakin Leyla qapıda görünmədi...

... Laçın çadırlarına çatıb, içəri daxil oldu. Leyla yox idi...

... Laçın tələsik heybəni və çiçəyi yerə ataraq, qapının ağzına gəlib çığırdı:

– Leyla!

... Laçın yüyürüb bir-bir çadırlara baxdı: heç kəs yox idi.

... Laçın hövlnak yüyürüb bulağın üst tərəfindəki qayaya çıxaraq, bərkdən çığırdı:

– Leyla!

... Bu zaman bellərində dolu heybə Mərdanla Elxan yoxuşu qalxaraq, ona çatıb dayandılar.

Onların paltarından su axırdı.

– Nə olub? – deyə Mərdan soruşdu.

– Leyla yoxdur.

– Necə yoxdur? – deyə Mərdan təəccüblə soruşdu.

– Mən iki saat bundan qabaq onu yola saldım ki, gəlib yeməkdən-zaddan hazırlasın...

Mərdan dedi:

– Yəqin qayanın daldalığına çəkilib, yağışın dayanmasını gözləyir.

– Yox, o, yağışa görə yolundan qalmazdı... – deyə Laçın qayadan yerə tullanaraq, uzaqlarda görünən meşəyə tərəf yüyürdü.

– Dayan, biz də gəlirik!.. – deyə Mərdan arxadan qışqırdı.

***

... Leyla ilə oğlan dağın başına çatıb dayandılar.

... Yağış hələ də yağırdı.

... Tez-tez şimşək çaxaraq aşağıları – sel-su içində olan yaşıl çölləri, meşələri işıqlandırırdı...

... Saçlarından su axan Leyla bu mənzərəni heyran-heyran seyr edərək:

– Necə gözəldir, – deyə həyəcanla səsləndi.

Oğlan əli ilə aşağıları göstərərək:

– Təxminən də olsa, düşərgənizin hansı tərəfdə olduğunu təyin eləyə bilmirsiz? – deyə soruşdu.

Qız şad və biganə ifadə ilə:

– Yox, – dedi.

Oğlan bilaixtiyar gülümsəyib başını buladı.

– Nə olub? – deyə qız maraqla soruşdu.

– Heç...

Qısa pauzadan sonra zarafatla əlavə etdi:

– Heç bilmirəm mənə rast gəlməsəydiniz, sizin halınız necə olardı...

– Yəqin ki, yorulub əldən düşəndən sonra bir yerdə yıxılacaqdım... Canavar da buyurub arxayın-arxayın məni yeyəcəkdi... Daha bu barədə baş sındırmağa dəyməz. Bir də siz hələ məni bir yana çıxarın, sonra öyünün...

– Bu da düz sözdür, – deyə oğlan gülümsədi. – Getdik...

– Getdik! – deyə qız təkrar etdi və üzüaşağı götürüldü.

– Nə edirsiniz? – deyə oğlan qışqırdı. – Dayanın!

Qız addımlarını yavaşıtdı. Oğlan ona çatıb:

– Belə yerlərdə, – dedi, – zarafat olmaz...

***

... Mərdan, Laçın və Elxan meşə ilə irəliləyərək həyəcan və təlaş içində qızı axtarırdılar. Laçın tez-tez əlini ağzına qoyub çığırırdı:

– Leyla, hey!..

Elxan əlini ağzına qoyub çığırırdı:

– Leyla, hey.

Mərdan qaşqabaqlı bir sükutla budaqları aralayıb, kolların qaranlıq diblərini... mağaraları nəzərdən keçirdi...

***

Oğlan ilə Leyla sıldırımlı dağ aşırımını enirdilər.

Artıq qaranlıq düşmüşdü.

Oğlan qabaqda gedərək yolu əl fənəri ilə işıqlandırırdı...

– Buralar yaman sürüşkəndi, diqqətli ol, – deyə oğlan çiyni üzərindən geri qanrıldı...

Və sanki qız bir an nəzərlərini yerdən çəkib ona baxdığı üçün nəyə isə ilişib yıxıldı...

Oğlan hövlnak geri döndü və əyilib qızın əlindən tutaraq:

– Eybi yoxdur, – dedi, – qalxın.

Qız oğlanın əlindən yapışaraq qalxdı. Lakin həmin anda da:

Oy... – deyib, yerə oturdu.

– Nə oldu? – deyə oğlan təşvişlə işığı onun üzünə saldı.

Qız ağrının şiddətindən üz-gözünü turşudaraq:

– Deyəsən, ayağım burxuldu, – dedi.

... Meşədə üç balaca işıq sürətlə ora-bura hərəkət edirdi və ara-sıra, Leyla hey! – deyə gah Laçının, gah da Elxanın səsi eşidilirdi...

Oğlan qaranlıqda əlini qıza uzatdı:

– Gəl, bir də yoxlayaq, – dedi.

Leyla onun əlindən tutaraq, qalxmağa çalışdı. Lakin ağrının şiddətindən dodağını bərk-bərk dişləyərək, yerə oturub, bir neçə saniyə gözü yumulu qaldı, sonra oğlana müraciətlə və qəti şəkildə dedi:

– Bilirsinizmi, nə var? Siz gedin. Əgər, bir şenliyə rast gəlsəniz, atdan-eşşəkdən tapıb, gəlib məni də apararsınız.

– Elə şey olmaz. Mən sizi burda tək-tənha qoyub gedə bilmərəm. Qalxın, məndən yapışın, siz bir ayaqlı, mən də iki ayaqlı, yavaş-yavaş gedək.

... Və o qızın qollarından tutub qaldırdı.

– Ağrıyan ayağınızı yerə asta qoyun.

Qız əli ilə onun çiynindən yapışdı... Sonra onlar yoxuşu enməyə başladılar.

Qız ağrının şiddətindən dodağını bərk-bərk sıxmışdı. Oğlan bunu hiss edirdi.

***

... Meşənin içində, balaca bir təpənin üstündə üç işıq bir-birinə yaxınlaşdı.

– Gərək mən axmaq onu tək buraxmayaydım... – deyə Laçın yana-yana dilləndi.

– Sən hardan biləydin ki, bir dəqiqənin içində elə tufan qopacaq, – deyə Elxan məyusluqla cavab verdi.

– Gərək biləydi, – deyə Mərdan papiros çıxarıb yandırdı. – Mən sizə demişdim ki, bu yerlərin havası dəqiqədə bir rəngə düşür. Görürsünüzmü, on dəqiqə bundan qabaq göy zülmət idi... Amma indi ulduz ulduzu çağırır.

Və o, papirosundan dərin bir nəfəs alaraq:

– Ancaq indi bu barədə gileylənməyin vaxtı deyil, – dedi. – Leyla düşərgəyə qərb tərəfdən gəlməli idi. Ona görə, biz də şərqdən qərbə doğru, ta meşədən çıxana qədər axtarışı davam etdirməliyik. Bir-birimizdən on beş-iyirmi addımdan çox aralanmamalıyıq.

***

... Qız uzaq dağın döşündə zəif bir işıq görcək sevinclə səsləndi:

– İşıq!..

Oğlan gözlərini yoldan çəkib baxdı.

Qız dedi:

– Qoyun mən burda oturum, siz gedin o işıq gələn yerdən...

– Olmaz! – deyə oğlan onun sözünü kəsərək, papiros çıxarıb yandırdı və bir nəfəs çəkəndən sonra zarafatyana dedi:

– Bu saat canavarın cavan qadın ətinə yerikləyən vaxtıdır...

... Onlar böyük çətinliklə irəliləyirdilər. Oğlanın üzündən tər axırdı.

... Birdən qız yerə çökərək:

– Yox, – dedi, – daha gedə bilmirəm.

... O zaman oğlan tüfəngini belinə keçirib, ani bir çeviklikləqızı iki qolu arasına alaraq yoluna davam etdi.

– Nə edirsiniz? – deyə qız oğlanın qolları arasında çırpındı. – Axı, siz də taqətdən düşmüsünüz... Qoyun yerə.

– Sakit! – deyə oğlan qəzəblə səsləndi.

Və bir neçə saniyə sonra qəribə bir mehribanlıqla əlavə etdi:

– Siz o qədər də ağır deyilsiniz.

Qız ona baxdı. Oğlan bu baxışları hiss etsə də, gözünü yoldan çəkmədi...

... Oğlan çətinliklə nəfəs alırdı.

– Məni qoyun yerə, bir az dincəlin, – deyə qız, sanki ən yaxın adamına müraciət edirdi.

Oğlan cavab verməyərək, yoluna davam edirdi. Onun üzündən sel kimi tər axırdı.

– Ayağınız çox ağrıyır? – deyə oğlan eyni mehriban ifadə ilə soruşdu.

– Sizin əziyyətiniz məni ayağımdan çox incidir, – deyə qız üsyankar ifadə ilə cavab verdi.

... Oğlan cavab vermədən yoluna davam edirdi.

Qız sağ əlini qaldırıb, oğlanın çılpaq boynundan tutaraq, gözlərini yumdu və elə bu zaman işıq gələn tərəfdə itlər hürüşdü. Sonra:

– Əyə, kimsən hey, – deyə qaranlıqdan soruşdular...

İtlər daha bərkdən hürüşdü.

Oğlan bərkdən cavab vermək istədi. Lakin nəfəsi çatmadı.

– Ə, niyə dinmirsən? – deyə səs təkrar eşidildi. – Kimsən, səsini çıxar! Yoxsa odladım...

Və qaranlıqda çaxmaq şaqqıltısı eşidildi.

O zaman oğlan qızı usdufca yerə qoyaraq, nəfəsini bir an dərdi:

– Yol azmışıq, – deyə batqın səslə cavab verdi. – Yaxın gəl, kömək elə!..

– Nəyə kömək eləyim? – deyə indi səs yaxından eşidildi və oğlan əl fənərinin işığını həmin tərəfə saldıqda, çiynində yapıncı, əlində beşatılan tüfəng olan cavan bir adamın dayanıb onlara baxdığını gördü və acıqlı bir ifadə ilə:

– Niyə durmusan, – dedi, – quldur-zad deyilik ki...

Çoban ehtiyatla yaxınlaşaraq:

– Bu qıza nə olub, ə? – deyə soruşdu.

– Bu oğlan, qızı yeddibaşlı divin tilsimindən qurtarıb qaçıranda yıxılıb, ayağı burxulub, – deyə qız cavab verdi.

– Necə? – deyə çoban təəccüblə səsləndi.

Oğlan belə bir vəziyyətdə zarafat eləyən qıza təəccüblü bir nəzər salaraq, əyilib onu yerdən qaldırdı... Sonra amiranə bir səslə çobana dedi:

– Düş qabağa...

... Çobanın balaca otağı fənər ilə işıqlanmışdı... Ortada ocaq yanırdı.

– Buyurun, – deyə çoban, onları özündən qabaq içəri buraxdı.

Oğlan qızı ocağın qırağındakı ayı dərisinin üstünə qoyaraq, dərindən nəfəs aldı.

– Deyəsən, yaman yorulmusan... – deyə çoban oğlana baxaraq, çayniki ocağın üstünə qoydu. Sonra qıza ötəri bir nəzər salıb soruşdu:

– Hansı ayağındır?

Qız sağ ayağını göstərdi.

Çoban bir anlıq tərəddüddən sonra, ocağın yanındakı kötüyün üstündə oturmuş oğlana müraciətlə:

– İzin versəydin, baxmaq olardı...

– Bəyəm başın çıxır? – deyə oğlan birdən-birə canlanaraq soruşdu.
– Bir az başım çıxır, mənim atam da, babam da sınıqçı olublar.
Qız ayağını irəli uzadaraq, – gəlin baxın, – dedi.
Lakin çoban yerindən tərpənməyərək, eyni tərəddüd içində oğlana işarə ilə:
– Əgər, – dedi, – yoldaşın razı olarsa, baxmaq olar...
Qız ayağının ağrısına baxmayaraq, bərkdən güldü:
– Yoldaşım qısqanc deyil, gəlin baxın, – dedi.
Oğlan ciddi ifadə ilə çobana dedi:
– Bax, görək nə olub?
... Çoban qızın çəkməsini, corabını usdufca çıxararaq, onun gözəl ayağını diqqətlə müayinə edirdi...
Oğlan qaşqabaqlı nəzərlərlə baxırdı.
Qız dodaqlarını bərk-bərk sıxaraq, ağrıya davam gətirməyə çalışırdı.
... Çoban qızın ayağına nə isə elədi. Qız bərkdən qışqırdı!
... Çoban qızın ayağını sarıyıb qurtarandan sonra:
– Qorxma, – dedi, – tez sağalar.
Sonra oğlana müraciətlə əlavə etdi:
– Ancaq beş-altı gün gərək uzansın.
– O... beş-altı gün... – deyə qız oğlana baxdı.
– Azı... – deyə çoban, nə üçünsə gülümsədi.
Sonra balaca taxta şkafı göstərib dedi:
– Orda çörək, pendir... çay, qənd də var... Mən gedirəm qoyunun içinə, siz pal-paltarınızı qurudun, rahatlanın.
Sonra qatlama çarpayıya işarə ilə dedi:
– O da mənim yorğan-döşəyimdir. Rəbiyə bu gün təzə döşəkağı, yastıqüzü göndərib... Heç hələ qatını da açmamışam...
– Rəbiyə arvadındır? – deyə qız maraqla soruşdu.
– Bəli, arvadımdır, – deyə çoban xəfifcə gülümsədi. – Özü də yeddi oğul, bir qız anasıdır. O “Vaqif”dəki küpəgirən qarı demişkən...
– Özünüz belə cavan... – deyə qız gülümsəyərək, cümləsini bitirmədi.
– Cavan deyəndə ki... siz deyən çox da cavan deyiləm. Otuz səkkiz yaşım var... Ancaq Rəbiyə ilə yarışa girmişik, o, uşaqların sayını artırmaqdadır, mən də qoyunların... görək axırı nə olur...
– Yaxşı yarışdır... – deyə qız bərkdən güldü...
– Gecəniz xeyrə qalsın, – deyə çoban qalxıb yapıncısını götürdü...
Qız soruşdu:
– Bəs, siz özünüz harada yatacaqsınız?

– Qoyunun içində.

Və gülümsəyərək əlavə etdi:

– Göydəki ağ buludlar yorğanıdır çobanın! Yadınızdadır, məktəbdə oxuyardıq...

... Çoban gedəndən sonra balaca otağa ani bir sükut çökdü. Hər ikisinin gözü çırtıltı ilə yanan ocağa zillənmişdi.

– Yamanca kələyə düşdük... – deyə, nəhayət, qız gözlərini ocaqdan çəkib oğlana baxdı.

– Bir kələyi yoxdur. İşdir olub, ancaq, sizinkilər indi yəqin ki, yaman təşviş içindədirlər.

– "Bizimkilər", – deyə Leyla zarafatyana cavab verdi, – ərimlə iki geoloq yoldaşımdan ibarətdir... Onlar da kişidirlər, dözərlər...

– Ata-ananız yoxdur?

– Heç kəsim yoxdur.

... Yeganə stəkanda qıza, dəmir dolçada da özünə çay tökdü...

... Sonra oğlan yorğan-döşəyə təzə yastıqüzü, təzə döşəkağı çəkərək:

– Bu lap ingilis kraliçasına layiq yer oldu, – dedi və qızın əllərindən tutaraq qaldırdı.

– Bəs siz? – deyə qız çarpayının üstündə oturaraq soruşdu.

Oğlan ocağın qırağındakı ayı dərisini göstərdi:

– Siz soyunun yatın. Mənə görə narahat olmayın, – dedi və qapıdan çıxdı.

... Qız soyunub paltarlarını ocağın yaxınlığındakı stolun üstünə sərərək, çarpayıya uzandı...

***

... Məcməyi boyda Ay üfüqdən qalxaraq, meşəli dağları, çölləri gümüş kimi işıqlandırdı.

... Oğlan yavaş-yavaş addımlayaraq, böyük ağıla yaxınlaşdıqda, itlər bərkdən hürüşdülər...

– Ay it! – deyə qədd-qamətli çoban ağılda yatışan qoyunların arasında göründü.

... Oğlan ilə çoban ağılın kənarında dayanmışdılar.

Çoban deyirdi:

– Düzü, mən meşənin o biri tərəfində olmamışam. Ona görə də, o yerlərə bələd deyiləm. Bu tərəflərdə də qızıl axtaranlara rast gəlməmişəm... Səhər açılsın, xeyir gəlsin...

Qısa sükutdan sonra çoban əlavə etdi:
– Aydın burda olsaydı...
Oğlan soruşdu:
– Aydın kimdir?
– Mənim çoban yoldaşımdır. Toy eləyəcək. Ona görə də, kolxozdan bir aylıq məzuniyyət götürüb.
– Tək sənin üçün çətin olar...
– Eybi yoxdur, – deyə çoban arxayınlıqla cavab verdi. – Sağlığına işimiz pis deyil. Keçən il hər qoyundan iki bala almışıq. Bu il də elə olacaq... Qoyun bərəkətli heyvandır. Camaatı yavanlıqdan korluq çəkməyə qoymur...
– Kəndiniz bura yaxındır?
– Yox... Yüz səksən kilometrdir, odur, o işıq gələn də bizim kolxozun binələridir.
– Sənə əziyyət verdik...
– Sağ olmuş, əziyyət nədir? O gün nazir də gəlib bura çıxmışdı. Deyir, Rəşid, bu yiyəsiz dağlarda darıxmırsan? Dedim, əşi, bu qədər dövləti (çoban əli ilə ağılda yatışan qoyun sürüsünü göstərdi) bəsləyən də darıxarmı...
"Eh..." deyə o, dərindən nəfəs aldı:
– Çobanın canı bu dağlardadır. Evə gedib çimirəm, təmizlənirəm, sağlığına televizorumuz da var, radiomuz da. Rəbiyə ipək yorğan-döşəkdən taxtın üstündə yer salır. Di gəl ki, bu qoyunun içində yatmağın ləzzətini vermir.
– Uşaqlardan məktəbi qurtaran var? – Oğlan döşündən asdığı tranzistoru qurdalaya-qurdalaya soruşdu.
– Var. Böyük oğlum keçən il universitetə girdi... Qız da bu il məktəbi qurtarır...
Bir qədər susduqdan sonra əlavə etdi:
– Qoy oxusunlar. Onlar ayrı cür yaşayacaqlar.
... Sonra çoban göyə baxaraq dedi:
– Radionu bir açsana. Konsertin vaxtıdır.
– Nədən bilirsən? – deyə oğlan soruşdu.
– Ulduzlardan.
Oğlan tranzistoru qurdu...
Aydınlıq içində olan dağlara, çöllərə qədim bir Azərbaycan mahnısı yayıldı.

... Oğlan sakitcə otağa daxil oldu.

... Qız çarpayıda şirin yuxuya getmişdi. Onun yarıya qədər çılpaq sinəsi aramla enib qalxırdı...

... Oğlan səs salmamağa çalışaraq, çırağı söndürüb, çəkmələrini çıxartdı... Sonra plaşına bürünüb, ocağın qırağındakı ayı dərisinin üstünə uzandı.

... Murov dağlarının yiyəsiz ətəklərində bütün insanlardan uzaq üç nəfər yuxuya getmişdi.

... Çoban, yapıncısına bürünərək başını iri qoçun quyruğu üzərinə qoyub, qoyunların arasında yatmışdı...

... Artıq sönməkdə olan ocağın zəif ziyası oğlanın üzünü və qızın yarıaçıq sinəsini işıqlandırırdı.

***

... Qalın meşənin ortasında alovlanan böyük ocağın qırağında üç nəfər oturmuşdu.

... Mərdan kürəyini iri palıda söykəyərək yuxulamışdı...

... Elxan gözlərini ocağa zilləyərək xəyala getmişdi...

Laçın dalbadal papiros çəkərək, diqqətlə meşədən gələn səsləri dinləyirdi...

... Ay yavaş-yavaş dağların arxasına enirdi...

... Bir qırqovul xoruzu qanadlarını çırparaq, yarpaqlar arasından başını çıxarıb, günəşin üfüqdə lalətək qızaran ilk işığına baxdı.

***

... Sanki qız balaca pəncərədən üzünə düşən günəş işığından diksinərək gözlərini açıb, ocağın üstündə çay dəmləyən oğlanı gördü... Və oğlanın günəşdən, ayazdan yanmış sərt çöhrəsi onun nəzərləri qarşısında qəribə bir aydınlıqla böyüdü...

– Yaxşı yatdınız?

... Qız cavab verməyərək, ona baxıb gülümsəyirdi...

– Niyə gülürsünüz? – oğlan soruşdu.

– Gecə sizi yuxuda görürdüm.

– Nə cür?

– Görürəm ki, bulağın yanındakı qayanın üstündə bir ayı durub bizə baxır. Mən, “Vur o ayını” deyə qışqırıram. Siz isə, qaşqabağınızı

töküb, cavab vermirsiniz... O zaman mən, sizi qollarınızdan tutub bərk-bərk silkələyirəm... Siz dinmirsiniz ki, dinmirsiniz...

– Sonra nə oldu?

– Daha heç nə xatırlamıram...

Sonra qız təkrar gülümsəyərək soruşdu:

– Siz həmişə belə qaşqabaqlı olursunuz?

– ... Bilmirəm... O barədə mənə bir söz deyən olmayıb. Məgər, mən qaşqabaqlıyam?

– Yox, yaman üzügülərsiniz... – deyə qız elə təbii üsyankarlıqla cavab verdi ki, oğlan özünü saxlaya bilməyib gülümsədi.

... Çoban içəri girib, his basmış badyanı oğlana uzatdı:

– Al bişir. Yoldaşın içsin. Qara qoyundan sağmışam.

Qız şaqqıltı ilə gülərək dikəlib oturdu.

Çoban gülümsəyib:

– Bacı, – dedi, – Molla Nəsrəddin demişkən, deyəsən, işin düzəlib, gülürsən...

– Necə məgər? – deyə qız heç də pərt olmayaraq soruşdu.

– Demək istəyirəm ki, deyəsən, ayağın incitmir...

– Az-az ağrıyır, – deyə qız yorğanı sarıqlı ayağının üstündən kənara çəkdi.

– Bu saat ona da əncam çəkərik... – deyə çoban çuvaldan balaca ləyənə bir ovuc un qoydu.

... Çoban qızın ayağını açaraq, yenidən diqqətlə nəzərdən keçirdi.

– Görürsənmi – topuğunu oğlana göstərdi – burada balaca şiş var.

... Sonra çoban həmin undan düzəltdiyi təpitməni usdufca qızın topuğuna qoyub sarıdı:

– Bu, ağrısını da, şişini də çəkəcək... Ancaq, hələlik, bu ayağını yerə lap usdufca qoy...

Sonra çoban dikəlib:

– İndisə, – dedi, – məni bağışlayın, qoyunu örüşə aparıram...

Və o, balaca şkafdan çörək-pendir götürüb:

– Xahiş edirəm özünüzü öz evinizdəki kimi hiss eləyəsiniz, – dedi və otaqdan çıxdı.

Qız oğlana baxıb:

– Bilirsiniz, – dedi, – bayaq nəyə gülürdüm? Çobanın sizi mənim həyat yoldaşım hesab eləməyinə...

Oğlan ciddi ifadə ilə cavab verdi:

– Bayıra çıxmaq istəyirsiniz?

– İstəyirəm.

... Oğlan qızın qoluna girərək, otaqdan çıxartdı...

... Bayırda yamacları, çölləri bürüyən lalələr, sarı çiçəklər yaz günəşinin brilyant kimi parlaq işığı altında alışıb-yanırdılar...

... Lap uzaqlarda çobanın qoyunları göbələk kimi dağın döşünə səpələnmişdi.

Oğlan, qızı qayadan qaynayıb çıxan bulağın yanına gətirərək: – Siz yuyunun, – dedi, – mən gedim südü qaynadım. Qurtaranda səsləyərsiniz.

– Oldu... – deyə qız cavab verdi.

Oğlan çevrilib otağa doğru addımladı... Qız onun ardınca baxdı...

... Qız ilə oğlan balaca stolun ətrafında oturub, səhər yeməyi yeyirdilər. Qabaqlarında çörək-pendir, yağ və süd var idi.

– Mən yeddi arxa dönənlərimizin hamısının adlarını sizə dediyim halda, siz nə üçün öz adınızı, nə işlə məşğul olduğunuzu demirsiniz?

– Adım ovçu... Özüm ovçu! – deyə oğlan zarafatyana cavab verdi.

Sonra süddən bir qurtum alaraq:

– Siz uzanarsınız, – dedi, – mən də gedib yoldaşlarınızı axtararam. Bəlkə bir şey çıxdı...

– Yox... yox... mən burda tək qala bilmərəm. Bir də ki, siz, onsuz da, mənim üstümdə az əziyyət çəkməmisiniz... Əgər, yaxşı yoldaşlardırsa, qoy onlar məni axtarıb tapsınlar...

– Onlar sizi axtarıb tapanacan, ərinizdə can qalmaz...

– Can qalar... – deyə qız başını tərpətdi. – Yoxsa ki, kişilərə etibar var...

– Nə üçün kişilər sizin nəzərinizdə belədirlər...

– Siz zarafat eləyirsiniz... Amma mən yox...

– Görünür, sizin, nə isə, ciddi bir narazılığınız var...

– Biz çox şairanə bir eşq macərası ilə evlənəndən iki ay sonra, ərim, tez-tez bizə gəlib-gedən bir rəfiqəmə eşq elan eləmişdi...

– Bəs, sonra nə oldu?

– Sonra o, and içib, məni inandırmağa çalışdı ki, guya, hissə qapılıb, səhv eləyib... Mən də onu bağışladım.

Oğlan qaşqabaqlı halda dedi:

– Madam ki, bağışlamısınız, daha o əhvalatı xatırlamaq lazım deyil.

– Mən ərimi ona görə bağışlamadım ki, ona inandım. Əksinə, onun xəyanəti (əgər, o hərəkəti xəyanət adlandırmaq düzgündürsə) məni başa salmışdı ki, əbədi məhəbbət... filan... boş sözdür... nağıldır...

– Hər halda, insanların yaxşı arzularından doğan nağıldır... Ona görə də, boş söz deyil.

Qız istehzalı təbəssümlə:

– Bilirsinizmi, – dedi, – belə-belə romantikanın Yer planetilə vidalaşdığı vaxtdan çox sellər... sular axıb gedib.

... Sonra qız zədələnmiş ayağına işarə ilə:

– Deyəsən, çoban qardaş çox bərk bağlayıb, bəlkə sarığı bir az boşaldasınız, incidir...

Oğlan sarığı açıb, yenidən bağlayırdı. Qızın çılpaq qılçı həddindən artıq cazibədar idi.

... Qız cavan oğlanın hər bir hərəkətini, üzünün ifadəsini qəribə bir maraq və diqqətlə izləyirdi.

... Və oğlan bunu hiss edirdi...

– Ağrımır? – deyə, nəhayət, o, gözünü sarıqdan çəkməyərək soruşdu.

– Bilmirəm... – deyə qız gülümsəyərək müəmmalı cavab verdi. – Hiss eləmirəm...

Oğlan sarığı bağlayıb sərt səslə:

– Uzanın, – dedi.

Qız jaketini çıxararaq arxası üstə çarpayıda uzanıb çılpaq qollarını başının altında çarpazladı. Onun çöhrəsi, boğazı, sinəsi kamil bir gözəllik nümunəsi idi. Onun üzündə meydan oxuyan bir təbəssüm vardı.

Oğlan papiros çıxarıb yandırdı... Qız dedi:

– Özünüz haqqında danışmırsınız, danışmayın... Heç olmazsa, deyin görüm evlisiniz?

– Evliyəm... – deyə oğlan quru ifadə ilə təsdiq etdi.

– Yəqin ki, arvadınız çox gözəldir.

– Nədən bilirsiniz?

– Özünüz bu qədər gözəlsiniz, məlumdur ki...

Oğlan darıxırmış kimi onun sözünü kəsdi:

– Mən kişini gözəl adlandırmağı xoşlamıram, – dedi.

– Xoşlasanız da elədir, xoşlamasanız da... – deyə qız qəhqəhə ilə güldü.

– Yaxşısı budur, – deyin görüm nahara nə hazırlamağı əmr edirsiniz? Kəklik bulyonu, yoxsa qırqovul kababı?

– Ovladığınız quşları bişirib qurtararıq, sonra xanımınız acıqlanar.

– Acıqlanmaz. Mənim xanımım siz düşünən kimi darürəkli deyil, – deyə ovçu qaşqabaqlı cavab verdi. – Bağışlayın, mən zarafat elədim.

– Uşaqlar, gəlmək olar? – deyə çobanın bayırdan səsi eşidildi.

Qız jaketini tələsik əyninə geyəndən sonra:

– Gəl, – dedi.

Çoban ovladığı əliyi yerə qoyub:

– İndicə vurmuşam, – dedi.

– Harda? – deyə qız həyəcanla səsləndi.

– Sürünü meşəyə tərəf aparırdım, qəfil çıxdı qarşıma.

– Nə üçün vururdun?

– Nə təhər, yəni, nə üçün vururdum? – deyə çoban təəccüblə qıza baxdı.

– Gör necə gözəldir, – deyə qız heyranlıqla güllə dəymiş əliyə baxırdı...

– Bilmirsən ki, qadın tayfasının ürəyi nazik olur? – deyə oğlan gülümsədi.

Çoban qıza baxaraq:

– Bizim arvadlar elə deyil, – dedi.

Sonra əlavə etdi:

– Sürü yiyəsizdir, mən qaçdım...

Sonra çoban, oğlandan soruşdu.

– Soymaq əlindən gəlir, yoxsa, mən soyum?

– Əlimdən gəlir.

... Qız oğlana dedi:

– Mən siz düşünən qədər də ürəyinazik deyiləm... Məsələn, əgər, çoban pələng vursaydı, mənə ləzzət eləyərdi... Əlik isə, yazıq, köməksiz heyvandır.

Oğlan zarafatyana bir ifadə ilə:

– Yaxşısı budur, – dedi, – mən əliyi soyum, doğrayım...

– Kobud!!! – deyə qız anlaşılmaz bir qəzəblə səsləndi.

Oğlan gülümsədi:

– Ovçu kobud olmasa, o qədər qan tökə bilməz.

– Xahiş edirəm istehzanızı saxlayasınız, özünüzə lazım olar.

Görüşdüklərindən bəri, birinci dəfə olaraq, oğlan qəhqəhə ilə güldü. Qız ona məzəmmətlə baxaraq:

– Demək, məni yandırıb-tökməkdən ləzzət alırsınız?

Oğlan eyni şən əhvali-ruhiyyə ilə:

– Axı, – dedi, sizin yanıb-tökülməyiniz üçün heç bir əsas yoxdur...

Qız sanki birdən yuxudan ayılaraq, ovçuya ani bir nəzər salıb, üzünü pəncərəyə sarı çevirdi.

... Oğlan əliyi stolun üstünə qoyub, ov bıçağı ilə dərisini qarnından ta boğazına qədər cıraraq, mehriban ifadə ilə dedi:

– Bu saat xəstəmiz üçün elə bir kabab bişirəcəyəm ki, yeyən kimi ayağı sağalsın.

Lakin qız onu eşitmirdi...

***

... Böyük qoyun sürüsü dağın döşünə yayılıb otlayırdı.

... Çoban Rəşid, təzəcə doğulmuş quzunun yerə çökərək, anasını necə acgözlüklə əmməsinə baxırdı.

... Birdən itlər hürüşüb üzüaşağı götürüldülər.

– Ay it, ay it! – deyə çoban qalxıb, onların ardınca yüyürdü.

... Büsbütün yorulub əldən düşmüş Laçın, Mərdan və Elxan ona çatıb dayandılar.

Çoban soruşdu:

– Kimsiniz?

Mərdan dedi:

– Mühəndisik, srağagünkü tufanda bir qız yoldaşımızı itirmişik. Bəlkə görmüş olasan...

– Xeyr, rast gəlməmişəm. O axşam mənim dəyəmə cavan bir ər-arvad gəlib çıxıb. Onlar da tufana düşüb azıblar...

– Ər-arvad? – deyə Laçın məyus halda soruşdu.

– Bəli, ər-arvad, yazıq qız da yolda yıxılıb, ayağı sərpib, dəyədə yatır.

Mərdan:

– Haradan gəlib, hara gedirlər?

– Soruşmamışam. Qonaqdırlar.

Mərdan yoldaşlarına dedi:

– Gedək onları görək. Bəlkə bir şey bildilər.

Sonra Mərdan çobandan soruşdu:

– Dəyən hardadır?

– Odur ey, o şiş dağın altında...

***

... Oğlan bişirdiyi kababları gətirib qızın qabağındakı boşqaba çəkdi:

– Yeyin.

Qız istehza qarışıq bir təbəssümlə dedi:

– Siz məni lap İran şahzadəsitək bəsləyirsiniz...

Oğlan gülümsədi:

– Neyləyək, borcumuzdur...

– Borcunuz olmasaydı, bəsləməzdiniz?

– Məni elə dərinliklərə çəkməyin...

– Dərinliklərə getməkdən qorxursunuz? – deyə qız götürdüyü tikəni hələ də barmaqları arasında tutaraq soruşdu.

– Qorxuram... – deyə eyni zarafatla davam etdi. – Dərinlik çox zaman qaranlıq olur... O qaranlıqda da bizi nə gözlədiyini bilmirik.

– Zənnimcə, siz qorxaq deyilsiniz...

– Bilirsinizmi, – deyə oğlan bu dəfə zarafatmı, ciddimi olduğu məlum olmayan bir ifadə ilə dedi, – qorxaqlıq da qəhrəmanlıq, cəsarət kimi çox mürəkkəb məsələdir... Ona görə də, kababı soyutmayın...

Qız dərindən nəfəs alaraq:

– Gəlin siz də oturun, – dedi.

– Bu saat, – deyə oğlan ocaqdakı şişləri çevirərək, gəlib qızla qabaq-qabağa oturdu.

Qız dedi:

– Ömrümdə belə ləzzətli kabab yeməmişəm.

– “Bir” – sizdə! – deyə oğlan gülümsədi.

– Nə üçün?

– Bayaq çobanın əliyi vurmağına təəssüf edirdiniz... Amma indi o günahsız heyvanın kababından ləzzətlə yeyirsiniz.

– Bir halda ki, həyat anlaşılmaz ziddiyyətlərdən ibarətdir... biz neyləyə bilərik...

– Siz bu yaxşı tikəni götürün, özünüz də o barədə narahat olmayın. Vaxtı gəldikdə, ziddiyyətlər aydınlaşır, bütün sirlərin tədriclə açılması həyatın gözəl qanunlarından biridir.

Qız oğlanın göstərdiyi tikəni yeyə-yeyə zarafatla dedi:

– Bütün ziddiyyətlərin sirri açılsa da, sizin rəftarınızdakı ziddiyyətlərin sirri açılmaz.

Oğlan səmimi təəccüblə soruşdu:

– Siz mənim rəftarımda nə ziddiyyət görürsünüz?

Qız cəsarətlə davam etdi:

– Nə üçün siz mənim üstümdə iş-gücünüzü buraxıb, bu qədər əziyyət çəkirsiniz? Siz məni ölümdən qurtararaq, bura gətirib çıxarandan sonra çobana tapşırıb, gedə bilərdiniz...

– Mən çobanın necə adam olduğunu bilmirdim. Ona görə də, sizi ona tapşırıb gedə bilməzdim...

– Siz özünüzün necə adam olduğunuzu bilirsiniz?

– Şübhəsiz.

– Sizə nə dəxli vardı ki, çoban mənimlə necə rəftar edəcəkdi?

– Dəxli var idi! – deyə oğlan sərt ifadə ilə cavab verdi. – Aydındırmı?

– Deyəsən, aydındır... – deyə qız dərindən nəfəs aldı.

... Bir-birilərinin ardınca gənc geoloqlar dəyəyə daxil olub, təəccüb içində dayandılar. Qız isə, heç bir təəccüb və həyəcan əlaməti duyulmadan gülümsəyib:

– Xoş gördük, köhnə dostlar... – dedi, – özünüzü yaxşı yerə vermisiniz... Biz əliyin kababına təzə başlamışıq... Sizi də yaman saqqal basıb. Gərək ki, mənim yox olduğumun üçüncü günüdür. Necəsən, Laçın?.. Saqqal sənə nə yaxşı yaraşır.

Sonra qız oğlana:

– Tanış olun, – dedi, – bu mənim həyat yoldaşımdır, bunlar da dostlarımız.

Oğlan əvvəl Mərdanla, sonra da Elxanla əl tutuşdu. Sonra gözlərini qəzəblə qıza zilləmiş Laçının münasibətini hiss edərək, ona əhəmiyyət vermədən:

– Siz əyləşin, – deyə Mərdanla Elxana müraciət etdi, – mən də kababın işinə baxım.

Və oğlan ət çəkilmiş şişləri götürüb bayıra, ocağın yanına getdi.

– Bu kimdir? – deyə Laçın buz kimi soyuq ifadə ilə soruşdu.

Leyla ona uzun bir nəzər salaraq:

– Mənim xilaskarım! – deyə sakit təbəssümlə cavab verdi. – Sən ona təşəkkür elə!..

– Üç gün səninlə bu otaqda qaldığına görə?

Leyla eyni sakitliklə:

– Yox, – dedi, – məni ölümdən qurtardığına görə, o qiyamətdə məni yeddi-səkkiz kilometr qucağında gətirib, bura çıxardığına görə... Üç gündən bəri gecə-gündüz mənə xidmət elədiyinə görə... Aydındır?

– Aydındır! – deyə Laçın kəskin istehza ilə cavab verərək, papiros çıxarıb yandırdı. – Çobanın nə üçün sizi ər-arvad adlandırdığı da aydındır...

Leyla qəhqəhə ilə gülərək dedi:

– Çobanın səhvini zarafata salırdıq... Ona görə də, həqiqəti açıb demirdik...

– Bəsdir, – deyə Laçın hiddətlə qışqırdı. – Xalqı uşaq yerinə qoyma.

– Yaxşı, – deyə Mərdan qaşqabaqla Laçına baxdı. – Məşədi İbad kimi o saat özündən çıxma görək...

... Leyla, Mərdan, Elxan və oğlan bayırda dayanmışdılar.

Oğlan balaca tranzistoru qıza uzadaraq:

– Rica edirəm, – dedi, – bunu verin çobana, deyin ki, ona bağışlayıram.

... Leyla gözləri ona dikilib qalmış olduğu halda, tamamilə qeyri-şüuri bir hərəkətlə tranzistoru alıb, boynuna aşırdı.

... Sonra oğlan onlara xəfifcə baş əyərək:

– Sağ olun... – deyib sürətli addımlarla getdi.

– Dayanın! Bir dəqiqə... – deyə Leyla arxadan qışqırdı.

Oğlan ayaq saxlayıb geri döndü. Leyla axsaya-axsaya ona çataraq, qollarını boynuna dolayıb, hər iki üzündən öpdü:

– İndi gedin...

Oğlan gedir... Leyla baxırdı...

– Məndən xanımınıza salam yetirin... – deyə Leyla təkrar arxadan qışqırdı, – deyin, mən ona həsəd aparıram, eşidirsinizmi, həsəd!

Oğlan qanrılıb əlini havada yelləyərək, yoluna davam etdi.

Və o, qayanın arxasına burulub, görünməz olduqda, Laçın hələ də oğlanın ardınca baxan Leylaya yaxınlaşıb soruşdu:

– Nə üçün onun arvadına həsəd aparırsan? Gözəl oğlan olduğuna görə?

– Yox, – deyə qız sakit ifadə ilə cavab verdi. – Həqiqi kişi olduğuna görə!

Və o çevrilib ağır addımlarla Laçından uzaqlaşdı...

*1972*

## DAŞ HASAR

Firəngizi heç bir şey təzə bir pyesin primyerası, ya tərifi yayılmış təzə bir roman, ya yeni açılmış bir rəsm sərgisi qədər maraqlandırmırdı. Belə hadisələr həmişə onda bir bayram əhvalı yaradırdı. O, məşhur kino artistlərinin, məşhur rəssamların, dəbdə olan yazıçıların adlarını, tərcümeyi-hallarını əzbər bilirdi. Xüsusən də müasirlərin. Əlbəttə, bunların sənətindəki gözəlliyin mahiyyəti ona məlum deyildi. Bu barədə düşünmək heç onun ağlına da gəlmirdi. Amma o, bu sənətdəki yeni ruhu (əgər, bu var idisə), yeni maneranı hiss edirdi və bu ona fövqəladə dərəcədə cazibədar görünürdü. Bu cazibədə bir fərəh, bir irişilməzlik vardı. Bir yaz gözəlliyi vardı. Ya mənasını dərk edə bilmədiyi adi bir pərişanlıq vardı. Elə pərişanlıq ki, bəzən onun ürəyini nəhayətsiz, lakin qəmgin yüksəkliklərə aparırdı. Belə anlarda onun məftunluğunun həddi-hüdudu yox idi. Orta məktəbdə oxuduğu zamanlar o, şirin xəyallara dalardı. Kaş, o da məşhur bir rəssam, ya Jorj Sand kimi, Merdok kimi bir yazıçı olaydı. Eh... heç kəs bilmirdi ki, o, məsələn, Konsuelanın, ya Romeo və Cülyettanın iztirablarını nə qədər dərindən hiss etmişdi. Nə qədər ürək yanğısı ilə yaşamışdı... Və məhz belə dəqiqələrdə onun kədərinin gözəlliyini heç nə əvəz etməzdi...

Lakin orta məktəbin son sinfində qız dərin bir kədərlə dərk elədi ki, ondan nə rəssam olar, nə bəstəkar, nə yazıçı. Bəlkə... bəlkə artist olaydı. O, güzgünün qarşısında dayanaraq özünə tamaşa edirdi. Boy-buxun, orijinal gözəllik, zəriflik. O, ata-anasının narazılığına baxmayaraq, İncəsənət İnstitutunun aktyorluq fakültəsinə ərizə verdi və... kəsildi. İmtahan götürən müəllim eyhamla andırdı ki, aktyorluq üçün lazım olan cəhətlər onda yoxdur. Qız o qədər sarsıldı ki, heç olmazsa, bu cəhətlərin nədən ibarət olduğunu soruşub bilmək ağlına da gəlmədi.

... O, bir neçə ay bekar gəzdi... Əlbəttə, təzə filmlər, primyeralar tez-tez olmurdu. Firəngiz darıxırdı.

Atası iyirmi beş ildən artıq idi ki, statistika idarəsində işləyirdi. Bir gün qızına dedi ki, bekar gəzmək yaxşı deyil, öz idarəmizdə sənə balaca bir iş düzəldək, gir, işlə. Anası da bu fikrə şərik çıxdı:

– Onsuz da, – dedi, – gələn il ali məktəbə girmək üçün sənə iş barədə kağız lazım olacaq.

Və qız, istər-istəməz, statistika idarəsində işə girdi. Ah, bu statistika idarəsi... Bu rəqəmlər... Sarımtıl kağızlar... Daşlarının rəngi getmiş məhsəbələr... Hər biri otuz-qırx il işləyən yaşlı mühasiblərin eynək

arxasından adama dikilən soyuq baxışları... Ucuz kolbasa ilə çay içən yaşlı qadınların kobud fincanları... Saçlarını rəngləyən müdirin iyirmi il bundan qabaqkı dəbdə olan solğun qalstuku...

... Gələn yay Firəngiz universitetin filoloji fakültəsinə ərizə verdi. Fikirləşdi ki, nə qədər də olsa, incəsənətə yaxın sahədir. Bəlkə... bəlkə təzə ruhlu müasir bir tənqidçi oldu.

Ancaq hələ orta məktəbdə oxuduğu zaman bərk zəhləsi getdiyi qrammatikadan olan sualların heç birinə cavab verə bilmədi və kəsildi...

Və birdən öz taleyi onu qorxutmağa başladı. Bu qorxu onun gözəlliyini gözündən salırdı. Həyata qarşı onda anlaşılmaz bir yadlıq, bir şübhə baş qaldırdı. Lakin, bununla belə, o özünü ləyaqətlə aparmağı bacaran bir qız idi. Sözsüz-hərəkətsiz təmiz ailədən idi.

Ordan-burdan elçilər gəlirdi. Telefon zəngləri olurdu. Lakin qız hamısını rədd edirdi. Bu da, xüsusən anasını əsəbiləşdirirdi. "İllər keçir..." deyə arvad deyinirdi. Firəngiz də cavab verirdi ki, "mən ali məktəbi qurtarmayınca ərə getməyəcəyəm".

Ancaq qızın, elçiləri rədd etməsinin əsl səbəbi bu deyildi. Məsələ orasında idi ki, onu istəyən oğlanların biri iqtisadçı, biri baş mühasib, biri riyaziyyat müəllimi, biri, nə bilim, kim idi. Bu adamların hamısı da ona yabançı görünürdü. Onların içində yaraşıqlı olanları, necə deyərlər, həyatda özlərinə möhkəm yer tutanları da var idi. Lakin onlar qıza tamam yabançı idilər.

... Nəhayət, o, ata-anasının təkidi ilə və yenə də, istər-istəməz, Xalq Təsərrüfatı İnstitutunun gecə şöbəsinə daxil oldu. İndi o, gündüzlər sevmədiyi statistika idarəsində işləyir, gecələr sevmədiyi institutda oxuyur və yenə hər dəfə güzgüdə öz gözəlliyinə tamaşa eləyəndə həsrətlə yazıçı haqqında, rəssam haqqında, bəstəkar haqqında düşünürdü.

O, yenə də incəsənət xəbərlərini acgözlüklə izləyirdi, yeni sərgilərin, yeni tamaşaların heç birini buraxmırdı, yazıçıları, şairləri, rəssamları, artistləri yaxından görüb-tanımaq üçün, fürsət düşdükcə, onların yığıncaqlarına, iclaslarına gedirdi. İndi onun ürəyində hamıdan gizli saxladığı yeni bir arzu da baş qaldırmışdı: indi ki, onun özünə incəsənət qismət olmadı, heç olmasa... ah, heç olmasa, əri o aləmdən olaydı. Qız heç vəchlə ürəyini o sehrli aləmdən qopara bilmirdi. O aləmdən ayrılmaq ona həyatdan, dünyanın ecazkar gözəlliklərindən ayrılmaq kimi gəlirdi.

Və tale bu dəfə ona yar oldu, qız bir toyda bir qədər aralıdakı stolda ultra dəbdə geyinmiş, qabaqdan seyrəlməkdə olan saçlarını arxadan xeyli uzatmış, barmağına iri platin üzük taxmış bir oğlan görüb pıçıltı ilə yanındakı qızdan soruşdu ki, kimdi o?

Qız, oğlana ötəri bir nəzər salıb cavab verdi ki, toy yiyəsinin qohumu, rəssam Mürşüddür.

Bu rəssam, xalq arasında məşhur olmasa da, Firəngiz, bayram təntənələrində, rəsmi yığıncaqlarda oxunan və ya çap olunan siyahılarda onun adına rast gəlmişdi. Muzeylərdə, sərgilərdə bəzi rəsmlərini də görmüşdü. Doğrudur, bu rəsmlər onda elə bir təsir oyatmamışdı. Ancaq nə olsun? Pikassonun da tablolarını çox adam başa düşmürdü. Bəlkə, Mürşüdün də əsərlərində elə sirlər var ki, Firəngiz, ya başqaları onu dərk eləyə bilməyib yanından soyuq keçirlər.

Mürşüd, qızdan azı iyirmi yaş böyük idi, ancaq nə olsun ki, məşhur dramaturq Onilin qızı Una əlli altı yaşlı Çarli Çaplinə ərə gedəndə on yeddi yaşında idi. Pikassonun arvadı özündən nə qədər kiçik idi...

Mürşüd elə bir yaraşıqlı adam deyildi, ancaq rəssamlığı qızın gözündə ona orijinal bir görkəm vermişdi. Barmağındakı qara qaşlı iri platin üzük qıza əsrarəngiz təsir bağışlayırdı. Köynəyi, qalstuku da heç kəsinkinə bənzəmirdi. Toydakı kişilərin hamısı kostyumda olduğu halda, o, yaşıl məxmər şalvarla, şabalıdı, tumac pencək geymişdi. O, demək olar ki, heç nə yemirdi. Elə hey konyak içir, siqaret çəkir və Firəngizə baxırdı. Ona müraciət eləyən adamlara qarşı üzündə elə bir təbəssüm yaranırdı ki, elə bil, o, bu təbəssümü ilə sənə böyük bir iltifat göstərirdi. Elə bil, bu toya gəlişi ilə hamını şərəfyab etmişdi. Bütün bunlar da Firəngizə hədsiz dərəcədə yeni və maraqlı görünürdü. Rəssamın mərhəmətli baxışları altında qız bilmirdi neyləsin. Qız fərəh və səadət içindəydi. Qız rəssamın gözlərinə baxmağa cəsarət eləməsə də, bütün fikri onun yanında idi. Onun bütün hərəkətlərini görürdü...

Sonra qəribə bir hadisə oldu. Toy sovuşub, adamlar foyedə paltolarını alanda, rəssam, qıza yaxınlaşıb, tamam bir açıq-saçıqlıqla pıçıldadı:

– Xahiş edirəm, mənə zəng eləyəsiniz...

Ancaq o, telefon nömrəsini vermədi. “Yəqin, bilir ki, onun nömrəsini tapmaq asandır” deyə qız ürəyində gülümsədi... O gecə uzun zaman gözünə yuxu getmədi. Səhər dərin bir həyəcan içində Mürşüdə zəng elədi. Hər şey sürətlə həll edildi və iki aydan sonra toyları oldu.

Qız göyün yeddinci qatındaydı. O, rəssamlar haqqındakı xəbərləri böyük maraqla izləyir, qəzetlərdə, radioda, televiziyada eyzən nişanlısının adını axtarır, rast gəldikdə, sevinclə ata-anasına xəbər verirdi. Ərinin emalatxanasını özü səliqəyə saldı. Elektrik çayniki, armudu stəkan, zərif nəlbəki, gümüş çay qaşığı, təmiz əl-üz dəsmalı, ətirli sabun qoydu. Balaca stolun üstünə kraxmallanmış süfrə saldı... Lakin Mürşüdün bu işdən xoşu gəlmədi, yarım saatın içində emalatxananın əvvəlki səliqəsizliyini bərpa etdi və qız bundan heç bir şey başa düşmədisə də, səbəbini soruşmadı, yəni, bunu soruşmaq heç onun ağlına da gəlmədi. Qız özünü xoşbəxt sayırdı. Düzü, qız ərinin rəssamlığı ilə o qədər məşğul idi ki, öz səadəti haqqında düşünməyə vaxtı çatmırdı... Onun işləməyinə sevinclə tamaşa edir, yarımçıq rəsmlərin tez çəkilib qurtarması üçün tələsirdi. Bir dəfə o, statistika idarəsindən işdən çıxmaq istədiyini bildirdi.

Mürşüd dedi:

– Niyə? Ayda yüz manat çölə tökülməyib ki...

Qız bunu ürəyinə salmadı. O, evlərində, idarələrində elə hey Mürşüdün rəsmlərindən danışırdı, özü də o qədər həvəslə danışırdı ki, qulaq asanların üzündə yaranan biganə təbəssümün fərqinə də varmırdı. Bir dəfə emalatxanada ərinin işləməyinə tamaşa edərkən dedi:

– Bu gün qızlar Nərimanın təzə rəsmlərini yaman tərifləyirdilər.

Əri soruşdu:

– Hansı qızlar?

– Nərminə, Turac, Şəfiqə...

(Bunlar Firəngizin yoldaşları idi. Ultra dəbdə geyinən Firəngiz kimi, heç bir primyeranı, heç bir təzə konserti buraxmayan, məşhur artistlərin adlarını, həyatını əzbər bilən şən qızlar idi və Mürşüd onları tanıyırdı.)

– Onlar tərifləyərlər... – deyə Mürşüd gözünü işindən çəkməyərək cavab verdi.

Və Firəngiz ərinin sözlərindəki istehzanı başa düşdü və bu, onun xətrinə dəydi, o, ilk dəfə olaraq, ərinə etiraz etdi:

– Onlar çox mədəni qızlardır, Mürşüd.

– Baxır necə mədənidilər, – deyə Mürşüd gülümsədi.

Firəngiz dinmədi. Firəngizə elə gəldi ki, bu təbəssüm ərini birdənbirə xeyli yaraşıqsız göstərdi.

Havalar isti keçdiyindən qərara aldılar ki, bağa köçsünlər. Firəngiz buna çox sevindi. Yayda Bakı bağları onun ən çox xoşladığı yerlər idi. O, bu bağların xüsusən axşamlarını, gecələrini yaman sevirdi. Heç bir yerin sərinliyi Bakı bağlarının sərinliyi qədər ona ləzzət vermirdi. Hər yer ona Bakı bağlarının qurtaracağından başlayan dənizin mavi genişliyi kimi nəhayətsiz görünmürdü. Elə bil ki, bu genişlikdə ömrün heç bir zaman adama əyan olmayacaq sirri gizlənmişdi. Ancaq heyf ki, Mürşüdgilin bağı dənizdən xeyli uzaq idi və ətrafına uca daş hasar çəkilmişdi. Ev özü isə, daima sükut içində olan kiçik qalaya bənzəyirdi. Hər şey, hətta, birinci mərtəbədən ikinci mərtəbəyə qalxan pilləkən belə, binanın dörd divarı arasında, yəni, içindəydi. Pəncərədən isə, dəniz görünmürdü. Heyf ki, evin dörd tərəfinə və iri dəmir darvazaya gedən cığıra asfalt salınmışdı. Asfalt isə, həmişə qızda xoşagəlməz bir hiss doğururdu. Heyf ki, yasəmənlərin, oleandr güllərin başları da bulvardakı bitkilərin başları kimi kəsilib bir bərabərdə edilmişdi. Yalnız qumun üstünə sərilmiş tənəklərin pərakəndəliyində, bir də alma, nar ağaclarının qol-budağında, böyük əncir ağacının enli yarpaqları arasındakı kölgələrdə, bir də pırıltı ilə hey ağacdan-ağaca qonub, səs-küy salan quşların həyəcanında, nə isə, bir fərəh, bir azadlıq vardı. Yəni, Firəngizə belə gəlirdi. Ancaq ərinin bağını gözəl hesab etmək üçün qıza elə bu da kifayət edirdi. Və Firəngiz özünü xoşbəxt sanırdı.

Mürşüdün anasından başqa yaxın bir kəsi yox idi. Müxtəlif təsərrüfat idarələrində işləyən atası bir neçə il qabaq vəfat eləmişdi. Onun dədə-baba evində tək yaşayan anası vaxtilə dərzi atelyesinin müdiri, hamam müdiri kimi vəzifələrdə olmuş, keçən il təqaüdə çıxmışdı. Boylu-buxunlu, yaraşıqlı bir qadın idi. Ancaq, heyf ki, yaşının altmışı haqlamasına baxmayaraq, hələ də kosmetik bəzəklə çox ciddi məşğul olurdu. Firəngizin isə, yaşlı arvadların qaşlarını aldırıb, dodaqlarını qızartmalarından zəhləsi getsə də, qaynanasının təmiz-tarıqlığını, son dəbdə geyinməsini rəfiqələrinə tərifləyər, arvadın kosmetik bəzəklə-filanla məşğul olmasını fikrinə gətirməkdən çəkinərdi.

Bir axşam çay içdikləri zaman televizorda xəbər verdilər ki, rəssam Nərimanın təzə sərgisinin açılışı böyük müvəffəqiyyət qazanmışdır. Onun "Qız və oğlan" əsəri qarşısında hər gün dəstə-dəstə tamaşaçı dayanır və sairə...

– Oy, Mürşüd! – deyə Firəngiz həyəcanla səsləndi. – Sabah biz də gedək baxaq.

– İndi şəhər yaman istidir. Havalar bir az sərinlənsin, gedərik.

Mürşüdün quru cavabı qıza toxundu:

– Yox, yox, sabah gedək, onsuz da gecikmişik, mən teatr tamaşalarına, sərgilərə həmişə birinci gün baxmaq istəyirəm, – dedi.

– Axı, nə təfavütü var, birinci gün olmasın, onuncu gün olsun, – Mürşüd, bir növ, üstüörtülü və əsəbi cavab verdi.

Qaynanası da aypara qaşlarını dartaraq, qəribə bir təbəssümlə dedi:

– Axı, birinci gün adam çox olur. Rəssamın özünü görürsən...

Firəngiz, qaynanasının cavabındakı soyuqluğunu hiss elədisə də, bunun səbəbi barədə düşünməməyə çalışaraq:

– Mütləq sabah gedək! – dedi.

Onlar gələndə sərgi salonu ağzına qədər dolu idi. Firəngiz bu cür qələbəliyi həqiqətən sevirdi. Bu, ona, doğrudan da, bayram təsiri bağışlayırdı. Ən gözəli də o idi ki, indi bu adamların çöhrəsində bir şadlıq, bir razılıq hiss edirdi. Rəsmdə qızla oğlan arasında başlayan məhəbbətin lap ilk qığılcımları təsvir olunurdu və Firəngiz özünü də, ərini də tamam unudaraq, bu yeni doğan məhəbbəti seyr edirdi. Firəngiz dünyada belə gözəl duyğular olduğuna heyran qalırdı, yəni, rəsmə tamaşa etdikcə, bu duyğular qızın öz qəlbində yaranırdı. Bunların nədən ibarət olduğunu soruşsaydılar, bəlkə də, izahda aciz qalardı. Orası da çox qəribə idi ki, bu duyğularla birlikdə onun qəlbində anlaşılmaz bir kədər də baş qaldırırdı.

Nəhayət:

– Gedək! – deyə Mürşüd onun qolundan tutdu.

Qız dərindən nəfəs alıb ona baxdı. Ərinin qızarıb pörtmüş üzü bir an ona təəccüblü dərəcədə yad göründü və tamam qeyri-şüuri bir hərəkətlə çılpaq qolunu çəkib Mürşüdün əlindən qopardı və dərhal da bu hərəkətinin namünasib olduğunu hiss edərək özü ərinin qoluna girdi. Sonra Firəngiz, rəssamın başqa rəsmlərinə baxmaq istədikdə, Mürşüd həmin qızarıb-pörtmüş çöhrəsilə:

– Yaxşı, sən bax, mən foyedə papiros çəkirəm, – deyib salondan çıxdı.

Qız ərinin əhvalında, nə isə, bir anlaşılmazlıq hiss edərək, onunla çıxmaq istədi. Lakin Nərimanın o biri rəsmlərinə də baxmamış çıxa bilmədi.

Çıxanda o, ərini yenə də eyni gərgin vəziyyətdə gördü.

Və onlar bağa qayıtmaq üçün Mürşüdün "Jiquli"sinə əyləşmək istədikdə, Firəngiz gülümsəyərək dedi:

– Qoy bu dəfə mən sürüm...

– Otur yerində!

Firəngiz ərinin bu sərt cavabından da bir şey başa düşmədi və bir qədər sükut içində gedəndən sonra soruşdu:

– Nə olub, Mürşüd?

– Nə olacaq, heç nə...

– Bəs, niyə pərtsən?

Elə bil, rəssama od vurdular.

– Pərt niyə oluram, – deyə açıldı. – Sən də qəribə adamsan. Sənətdən başın çıxmır, hər sözü danışırsan.

Qız təəccüblə ərinə baxdı:

– Sənət barədə mən heç bir söz danışmadım.

Rəssam çox kobud hərəkət etdiyini başa düşərək, elə bil ki, qorxdu. Çox mülayim bir ifadə ilə dedi:

– Bu yolda gediş-gəliş çoxdur. Ayrı yerdən sürərsən.

Firəngiz qətiyyən maşın barədə düşünmürdü. Hərçənd maşın sürməyi Firəngizə Mürşüd özü öyrətmişdi; bir yay gecəsi idi onda... kimsəsiz dəniz sahilində...

Firəngiz dinmədi. Ona görə yox ki, pərt olmuşdu. Ona görə ki, içində oturduğu bu maşın bir anda onun üçün yabançı, maraqsız olmuşdu. Elə bil ki, ərinin maşınında deyil, taksidə gedirdi və elə bil ki, əri məhz bu mülayim sözləri ilə birdən-birə kiçilib bir tikə oldu. O, bu yazıqlığı, eyni zamanda, özündə – öz varlığında hiss etdi. "Jiquli" bağa doğru sürətlə irəlilədikcə, qız məyus nəzərlərlə, yanlarından gəlib keçən, bəlkə də, bağlardan şəhərə qayıdan maşınlara baxırdı.

Axşam Firəngiz heç kəsdən heç nə soruşmadan, bura gəldikləri vaxtdan bəri ilk dəfə stol-stulları çıxarıb həyətə qoydu. Üzərinə də ağ süfrə saldı.

– Belə nə üçün? – deyə qaynanası soruşdu.

– Evdə nə var axı, yayın günüdür.

– Sonra külək qalxıb qumu dolduracaq ağzımıza-burnumuza.

– Külək qalxar, keçərik içəri, – deyə Firəngiz qaynanasına baxdı.

Qaynana aypara qaşlarını narazı halda yuxarı dartıb dinmədi.

Firəngiz çay, mürəbbə, tort, filan gətirdi. Sonra tranzistoru gətirdi. (Televizor otaqda idi.) Abşeronun axşam sərini başlamışdı. Əncir, alma,

nar ağacları, isti qumun üzərinə sərilmiş tənəklər bu yarımqaranlıq içində sanki xəfif mehdən xoşlanırdılar. Uzaqdan dənizin şırıltısı eşidildi. Heyf ki, dəniz özü görünmürdü. Heyf ki, bu daş hasar nə dənizi, nə də bu tərəfdəki qum təpələrini görməyə imkan verirdi. Ancaq göy qübbəsi ulduzlarla dolu idi. Və elə bil ki, bu ulduzlar sevinc içində işıq saça-saça tərpəşirdilər.

Əvvəl ordan-burdan söhbət etdilər. Gündüzkü sərgi barədə nə Mürşüd danışdı, nə Firəngiz. Nə də qaynana o barədə bir söz soruşdu. Ancaq sərgi barədəki bu sükutun özündə soyuq bir gərginlik vardı. Və Firəngiz bunu hiss edirdi, yəni, bu gərginliyi hiss edirdi, amma səbəbini yox. Düzü, səbəb barədə düşünməkdən ehtiyat edirdi.

Heyf ki, bu daş hasar isti qumun üzərinə enmiş bu sərin yay axşamını hər tərəfdən sıxışdırırdı.

Mürşüd dedi:

– Son xəbərlərin vaxtıdır. Aç görək nə deyir.

Firəngiz əqrəbi hərlədi və diktor danışmağa başladı:

– Bütün istedadlı sənətkarlar kimi, Nərimanın da rəsmlərində yenilik hissi ilə Azərbaycan xalqının, Azərbaycan təbiətinin koloriti fövqəladə bir incəliklə birləşmişdir. Onun tabloları hər cür konyukturdan, hər cür sünilikdən uzaq, həqiqi sənət əsərləridir.

Mürşüd çayını yarımçıq qoyaraq, əsəbi halda qalxıb stoldan uzaqlaşdı, qayınana da aypara qaşlarını dartaraq oğlunun ardınca getdi. Firəngiz diktorun Nəriman haqqında dediklərinə axıra qədər qulaq asdı, sonra yavaş qurtumlarla çayını içdi. Abşeron gecəsinin sərinliyindən ləzzət alan əncir, alma, nar ağaclarına baxdı. Sonra dənizin uzaqdan eşidilən şırıltısına qulaq asdı. Heyf ki, bu hündür daş hasar dənizin, o qaranlıq təpələrin qabağını kəsmişdi. Heyf ki, bu hündür daş hasar, bu nəhəng dəmir darvaza adamı hər tərəfdən az qala məngənə kimi sıxışıb nəfəsini daraldırdı. Heyf ki, Nərminə, Turac, Şəfiqə burda deyildilər. Bu saat bu geniş, ulduzlu göyün altında dənizin ılıq suyunda çimməyin ləzzəti var – Firəngiz bunu fikirləşdi və... ağladı...

... O gecə Mürşüd əcaib və rabitəsiz bir yuxu gördü.

Gördü ki, iyrənc bir çamıra bata-bata hara isə gedir.

Sonra da birdən gördü ki, yenə də Nərimanın həmin tablosunun qabağında dayanıb. Amma şəkildəki oğlanın əlindən tutduğu qız Firəngizdir! Mürşüd isə, qışqırıb demək istəyir ki, Nəriman nə haqla onun arvadını bu cür, yad oğlanla çəkib? Ancaq nə qədər qışqırırsa,

səsi çıxmır ki, çıxmır... O zaman Mürşüd yerdən bir ovuc çamır götürüb çırpdı şəkilə. Belə olduqda, şəkildəki oğlan çərçivədən çıxıb Mürşüdün boğazından yapışaraq başladı boğmağa.

... Mürşüd çapalayıb yuxudan ayılanda gördü ki, həqiqətən az qalır boğulsun. Özünə gələndən sonra Firəngizin üzü divara tərəf sakit halda yatdığını, heç nədən xəbəri olmadığını görüb, rahat nəfəs alaraq bayıra çıxıb siqaret yandırdı.

Səhəri gün Firəngiz şəhərə getmək istədiyini bildirdi.

– Bu istidə nə var şəhərdə? – Mürşüd soruşdu.

– Həkim məsləhətxanasına getmək lazımdır.

Firəngiz hamilə idi.

O, bir qədər susub, bir növ, ötəri ifadə ilə əlavə etdi:

– Bir də ki, burada darıxıram.

– Sən ki, bağdan ötrü sinov gedirdin... – deyə Mürşüd zarafat eləmək istədi. – İndi nə olub?

– Heç nə olmayıb. Ancaq darıxıram.

Mürşüd onun əlindən tutub mülayim ifadə ilə:

– Bəlkə, – dedi, – bir şeydən incimisən?

Yenə də əri bu mülayimliklə, bu qorxaq təbəssümlə (ondakı bu qorxaq mülayimlik hardan idi və bunu Firəngiz sonralar da anlaya bilmədi) onun gözləri qarşısında lap aşkar kiçildi. Kiçildi... Bir tikə oldu və Firəngiz kəskin hərəkətlə əlini ərinin əlindən çəkərək sərt ifadə ilə dedi:

– Heç bir şeydən inciməmişəm, Mürşüd!

O, belə dedi. Amma, o, incimişdi. Bu hündür daş hasar da, bu iri dəmir darvaza da, qalaya bənzəyən bu örtülü ev və qayınanasının kənarları alınıb-düzəlmiş aypara qaşları da bir tərəfdən onu sıxırdı, lap məngənə kimi sıxırdı. Ən pisi də o idi ki, o, bunların belə olduğuna daha əvvəlki kimi heyfsilənmirdi. O bunlardan qaçmaq istəyirdi.

Lakin şəhərin qələbəliyi, yay kinoteatrları, konsertlər, pəncərələrdən görünən dənizin genişliyi də onun ürəyindəki ağırlığı yüngülləşdirə bilmirdi. Mürşüd də daha bağa getməyib onunla birlikdə şəhərdə qalırdı. Və hamilə qadınına hər cür qulluq göstərirdi. Onun bu xidmətində, mehribanlığında suçlu bir hal var idi, elə bil ki, o, daima nədənsə ehtiyat edirdi. Və bu, səbəbi özünə də məlum olmadığı halda, Firəngizi əsəbiləşdirib haldan çıxarırdı, Firəngiz indi nə ərinin emalatxanasına gedir, nə də onun nə üzərində işlədiyi ilə maraqlanırdı.

O da qəribə idi ki, Mürşüd bu vəziyyəti görüb duyduğu halda səbəbini soruşmurdu. Daha doğrusu, soruşmaqdan çəkinirdi.

Firəngiz saatlarla pəncərə qarşısında oturur və gələcək uşağı haqqında düşünürdü.

... Uşaq isə, bir neçə aydan sonra sağlam bir oğlan olaraq dünyaya gəldi. Onun dünyaya gəlişi ilə, elə bil ki, Mürşüd də birdən-birə dönüb ayrı cür adam olmuşdu. Elə bil ki, o, rəssamlığını da və o qorxaq mülayimliyini də büsbütün unutdu. Elə bil ki, indi daha təbii, daha canlı bir adam olmuşdu, ayağını yerə indi daha möhkəm dirəmişdi. Elə bil ki, ondakı o daxili gərginlik də birdən-birə yox olub getmişdi.

Lakin bu körpə sağlam oğlanın dünyaya gəlişi ilə Firəngizdə yeni bir təşviş peyda olmuşdu. Gənc ana bu ilkinə diqqətlə baxmaqdan və onun kimə oxşadığını təyin etməkdən çəkinirdi. Ultra dəbdə geyinmiş Nərminə, Turac və Şəfiqə səs-küylə rəfiqələrini təbrikə gəldilər. Uşağın beşiyi başına toplaşıb onu diqqətlə nəzərdən keçirdilər.

Nərminə dedi:

– Oy, lap atasının kopyasıdır.

Turac təsdiq etdi:

– Ağız-burnu, yumru alnı lap atasınınkıdır ki, durub.

Şəfiqə isə dedi:

– Amma gözləri eynilə anasının gözləridir.

Nərminə və Turac sevinclə təsdiq etdilər:

– Düzdür... düzdür. Lap anasının gözləridir.

– Anasınınkı kimi dupduru...

Firəngiz elə bil diksindi. Onun gözləri oğlunun gözlərinə zilləndi və yalnız bu zaman o, diqqətlə, məhəbbətlə oğluna tamaşa etdi.

*1976*

# YUSİF VƏ ESFİR

*Cavan və istedadlı sənətkar dostum*
*Mikayıl Mirzəyevə ithaf edirəm.*

Bəni-İsrail Yusiflə arvadı Esfir gözəl, səfalı düzənliklə sakit-sakit axan, suyu gün işığında almas kimi parlayan bir çayın sahilində balaca, səliqəli evlərində yaşayırdılar. Onların həyatı da həmin o çay kimi sakitcə axıb gedirdi.

Qırx il idi ki, Yusif Allaha ibadət edirdi. Daşa Girən Kahin İbrahim demişdi ki, kim qırx il, hər gün, hər gecə Allaha ibadət eləsə, Allah onun üç xahişini yerinə yetirər. Yusif bir gün də ibadətinin vaxtını keçirmirdi. Xoşqılıq, həvəsli bir qadın olan Esfir həyətlərində toyuq-cücə, qaz saxlayır, bütün günü həvəslə ev-eşiklə məşğul olur, Yusifin çaydan tutduğu balıqlardan ləzzətli xörəklər bişirirdi və sütunlarına sarmaşıqlar sarışmış eyvanda əyləşib rahatca nahar eləyirdilər. Sonra Yusif ibadətə başlayır, Esfir isə, axşam çayda çimməyə gələn gənclərə tamaşa etməyə gedirdi.

Cavan qızların, oğlanların şən gülüşlərlə çayın almas kimi parlayan suyunda bir-biriləri ilə zarafatlaşmaları, oğlanların gözəl qızları suda qovub, tutub öpmələri, sonra sahildə isti qumun üstündə oturub, qədim bəni-İsrail mahnıları oxumaları Esfirə həsrətli bir zövq verirdi. Həsrət onun həyatının keçmişi ilə bağlı idi. Onun gəncliyi bu gənclərin həyatı kimi belə şən, qayğısız keçməmişdi. Yeddi uşağı olan kasıb ata-anası onu mişovul pişiyi kimi qızıl üstə yatan sələmçi Salomona qulluqçu vermişdi. Salomonun arvadı Raxil də zalım qadın idi. Esfirlə şirin dillə mehriban rəftar edir, amma o şirin dillə də hey işlədir, bir dəqiqə də nəfəsini dərməyə imkan vermirdi.

Yusif, Salomonun gözəl bağında bağban işləyirdi. Özü də bir könüldən min könülə Esfirə aşiq idi. Neçə dəfə girəvəyə salıb, ürəyini qıza açmışdısa da, Esfir "ah" çəkib başını bulamışdı. Esfir, Yusifin yaxşı oğlan olduğuna, onu da səmimi qəlbdən istədiyinə inanırdı. Ancaq bu yaxşı oğlanın xarici görünüşü, dərinlikdə işıldayan balaca, yaşıl gözləri, lap ucunda ziyil olan iri burnu sanki hər dəfə Yusiflə qarşılaşanda qızı geri itələyirdi. Amma neyləyəsən ki, digər oğlanlar da gözəl qədd-qaməti, cazibədar göz-qaşı olan, gündə on adamın işini görən Esfiri sanki görmürdülər...

Bir dəfə Esfir evin tozunu aldığı zaman Salomonun qızı Saranın şit, dələduz bir oğlan olan nişanlısı onun biləyindən tutub demişdi:

– Mənimlə dost ol, hər ay sənə burda aldığından on qat artıq verim...

Esfir də onun burnunun üstünə elə bir yumruq vurmuşdu ki, uzun müddət qanı kəsilməmişdi.

İnsan dərdini yaxın bir adamına deməyəndə rahat ola bilmir. Esfirin də Yusifdən başqa yaxın adamı kim idi ki?.. Qız bağa qaçıb, yana-yana ağlayaraq, bu əhvalatı Yusifə danışdı. Ağır bir sükutdan sonra Yusif dedi:

– Axı, sən nə vaxta qədər araba atı kimi bu əclaflara işləyəcəksən? Onlardan bundan artıq nə gözləyirsən? Niyə mənim arvadım olmaq istəmirsən? Axı, bilirsən ki, səni nə qədər istəyirəm. Neçə vaxtdır mən də işləyirəm, azdan-çoxdan geriyə qoymuşam. Qanunla evlənərik, yer alıb balaca bir ev tikərik, bağ salarıq. Bütün ağacların dilini bilirəm. Gözəl uşaqlarımız olar...

Yusif belə deyəndə, Esfir "ah" çəkib Yusifin ziyil olan burnuna baxdı... Və nə üçünsə ağladı...

Və o gecə uzun zaman yata bilmədi... Fikirləşdi ki, illər keçib gedir... On doqquz yaşın içindəyəm. Mən arzu elədiyim oğlanların heç biri mənimlə maraqlanmadı... Maraqlananda da, ancaq müvəqqəti əyləncə üçün... Yusifə getsəm, heç olmasa, öz ev-eşiyim olar. Bəlkə, Allah gözəl bir övlad da verdi...

Esfir "ah" çəkib, yuxuya getdi.

... Və üç gündən sonra Yusif məclis paltarını geyib, Salomonun hüzuruna gedərək, ədəb-ərkanla ona bildirdi ki, Esfirlə evlənmək istəyir.

Həddindən artıq kök, xoşsifət bir kişi olan Salomon arvadı kimi rəhmsiz deyildi. İnsanlara yaxşılıq etməkdən ləzzət alırdı. Yusiflə Esfirin evlənmək əhvalatını xoşhallıqla qarşıladı, hətta, hər birinə üç aylıq alacaqları qədər də ayın-oyun bağışladı.

Yusiflə Esfir evlənəndən sonra, indi içində yaşadıqları kürsülü, səliqəli evi tikdilər. Ər-arvad gecə-gündüz işləyərək, gözəl bağ düzəltdilər. Sonra övlad gözləməyə başladılar. Lakin illər keçir, böyük intizarla gözlədikləri oğlan, ya qız gəlib çıxmırdı ki, çıxmırdı...

Gözlədikləri övladın taleyi haqqında hər kəsin öz arzusu var idi. Yusif istəyirdi ki, oğlu olsun, oxusun, Salomon kimi tacir olsun...

Esfir istəyirdi ki, gözəl bir qızı gəlsin dünyaya, ona gözəl rəqslər öyrətsin və həzrət Yusif kimi (atası Yusif kimi yox!) gözəl bir oğlana ərə getsin...

Lakin illər keçirdi... Nə oğlan gəlirdi, nə qız...

O zaman Yusif, Daşa Girən Kahin İbrahimin yanına gedib, əhvalatı ona danışdı. Kahin İbrahim dedi ki:

– Kim qırx il, hər gün, hər gecə Allaha ibadət eləsə, Allah onun üç arzusunu yerinə yetirər...

... Və o gündən Yusif başladı gecə-gündüz Allaha ibadət etməyə.

Esfir çayda çimib-şənlənən gənclərə tamaşa eyləyib, evə gələndə, güzgüdə özünə baxanda, ona çoxdan vida etmiş o gözəlliyi haqqında düşünərək "ah" çəkirdi.

... Budur qırx il də keçdi. Yusif birinci arzunu diləyib, Allahdan övlad istəməyə hazırlaşırdı və gözlənilmədən Esfir ona yalvardı ki, Yusif Allahdan ona, yəni, arvadı Esfirə bir gözəllik əta eləsin!..

Esfirin qəfil bəyan etdiyi bu arzu Yusifin bütün fikirlərini alt-üst etdi. Onu o qədər həyəcanlandırdı ki, artıq heç nə haqqında sakit düşünə bilmədi. Məsələ onda idi ki, Yusif Esfirin keçmiş gözəlliyinin həsrətini çox çəkirdi... Bir də elə canla görüşmək, o zövq-səfanı hiss etmək ona hardan nəsib ola bilərdi? Esfir kimi gözəl, taleyin ona qismət etdiyi yeganə bəxşiş idi. İndi, əgər, Allah-təala Esfirin keçmiş gözəlliyini, gəncliyini özünə qaytarsa, demək, həyat onun da, Yusifin də üzünə təzədən güləcək və Yusif sonra Allahdan diləyəcək ki, bu gənc, gözəl arvadından ona bir övlad versin...

... Və Yusif üç diləkdən birincisini bəyan edib, Allahdan Esfirin on səkkiz yaşındakı gözəlliyini özünə qaytarmasını rica etdi.

Və Allah Esfirin on səkkiz yaşındakı gözəlliyini ona qaytardı.

Esfir güzgünün qabağında durub, özünə tamaşa edirdi. Yusif heyran-heyran ona baxaraq, biləyindən tutdu. Ancaq Esfir biləyini cəld onun əlindən qopararaq, Yusifi birinci dəfə görürmüş kimi, sərt nəzərlə burnuna baxdı və dedi:

– Neyləyirsən, utanmırsan, qoca kişisən!..

Yusif elə bildi ki, Esfir zarafat eləyir, şad-xürrəm gülüb dedi:

– Gərək sənə indi bədəninə görə paltar tikdirək. Yaşlı vaxtında kökəldiyin üçün, paltarlar çox gen olur.

Esfir çox ciddi ifadə ilə dedi:

– Düz deyirsən, gedək dərzinin yanına. Ancaq mən adamların yanında sənə ata deyəcəyəm, yoxsa, fikirləşərlər ki, qoca kişi nə münasibətlə bu cavan, gözəl qıza paltar alır?..

Yusif elə başa düşdü ki, Esfir yenə zarafat eləyir, bərkdən gülüb:

– Nə olar, – dedi, – elə olsun...

... Və Esfir təzə paltarı geyib, güzgü qabağında dayananda, o qədər gözəl, o qədər cazibədar göründü ki, Yusif həyəcanla irəliləyib qızı qucaqladı. Esfir çevik hərəkətlə sivişib, onun qolları arasından çıxaraq:

– Nə qayırırsan? – dedi. – Qoca kişisən, utanmırsan?..

Esfir bunu deyib, çayın sahilinə – cavanların həmişə çimib, rəqs elədikləri meydançaya qaçdı. Yusif yenə də təyin eləyə bilmədi ki, Esfir zarafat eləyir, yoxsa...

... Oradakı cavanlar birinci dəfə gördükləri bu gözələ heyran oldular. Məşhur zərgər Zəraxın ərköyün oğlu onu rəqsə dəvət elədi və Esfir çoxdan həsrətində olduğu bu rəqsi elə məharətlə, elə cazibədarlıqla ifa etdi ki, qızlar paxıllıqla qısqandı, oğlanların isə, hamısı ona vuruldu...

Yusif də kənardan o gözəl qıza baxıb, o qədər heyran olmuşdu ki, Allahdan edəcəyi ikinci xahişi də yadından çıxarmışdı.

Axşam da zərgər Zəraxın oğlu gəlib, Yusifə əhəmiyyət vermədən qızı qonaq apardı.

Zərax çox hörmətli və dövlətli bir zərgər olduğundan, Yusif qızın getməsinə mane olmağa cəsarət etmədi. Amma yaman əsəbiləşdi. Esfir gələndə özündən çıxıb:

– Bu nə hərəkətdi? – deyə qışqırdı. – Ərini evdə qoyub, yad oğlanla qonaq gedirsən?

Esfir heç halını pozmadan:

– Bəs neyləyim? – dedi. – Qoca kişisən, sənin yanını kəsdirib oturmayacağam ki, cavan qızam...

Yusif nə qədər elədisə, qızı cavan oğlanlardan uzaqlaşdıra bilmədi. Esfir bir ər kimi də onun yaxınlığını rədd etdikdə, Yusif dedi:

– Axı, mən Allahdan övlad istəməliyəm...

Esfir dedi:

– Qoca kişisən, neyləyirsən övladı!

Yusif yanıb tökülərək, birdən-birə o qədər hirsləndi ki:

– Ya Allah, – dedi. – Sən bu Esfiri ayı elə! (Nə üçün məhz ayı? Demək çətindir...)

Bu da İsrail əhli Yusifin Allah-təaladan ikinci təvəqqəsi oldu.

Çay qırağına gələn cavanlar təəccüblə gördülər ki, gözəl qız birdən-birə yox olub. Onu da gördülər ki, bu yerlərdə bir ayı peyda olub, səhərdən-axşamacan gəlib Yusifin qapısında yatır. Özü də heç kəsə toxunmur. Elə bil ki, heç kəsi görmür.

O ayı, Yusifin bağçasından kənar heç yerə getmirdi. Bütün günü həyət qapısının qabağında oturub, gözlərini zilləyirdi evə. Sanki Yusifin heç bir hərəkətini gözdən qoymaq istəmirdi. Yusif hirslənib ona qışqırdı:

– Niyə çıxıb meşədəki qohumlarının yanına getmirsən?

Ayı isə, susaraq bütün günü eləcə baxırdı və onun ayı gözlərinin dərinliyində keçmək bilməyən bir kədər var idi. Yusif acıqlı-acıqlı gətirib onun qabağına yemək qoyurdu. Bir gün də lap özündən çıxaraq dedi:

– Mən hər gün sənə bal, armud, qoz tapıb verə bilmərəm!

Yusif xəsis deyildi və bu sözləri də xəsis olduğu üçün demirdi... Bu sözlərdən sonra ayı daha Yusifin qoyduğu yeməkləri yemədi. Bu isə, Yusifi daha çox pərişan edirdi.

Ayının hər gün evinin qabağında oturub, məzlum-məzlum ona tamaşa etməsi Yusifin ürəyinə təsir edirdi. Ona görə də, Yusif hirsləndi, yana-yana ayıya dedi:

– Nə var? Niyə yazıq-yazıq baxırsan? Allah mənim arzumla səni gözəl eləyəndə, niyə birdən-birə elə zalım oldun? Niyə fikirləşmədin ki, axı, Yusif o gözəlliyi sənə qaytarmaq üçün qırx il hər gün Allaha dua eləyib? Allahın köməkliyi ilə səndən övlad gözləyib! Hə?! Niyə dinmirsən, zalım, vəfasız qadın?

Nəhayət, bir gün zərgər Zəraxın ərköyün oğlu gəlib Yusifdən soruşdu:

– Bəs, sənin gözəl qızın haradadır?

Yusif əncir ağacının kölgəsində uzanan ayını göstərib qəzəblə dedi:

– Odur ey!..

Zəraxın ərköyün oğlu hirslənib dedi:

– Axmaq qoca, məni ələ salırsan?!

O "axmaq" sözü sanki Yusifin ürəyində bu oğlana qarşı qaynayan qəzəbə, nifrətə yol açdı. Yusif irəliləyib oğlana sillə vurdu. Zəraxın ərköyün oğlu güclü cavan idi. Ömründə birinci dəfə sillə yeyirdi. Bir əli ilə Yusifin xirtdəyindən yapışıb, o biri əli ilə də kişini silləməyə başladı. Bu zaman ayı qalxıb, onlara yaxınlaşaraq, pəncəsilə oğlanı

vurub kənara tulladı. Oğlan bərk yerə dəydi, qalxıb darvazadan çıxmağa da macal tapmayaraq, hasardan tullanıb qaçdı. Sonra ayı dinməzcə gəlib yenə də o əncir ağacının kölgəsində uzandı. Yusif də onun yaxınlığındakı köhnə taxta kətildə əyləşdi.

On beş günlük Ay dünyanı sakit, mehriban bir nura qərq etmişdi...

Ayı ilə insan bir-birinə baxırdı. Birdən nə üçünsə Yusifi ağlamaq tutdu. Və ona elə gəldi ki, ayının Ay işığında işıldayan balaca gözlərində də yaş göründü.

Və bəni-İsrailin mömin bəndəsi Yusif əllərini göyə qaldıraraq:

– Ey böyük Allah! – dedi. – Sən Esfiri mənim qırxillik arvadım olduğu vaxtındakı şəklinə qaytar!..

Böyük Allah Yusifin üçüncü arzusunu gözləyirdi. Ona görə də, Esfiri neçə ay bundan əvvəlki şəklinə saldı.

Gün işığında almas kimi parıldayan o çayın sahilində yenə o qoca kişi və qarısı idi.

Beləliklə, Daşa Girən Kahin İbrahimin dediyi kimi, Allah bəni-İsrail Yusifin qırx illik ibadəti əvəzinə vəd olunmuş üç diləyinin üçünü də yerinə yetirdi.

*1991*

# KÖRPÜSALANLAR

## SƏRİYYƏ

Biz bir ilə yaxın idi ki, evlənmişdik. Mən yol texnikumunu qurtaran kimi də toyumuz olmuşdu. Baş yollar idarəsində mühəndis olan ərim Adil hər gün səhər saat doqquz tamama on dəqiqə qalmış işinə gedər, mən də bazardan ayın-oyun alıb gətirər, biş-düş edərdim. Dörd ay bundan qabaq bizə üçotaqlı təzə mənzil vermişdilər. O zaman mən otaqları gəzərək:

– Ay Adil, – deyə zarafat eləmişdim, – biz bu boyda evlərə nə qoyacayıq?

Adil də gülümsəyərək:

– Qəm çəkmə, düzələr, – demişdi.

Sən demə, çox ehtiyatlı oğlan imiş. Subay vaxtı əmanət kassasına azdan-çoxdan qoyubmuş... Atasıgil də kömək elədi. Qərəz, iki qarniturla bərabər, müasir dəbdə olan lazımi şeylər alıb otaqları ürəyimiz istəyən kimi düzəltdik.

Həyatımdan razı olmamağa haqqım yox idi. Adil kimi adama ərə getmişdim. Ortaboylu, yaraşıqlı bir oğlan idi. Olduqca təmiz-tarıx, səliqəli geyinərdi. Köynəyinin boynu həmişə qar kimi ağ olardı. Məclislərdə, cəmiyyət içində özünü ləyaqətlə aparardı, artıq-əskik danışmazdı. Hamı onun çox ağıllı, hər şeyin yerini bilən bir adam olduğunu, çox irəlilərə gedəcəyini söyləyirdi. Onun hər işində, hətta, gülüşündə və zarafatında belə ciddi, sərvaxt bir ağlın hökm sürdüyü duyulurdu. Heç bir yerə, heç bir kinoya, teatra mənsiz getməzdi. Yad adamların yanında, məclisdə özümü necə aparmağım barəsində mənə tez-tez məsləhətlər verərdi. Mən, öyüd-nəsihət sevməsəm də, inciməzdim. Əksinə, aramızda on bir yaş fərq olduğundan (o vaxt mənim on doqquz, onun isə otuz yaşı var idi), bunu qanuni bir şey hesab edirdim. Məsələn, o deyirdi ki, kimin üzünə gülümsəmək lazım olduğunu, kimə heç fikir verməməyi gənc qadın bilməlidir. Mən də onun bir tanışına rast gələndə dərhal bütün diqqətimi toplayaraq

çalışırdım ki, müəyyən edim, görüm, mən bu adama qarşı nə cür mövqe tutmalıyam.

Etiraf edim ki, bəzən bu hal məndə bir əyləncəyə, bir zarafata dönürdü. Filan tanışın yanında özümü qəsdən tox tutmağım sonra Adillə mən tək qalanda qeyri-ixtiyari bir qəhqəhəyə çevrilərdi. Bu zaman o, təəccüblə üzümə baxar və qaşlarını çataraq heç bir söz deməzdi. Mən də onun xətrinə toxunduğum üçün könlünü almağa çalışardım. O, evdə olmadığı zamanlar güzgünün qarşısında dayanıb, məsələn, onun xoşu gəlməyən filan oğlanı gördükdə nə cür ciddi görkəm almaq lazım olduğunu məşq edərdim. Mən təqsirkar deyildim. Evimizdə bişməmişdi, qonşudan gəlməmişdi. Mən adicə bir zavod çilingərinin qızı idim. Anam da azsavadlı, lakin sağlam, deyib-gülən, məzəli bir qadın idi. Ərimin istək və tələblərindən asılı olaraq, başqa kişilərə münasibətimdə öz hərəkətlərimi daim nəzarət altında saxlamaq mənim üçün o qədər də asan deyildi. Lakin bu məni qorxutmurdu. Ərimin məni istədiyini, mənə etibar elədiyini bilirdim.

Mən həyatımdan razı idim. Mən görmədiyim günə düşmüşdüm. Atamgildə yeddi baş ailə iki balaca otaqda yaşayırdıq. İndi isə... bayaq söylədiyim kimi, geniş, işıqlı otaqlar, televizor, soyuducu, paltaryuyan maşın, tozsoran... Ərimin atası adlı-sanlı həkim, yaxın bir qohumu nazir, başqa bir qohumu isə böyük bir trestin rəisi idi. Hər gecə kino, teatr, qonaqlıq... İndi bu sətirləri yazarkən, bir an dayanıb "filosofanə" xəyallara dalıram. "İnsan həyatı nə qəribədir, – deyə düşünürəm, – bəzən tuş tutub getdiyin yol haradan başlayır və səni haralara aparıb çıxarır... Əvvəl söyüd salxımlarının zərif kölgəsi ilə sakit-sakit axan çay birdən nə amansız burulğanlar yaradır... Başqasına bəxş etdiyin səadət bəzən necə sərt bir tikan olub onun qəlbinə sancılır. Sən isə, buna qarşı biganə olursan. Kim deyər ki, bunların hamısı bizim iradəmizdən asılıdır... Kim deyə bilər ki, mən Adil üçün və ya o mənim üçün yaxşı olmaq istəmirdik... Kim deyə bilər ki, ya mən ondan, ya da o məndən öz ömrümüzü əsirgərdik..."

Biz, yəni mən və tələbə yoldaşlarım texnikumda oxuyanda, sanki daim bir yerdə uçub cividləşən, bir ağacda gecələyən bir dəstə quş idik. İndi isə, mən o dəstədən ayrılıb tamam yeni bir aləmə düşmüşdüm. Etiraf edim ki, bəzən axşamçağları (məhz axşamçağları!) onlar üçün, vaxtilə mənimlə birlikdə cividləşən o quşlar üçün darıxardım, qəribsəyərdim. Belə anlarda, gündə on dəfə tozunu sildiyim güzgü kimi

parlaq mebellərim mənə soyuq və yabançı görünərdi və mən "ah" çəkib pəncərədən məchul uzaqlara baxardım. Bəzən gecələr Adilə texnikumdakı oğlan uşaqları ilə etdiyimiz zarafatlardan danışıb, onun da bu məzəli əhvalatlara gülməsini istərdim. Lakin o, ancaq mənim könlümü sındırmamaq üçün xəfifcə gülümsər və tamam ayrı şeylərdən, ayrı aləmdən danışardı.

Mən də öz yüngüllüyümü düşünüb özlüyümdə xəcalət çəkərdim. Adil böyük şeylərdən, insanın ali vəzifələrindən danışardı. Deyərdi ki, insan dünyaya daim inkişaf etmək, daha üstün "yaxşı"ya çatmaq üçün gəlmişdir.

Mən də özümü bir şey bilən kimi göstərərək:

– Adil, – deyərdim, – bilmirəm, hansı rus yazıçısı isə deyib ki, quş uçmaq üçün yarandığı kimi, insan da xoşbəxtlik üçün yaranmışdır...

O, ciddi bir görkəm alıb:

– Bilirsənmi, Səriyyə, – deyə cavab verərdi, – xoşbəxtliyin özünün nə demək olduğunu düzgün təyin etmək lazımdır. Əsl məsələ bundadır.

Onun bu sözlərini unutmadım. Lakin o sözlərin mahiyyətini dərk etmək, əsl xoşbəxtliyin nədən ibarət olduğunu anlamaq mənim gücüm çatan iş deyildi. Məni isə, mühakimədən artıq duyğular cəlb edirdi. Mən təzə peyda olmuş yaz böcəyi kimi özümdən asılı olmayan bir həvəslə, daim günəşə-işığa, səhər-səhər otlar üzərində parıldaşan şeh damlalarına doğru qanad çalırdım və nə üçünsə mən bu ruhi vəziyyətimi öz dostumdan, həyat yoldaşımdan gizlədirdim. Mən mümkün qədər özümü sakit və ağıllı göstərməyə çalışırdım. Çünki o belə xoşlayırdı. O hər şeyi diqqətlə, dürüst ölçüb-biçərək irəliləyir və mənim də belə etməyimi istəyirdi. Madam ki, biz həyat yoldaşı idik, demək, belə lazım idi!

Bir gün nahardan sonra o:

– Səriyyə, – dedi, – deyəsən, biz bir neçə müddətə rayona getməli olacağıq.

– Nədən ötrü? – deyə maraqla soruşdum.

– Təzə şose yolu çəkilməyə başlayıb, məni ora rəis təyin edirlər. Necədir? Ürəyincədirmi?

– Bilirsənmi, – deyə hərarətlə izah etməyə başladı, – bizim üçün çox yaxşı perspektivi olan bir işdir. Əgər, yolu müvəffəqiyyətlə çəkib qurtarsaq...

O nə üçünsə susub sözünün ardını demədi və bir qədər var-gəldən sonra əlavə etdi:

– Sən də ali məktəbə girmək üçün heç olmazsa, iki il işləməlisən. Özün də texnik adam, – deyə gülümsədi. – Söz verirlər ki, yolu çəkib qurtarandan sonra məni yenə də aparata qaytarsınlar. Əlbəttə...

O yenə də bir an duruxdu:

– Əlbəttə, – dedi, – indikindən daha mühüm bir vəzifəyə...

Adilin müvəffəqiyyət qazanacağına şübhə ola bilməzdi. Baş yollar idarəsində işlədiyi bu neçə müddət ərzində o il olmamışdı ki, təşəkkür – mükafat almasın.

– Mən belə bir təsadüfü çoxdan gözləyirdim...

– İndiki vəzifən bəyəm pisdir? – deyə təəccüblə soruşdum.

– Pis deyil... Ancaq bir var, sən işləyəsən, ad özgənin ola, bir də var ki, öz əlin, öz başın! Bu elə vəzifədir ki, nə qədər gücün var, göstərə bilərsən. Hamı da görər ki, sən nə eləyirsən... Nəyə qadirsən...

Sonra mehriban səslə soruşdu:

– Bəlkə sən rayona getmək istəmirsən?

– İstəyirəm.

– Onda hazırlaş, qapıları bağlayıb gedərik, özümüz də tez-tez gəlib ev-eşiyə baş çəkərik.

... Kim istəyər ki, gənc əri ad-san qazanmasın, yaxşı işdə olmasın? Məgər, Adil dediyi kimi, həyat daim yüksəlişdən, inkişafdan ibarət deyil? Bizim hər birimiz daha yüksəklərə can atmırıqmı? Mən onun qarşısında açılan yolda büdrəməyəcəyinə əmin idim. Mən onun gücünə inanırdım. Buna görə də, hardansa qəlbimə çökən və səbəbi mənə məlum olmayan ağırlığı üzərimdən ataraq, həvəslə tədarük görməyə başladım. Adilə də, özümə də su keçirməyən plaş, rezin uzunboğaz çəkmə, gələcək mənzilimiz üçün balaca radioqəbuledici, çoxlu foto lenti, cib fənəri, iki yüngül qatlama çarpayı, yemək və çay termosları aldım. Hər ikimiz üçün möhkəm nazik parçadan yay idman kostyumu tikdirdim. Boş vaxtlarımızda oxumaq üçün Adilin kitablarından seçib bir çamadan götürdüm. Nəhayət, may ayının axırlarında Baş yollar idarəsindən verilən "QAZ-69"la Bakıdan çıxıb "K" rayonuna getdik. Adilin də, mənim də maşın sürmək hüququmuz olduğundan şofer götürmədik. Adil işləri yoluna qoyana qədər mehmanxanada qaldıq. Bu müddətdə rayon işçiləri gecə-gündüz Adilin başına yığılır, hazırlıq məsələlərini müzakirə edirdilər. Sonra rayon mərkəzini tərk etdik. Yol rayondan başlayaraq, meşə ilə örtülü dağların o tərəfindəki yaylaqda təşkil edilmiş böyük maldarlıq sovxozuna çəkilməli idi. Adilin

də deməsinə görə, o sovxozun bütün respublika üçün böyük əhəmiyyəti var idi. Yol çox uzun olmasa da, çətin yerlərdən keçməli idi. Tez-tez sıldırım qayaları partlatmaq, üzüaşağı axan dağ çayları üzərindən balaca körpülər salmaq lazım gələcəkdi. Maşınımız, qədimlərdə yaylağa gedib-gələn el-oba tərəfindən salınmış köç yolu ilə irəliləyərək, meşəyə girib yavaş-yavaş yuxarı, dağlara qalxmağa başladı. Qoca palıd, yemişan, vələs ağacları üstümüzə kölgə salırdı. Bəzən yol qıvrılaraq hər yerdə palıd rəngli qayaların dibi ilə qalxırdı. Tez-tez daş yonan, iri gövdəli qocaman ağacları kökündən çıxaran fəhlələrə rast gəlirdik. Ara-sıra qabağımızdan yük maşınları gəlib keçirdi. Adil, əlləri rulda, bunların hamısını diqqətlə nəzərdən keçirirdi. O, gələcək iş haqqındakı fikirləri ilə məşğul idi. Adil cəbhəyə təzə gəlmiş zirək, gözüaçıq bir komandan kimi bütün şəraiti öyrənirdi. O mənim ərim idi. Mən onunla fəxr edirdim. O, ağıllı və yaraşıqlı idi...

Mayın axırları olmasına baxmayaraq, meşə ağaclarından bəziləri çiçəyini tökməmişdi. Meşədə hələ bahar nəfəsi duyulurdu. Yaxın dağların zirvəsində qar görünürdü. Qayalardan göz yaşı kimi şəffaf sular sızırdı. Mən tez-tez yanımda oturmuş Adilə baxır, ona, nə isə, xoş bir söz demək istəyirdim. Meşə arası ilə dağlara qalxan yolda hər şey fərəhli idi. Hər şey mənə səadət, sevinc təlqin edirdi. Bax, ağ buludların altında gümüş kimi parlayan o dağları aşıb, tanımadığım adamların mənzilinə gedəcək yolun komandanı mənim ərimdir! Mühəndis Adil... Adil Cəfərzadə! Həyatda hər şey necə gözəl, necə könülaçandır! Nə üçün mən əvvəllər bunu o qədər də aydın hiss etmirdim?.. Bir neçə gün bundan qabağa qədər bu bahar, bu duyğular haradaydı? Məgər, Adil əvvəllər də belə ağıllı, belə işgüzar, belə yaraşıqlı deyildi? Məgər, mən onu bir neçə gün bundan qabağa qədər indiki kimi istəmirdim? Birdən mən ona:

– Adil, – dedim, – bilirsənmi, yadımdan çıxıb sənin gümüş portsiqarını götürməmişəm.

O mənə baxaraq gülümsədi:

– Eybi yoxdur, – dedi, – bu dağların arasında gümüş portsiqarsız da ötüşərik.

Sonra o yenə də gözlərini qabağa zilləyərək öz fikirlərinə daldı.

Mən dil qəfəsə qoymayaraq hey danışırdım:

– Adil, bəs, səndən qabaqkı rəis necə olub?

– Onu ayrı, böyük işə keçiriblər.

Mən tutuldum. Mənə elə gəldi ki, xəyalımda ərimin surəti birdən-birə kiçildi. Birdən-birə adi və soyuq oldu: “Nə üçün həmin böyük işə səni deyil, onu qoyublar?” Bu nə axmaq, nə boş fikirdir?.. Yoxsa, mən yüngülbeyin bir xudpəsəndəm? Kim birdən-birə nazir olub?!

Biz dolama yolla qalxıb, alt tərəfi göz qaraldan uçurum, üst tərəfi isə, qalın meşəli dağ olan açıqlığa çıxdıq. İçərisindən dumduru su axıb şırıltı ilə uçuruma tökülən və sal daşdan çapılıb qayrılmış kimi görünən dar, lakin dərin selab bu açıqlığı tən ortadan kəsirdi. İki cavan oğlan kənarda dayanmışdı. Üçüncü oğlan isə, parçalanıb yolun ortasına tökülmüş iri-iri daşları buldozerin ağzı ilə itələyib lap uçurumun kənarına gətirir, buradan üzüaşağı itələyirdi. Daşlar yuvarlandıqca uçurumun şiş qayalarına dəyib atlanır və dəhşətli gurultu qoparırdı. Buldozerçi üzü o tərəfə olduğundan, mən ancaq onun şax və enli kürəyini görürdüm. Buldozer uçurumun kənarına o qədər yaxın gedirdi ki, təkərin yarısı az qala kənara çıxır və mən yol texniki olmağıma baxmayaraq, qorxudan qışqırmaq istəyirdim. Birdən buldozerçi qanrılıb məni gördü. Yəqin bərk qorxduğumu duyduğu üçündür ki, qəribə bir qayğısızlıqla gülümsədi. Sonra iri bir qaya parçasını maşının qabağına ataraq sürətlə gətirib uçuruma itələdi və bir an mənə elə gəldi ki, bu dəqiqə maşın da qayanın ardınca dərəyə yuvarlanacaq. Lakin mən gözümü yumub-açınca gənc oğlanın eyni sakit və qayğısız təbəssümlə buldozeri geri verdiyini görüb, onun bir-birinə qarışmış sarı saçlarına, dağ havasında yanıb qaralmış gözəl üzünə qəzəblə baxaraq: – “Bu ki xuliqanlıqdır!” deməkdən özümü güclə saxladım.

Adil digər iki oğlanla söhbətini kəsib, mənə sarı döndü və bir qədər aralıda ağacların arasında ağaran çadırı göstərdi:

– Bəlkə biz də orada düşək?

Mən isə, uçurumun kənarındakı tək palıd ağacını göstərib:

– Bura yaxşıdır, – dedim.

Şeylərimizi maşından boşaltdıq. Palıd ağacının altında çadırımızı qurub, çarpayıları, qatlama stol və stulları açaraq mənzilimizi səliqəyə saldıq. Evin içində döşəmə əvəzinə yaşıl dağ otları və onların arasına səpələnmiş al lalələri görmək adama qəribə gəlirdi.

Hələlik bura yol rəisinin qərargahı üçün ən əlverişli yer idi. Yol irəlilədikcə məskənimizi də dəyişə bilərdik. Adildən əvvəlki rəis isə rayon mərkəzində qalırmış.

Hər ikimiz paltarımızı dəyişəndən sonra məhraba, sabun götürüb çaylağa endik. Qollarımızı, boyun-boğazımızı sərin, şəffaf dağ suyu ilə yuyub quruladıq. Heç birimiz yorulmamışdıq. İkimiz də gənc, gözəl və təravətli idik. İkimiz də özümüzü bu yerlərin köhnə sakinləri kimi hiss edirdik. Elə bil ki, burada, bu almaz kimi saf dağ havasında doğulmuşduq. Elə bil ki, bu uçurumlu sərt qayalarla, onların üzərində qıvrılan qarağat kolları ilə əkiz yaranmışdıq. Elə bil ki, biz bu coşğun təbiətin bir parçası, bir hissəsi idik.

– Adil, çay istəyirsənmi? – deyə soruşurdum.

Öz səsimin ahəngindən, mehribanlığından dərin bir məmnuniyyət, zövq duydum. Mənə elə gəlirdi ki, heç bir zaman onu özümə bu qədər yaxın, bu qədər doğma hiss eləməmişəm. Və elə bu andaca buldozerçinin bayaqkı xuliqansayağı hərəkətini, mənə baxıb istehza ilə, qayğısızlıqla gülümsəyən gözlərini xatırlayıb əsəbiləşdim. Sonra eyni mehribanlıqla sualımı təkrar etdim:

– Adil, çay qoyummu?

O, nəzərlərini bir az aralıdakı tikinti materialından çəkərək:

– Pis olmazdı, – dedi.

Mən neft pilətəsini çölə çıxarıb yandırdım. Balaca nikel çaydanı doldurub üstünə qoydum. Stolun üzərinə ağ süfrə saldım. Şəkərçörəyi, konfet qoydum. Sonra körpüsalanları da çay içməyə dəvət elədik.

Əvvəl ortaboylu, qara-şirin bir oğlan olan Soltanla enlikürək, iri, qaraqaş, qarabığ Kərəmxan gəldilər. Sonra ağır addımlarla buldozerçi Qəribcan gəldi. Məni əsəbiləşdirən o laübalı təbəssüm yenə də üzündəydi. Mən ciddi görkəmlə onun qabağına çay qoydum, sonra:

– Sizin adlarınız bir-birinə nə yaxşı yaraşır, – deyə Soltana müraciətlə gülümsədim.

– Bunun əsl adı Qəribdir, – deyə Soltan buldozerçiyə işarə elədi, – burada Qəribcan eləmişik.

Lakin buldozerçiyə tərəf baxmadım. Adil nəzakətlə gülümsəyərək:

– Qərib yoldaş bu rayondandır? – deyə soruşdu və onun üç nəfərdən yalnız buldozerçinin haralı olması ilə maraqlanması mənə qəribə göründü. Həm də düşündüm ki: “Nə üçün Qəribcan yox, Qərib?!”

– Bəli, – deyə Soltan cavab verdi, – üçümüz də bu rayondanıq, ancaq kəndlərimiz ayrıdır. Qəribcan ordudan təzə buraxılıb.

– Eləmi? – Adil buldozerçiyə baxdı. – Hansı hissədəydiniz?

– Tank qoşunları hissəsində, – deyə buldozerçi cavab verdi. Mənə elə gəldi ki, ömrümdə bu cür səs eşitməmişəm... Qeyri-adi bir hərəkətlə başımı döndərib ona baxdım. Bu dəfə o gülümsəmirdi.

Adil yenə soruşdu:

– Sıravi idiniz?

– Kiçik leytenant idim.

– Çox gözəl... Çayınızı soyutmayın.

Mən onların stəkanlarını yenidən doldurdum. "Qəribcan..." Mən heç belə ad eşitməmişdim. Yalnız çox sonralar... indi bu sətirləri yazarkən, yadıma düşdü ki, mən o vaxtacan heç "Kərəmxan" adına da rast gəlməmişdim.

Adil yolda işlərin necə getdiyini soruşdu:

– Hamısı materialın vaxtında verilməsindən asılıdır, – deyə Soltan cavab verdi, – işçilər əllərindən gələni eləyirlər.

Sonra o, keçmiş yol rəisini təriflədi:

– Od-alov idi. Elə bil, quş kimi ağacda yatırdı. Onda görürdük ki, bu "QAZ-69"da (Soltan biz gələn maşına işarə elədi) böyürdən çıxdı.

– Dəstgahlı adam idi, – deyə Kərəmxan əlavə etdi, – hər ay maaşının yarıdan çoxunu Qəribcana uduzub gedirdi.

– Necə? Bəyəm, qumar oynayırdınız? – Adil, elə bil ki, qorxdu.

– Bilirsinizmi, – deyə Soltan izah elədi, – həmişə maşında özü ilə bir tir tüfəngi gəzdirirdi... hər bura gələndə Qəribcanla bəhsə girib, mərclə nişan atırdılar...

– Nə bilim, bir dəfə ipək köynəkdən, – Kərəmxan Soltanın sözünü kəsdi, – bir dəfə on paçka "Kazbek"dən.. Bir dəfə konyakdan... hamısını da Qəribcan aparırdı, naçalnik də dilxor olub gedirdi... Deyirdin, tay bir də əlinə tüfəng almaz. Ancaq bir neçə gündən sonra görürdün, budur, uduzduğu şeyləri də alıb, bir qutu güllə ilə gəldi.

– Demək, belə "od-alov imiş"... – deyib Adil Soltanın bayaqkı sözlərinə işarə ilə gülümsədi.

– İşləməyinə söz yox idi, – Soltan cavab verdi, – dediyini eləməli idi. Bu günün işini sabaha qoymazdı.

– Əhli-hal oğlan idi, – Kərəmxan təəssüflə başını tərpətdi, – deyirdim, "yoldaş naçalnik, bir dəfə də mənimlə, bu Soltanla nişan atsana..." "Yox, – deyirdi, – gərək bu Qəribin dərsini verim, sonra... Məni bərk yandırıb".

– Nə yaman məzəli rəis imiş, – deyə mən gülümsəyərək, birinci dəfə Qəribcanın gözlərinə baxdım.

– Yaman da rəis imiş, – körpüsalanlar gedəndən sonra Adil narazılıqla dedi, – gənclərin tərbiyəsini elə belə rəhbərlər korlayırlar. (Körpüsalanlar, doğrudan da, çox gənc idilər. İyirmi üç-iyirmi dörd yaşları ancaq olardı.)

– Nə üçün ki?

– Bilirsənmi, Səriyyə, rəis, idarə başçısı hər bir hərəkəti ilə, hətta, danışığı və təbəssümü ilə də öz işçilərinə nümunə olmalıdır. Bir də ki... bir də ki, rəis rəisdir, fəhlə də fəhlə. Aradakı pərdəni götürdün, heç nə. Rəis öz işçisi ilə konyakdan mərc gəlib, güllə atanda, orada nə intizam olacaq, işçinin yanında rəisin nə hörməti olacaq?

Bunlar hamısı ağıllı sözlər idi və bu ağıllı sözləri mənim rəis olan ərim deyirdi. Lakin qəribədir, bəzən ağıllı hesab elədiyimiz sözlər biz gənclərin yadında yaxşı qalmır. Ürəyimizdə ehtiras alovlandırmır. Əksinə, bizdə anlaşılmaz, soyuq bir hissə çevrilir və biz onları tezliklə, elə həmin dəqiqə unuduruq. İndi də belə idi. Mən ərimin sözlərini təsdiq etdiyim halda, buldozerçinin keçmiş rəisi necə məğlub etdiyini, onun (rəisin) hər dəfə mərci uduzaraq, necə özündən çıxdığını gözümün qabağına gətirib gülümsəyirdim. Mən orada olmaq, o məzəli rəisi görmək istərdim.

– Niyə gülürsən? – Adil ciddi ifadə ilə soruşdu.

– Heç... keçmiş rəisin yüngüllüyünə.

Mən, birinci dəfə olaraq, öz duyğularımı ərimdən, mənim ağıllı və işgüzar ərimdən gizləyirdim.

– Doğrudan da gülməlidir, – deyə o qalxıb körpüsalanların yanına getdi.

... Meşəli dağların ardındakı o varlı sovxoza çəkilən yolda qızğın iş gedirdi. Mən körpüsalanlarla birlikdə həm vəzifəmi yerinə yetirir, həm də özümüz üçün yemək-içmək hazırlayırdım. Adil isə, “QAZ-69”da hər gün iş sahələrini gəzir, göstəriş verir, lazım olan materialları daşıtdırırdı. O, qonşu rayonla əlaqəyə girib, yolun üstünə iki yeni ekskavator gətirtmişdi. Havalar yaxşı keçdiyindən, biz tələsir, payız yağışları başlayana qədər ağır işləri görüb qurtarmağa can atırdıq. İki dəfə, hərəsində də dörd fəhlə bizə köməyə gəldi. Lakin sonra daha kömək istəmədik. Bizdən bir qədər yuxarıda, Dəvəboyu deyilən dağın ətəyindəki iki selab üzərində də kiçik körpülər salınmasına başlan-

mışdı. Həftədə üç-dörd dəfə səhər tezdən mən "QAZ-69"a əyləşib, azuqə almaq üçün rayon mərkəzinə gedərdim. Bu zaman Soltan da mənə pul verib:

– Səriyyə xanım, – deyərdi, – bizim üçün də ayından-oyundan alın.

– Məsələn, nə cür ayın-oyun?– deyə mən də zarafatyana soruşardım.

– Nə bilim, ətdən, yumurtadan...

– Aydındır, – deyə maşını işə salıb tərpənirdim...

Əvvəllər özümüzlə yanaşı, onlar üçün də xörək asardım. Sonra bunun Adilə xoş gəlmədiyini hiss edib, vaz keçdim. Lakin, bununla bərabər, onun bu hərəkəti mənə yaxşı təsir bağışlamırdı. Məsələn, mən özümüz üçün kotlet hazırlarkən, qonşumuz körpüsalanların nahara bir şey bişirmədiklərini görüb vicdan əzabı çəkirdim. Sizdən nə gizlədim, hərdən Adil evdə olmayanda, onların çadırına gedir, könülləri nə istədiyini soruşur və cəld bişirib qayıdırdım. Bir gün də onların çadırına gedəndə buldozerçinin qapıda oturub üst köynəyinin yaxasına düymə tikdiyini gördüm. Mən onun bütün diqqətini toplamasına baxmayaraq, iynəni necə bacarıqsız işlətdiyinə gülümsəyərək:

– Verin mən tikim, – dedim.

O bunu gözləyirmiş kimi, darıxmış halda ayağa qalxaraq, köynəyi mənə uzatdı:

– Bu hazır paltarları elə başdansovma tikirlər ki, əyninə geyən kimi düymələri qırılıb tökülür.

Mən qopmuş düyməni tikib qurtarandan sonra o birilərini də bərkitdim.

– Deyəsən, köynəyi özünüz yumusunuz?..

– Bəli, özüm yumuşam. Bu həftə macal tapıb kəndə gedə bilmədik.

Mən ayağa qalxdım:

– Bu saat ütüləyib gətirərəm.

– Lazım deyil. Nə zəhmət çəkirsiniz ki...

– Bir zəhməti yoxdur.

Mən ütünü qızdırıb buldozerçinin köynəyini ütüləyirdim. Hər dəfə əlim köynəyə toxunarkən özümdə qəribə bir duyğu hiss edirdim. Elə diqqətlə, elə həvəslə ütüləyirdim ki, elə bil, hamı onun köynəyinə baxıb mənə afərin deyəcəkdi. Onun həmişə yaxasının yuxarıdakı düymələrini açıq qoyduğunu bilirdim. Ona görə də köynəyin yaxalığını buna uyğun tərzdə ütülədim ki, əyində qəşəng dursun. Mən köynəyin enli

kürəyinə baxıb özümdə anlaşılmaz bir fərəh duyurdum. Mən köynəyin üzərində incə bir qırışın da qalmamasına səy edirdim. Birdən “QAZ-69” siqnal verərək sürətlə gəlib qapıda dayandı. Mən tələsmədən köynəyi səliqə ilə qatladım. Və elə bu zaman Adil çadıra girdi.

– Bu kimindir, Səriyyə?

– Buldozerçinin.

– Buldozerçinin köynəyini niyə sən yuyursan?

– Yumamışam, ütüləmişəm. Bir də... bir də, düyməsi qırılmışdı, tikmişəm...

– Axı, nə münasibətlə...

– Heç... elə-belə.

O, daha bir söz demədən sabun və dəsmal götürüb çadırdan çıxdı. Mən onun necə tez-tez addımladığına arxadan baxaraq, buldozerçinin köynəyini aparıb çadırlarında özünə verdim. Sonra eyni sakit addımlarla geri qayıdıb, çadırın qabağına sərin kölgə düşdüyündən, stolu bayıra çıxararaq, üstünə salat, göy-göyərti, çəngəl-bıçaq qoydum. Sonra təzə mal ətindən bişirdiyim xörəyi və qızartmanı boşqablara çəkib gətirdim. Bakıdan aldığım balaca qrafini soyuq su ilə doldurdum. İşdən qayıdarkən dağın döşündən dərdiyim çiçəkləri də stəkanda stolun üstünə qoymuşdum. Adil yuyunub qurulandıqdan sonra ikimiz də üzbəüz əyləşib nahar elədik. Stolun üstündə hər şey təmiz və təravətli idi, dağdan sərin və ətirli meh əsirdi. Bir qədər aralıdan, meşə ağacları arasındakı körpüsalanların deyib-gülmələri eşidilirdi. Birdən Kərəmxan:

Uca barıdan aşaram mən,
Yarıma kəniz qoşaram mən,
O qızı mənə versələr,
Hacının qızını boşaram mən...

sözlərilə başlayan qədim və məzəli bir mahnı oxudu. Oğlanlardan hansı isə bərkdən çırtıq vururdu. Kərəmxan çırtığa uyğun tərzdə təkrar edirdi:

O qızı mənə versələr,
Hacının qızını boşaram mən...

Mən qeyri-iradi gülümsəyərək:

– Adil, – dedim, – nə olub, niyə qanın qaradır?

– Heç bir şey olmayıb... Sən də nahaq yerə hər axmaq sözə gülürsən...

Mən birinci dəfə idi ki, Adildən belə sərt sözlər eşidirdim. Birinci dəfə idi ki, o, qızarıb-bozararaq, özünü saxlaya bilməyib mənə belə sözlər deyirdi. Nə olar, bəlkə mən, doğrudan da, yüngüllük eləmişdim. Bəlkə, doğrudan da, gülmək lazım deyildi. Bu körpüsalanlar da qəribə adamlardır! Belə sözləri haradan tapıb oxuyurlar? Necə yəni "o qızı mənə versələr, hacının qızını boşaram?" Ürəyimdə Adilə deyirdim: "Məni bağışla, əzizim, sənin məni tənqid eləməyə haqqın var... Axı, biz həyat yoldaşıyıq. Lakin, əgər, bir də o buldozerçinin, ya da məsələn, Kərəmxanın köynəyinə ütü çəkmək lazım gəlsə, mən bunu edəcəyəm. Sən də mənim bu cür hərəkətlərimə adət etməlisən. Başqa sayaq mümkün deyil..."

– Dur bir az uzan, Adil, yəqin ki, yorğunsan. Mən də stolu yığışdırıb körpüsalanların yanına gedəcəyəm.

– Körpüsalanların yanında nə var? İş vaxtı qurtarıb ki? – deyə o, üzümə baxmadan yavaş səslə soruşdu.

– Elə-belə, adam darıxır...

– Darıxırsan, götür kitabdan-zaddan oxu.

– Kitab oxumaq istəmirəm.

O bir söz demədən qalxıb çadıra girdi. Mən də qab-qacağı təmizləyib yerbəyer elədim. Çaydanı doldurub pilətənin üstünə qoydum. Adil nahardan sonra iki saat dincəlib çay içəcəkdi. Bu, onun adəti idi.

Mən əl-üzümü yuyub qurulandıqdan sonra balaca stolun üstündəki güzgünün qabağında dayanaraq, saçlarıma ətir səpdim.

Adil arxası üstə çarpayıda uzanıb qəzet oxuyurdu.

Məni əhatə edən və hələ çiçəyini tökməmiş meşələrdən, bir az aralıda şırıldayan büllur kimi şəffaf dağ suyundan tutmuş, üzərində daim ağ bir qartal hərlənən uçuruma, ondan o yana görünən yaşıl dağlara qədər hər şey gözəl idi. Mən də gözəl və təravətli olmaq istəyirdim. Mən təbiətin bu coşğun ahəngindən, bu gözəllik təntənəsindən kənarda qalmaq istəmirdim. Mənim "sirrim" bundan ibarət idi.

Adil qəzeti üzündən kənar edərək acıqla soruşdu:

– Körpüsalanlar konsert verirlər?

– Yox, Adil, konsert vermirlər, tennis oynayırlar. Dünən o buldozerçi iki dəfə məni aparıb, gərək ondan qisasımı alım. Sən də uzan dincəl. Bir azdan çay dəmləyəcəyəm.

O bir söz deməyərək yenə də qəzetə baxdı.

– Hələlik, Adilcan!

Çadırın qapısında Soltanla Kərəmxan tennis oynayırdılar. Buldozerçi isə, yosunlu bir daşın üstündə oturub, bıçaqla əl çubuğu qayırırdı, məni görərkən üçü də gülümsədi. Buldozerçi cəld qalxıb, içəridən kətil gətirdi.

– Səriyyə xanım, gəl dostunun halını xəbər al, – deyə Kərəmxan, qızarıb pörtmüş Soltana işarə elədi. (Tanışlığımızın, lap ikinci günündən Kərəmxan da, Soltan da mənə "sən" deyə xitab edirdilər. Yalnız buldozerçi "siz" deyirdi.) – Hələ iki dəfə birtəhər olub.

– Cücəni payızda sayarlar, – deyə Soltan gözünü oyundan çəkməyərək cavab verdi.

– Baxma, söz son gülənindir...

Bu dəfə, doğrudan da, Soltan qalib gəldi və hesab dörd ilə iki oldu. Kərəmxan alnının tərini silə-silə zarafatında davam edirdi:

– Bu iki xalı elə-belə qəsdən uduzdum, dedim, Səriyyə xanımın yanında pərt olmayasan...

Mən nazik parusin jaketimi çıxarıb kənara, otların üzərinə tullayıb, raketkanı götürürdüm və buldozerçiyə:

– Durun, – dedim.

O, ayağa qalxaraq mənim jaketimi yerdən götürüb yandakı palıd ağacının budağına keçirdi. Sonra üzümə baxmadan:

– Başlayın! – dedi.

Kərəmxan oyunu diqqətlə izləyərək:

– Qəribcan, – deyirdi, – özünü gözlə, Səriyyə xanım bu dəfə yaman girişib...

Doğrudan da, mən yaman girişmişdim. Hətta, gecə yerimin içində xeyli oyaq qalaraq, dünən buraxdığım səhvləri bütün aydınlığı ilə xəyalımdan keçirir və yanıb-tökülürdüm. Axı, mən texnikumda ən yaxşı tennisçilərdən biri sayılırdım. İndi neçə dəfədir ki, bu buldozerçi dalbadal məni məğlub edir. Mən Soltanla Kərəmxana asanlıqla qalib gəldiyim halda, ona uduzurdum. Halbuki onlar təkbətəkdə buldozerçini dəfələrlə məğlub etmişdilər.

Bu gün həmişəkindən yüngül geyinmişdim. Ayaqlarımda məs, əynimdə qolları çiynimə qədər açıq nazik və qısa don var idi. Mən oyuna o qədər ehtirasla girişmişdim ki, bəzən özümü unudaraq:

– Yox, düz deyil, düz deyil, – deyə uşaq kimi qışqırır, cığallıq edirdim.

Soltan mənim tərəfimi saxlayırdı, Kərəmxan isə buldozerçinin. Bir dəfə buldozerçi ilə mübahisə elədiyimiz vaxt Kərəmxan onun sözünü təsdiq etdikdə, mən hirslənib özümdən çıxaraq az qala raketka ilə onu vurmaq istədim. Kərəmxan kənara sıçrayıb bərkdən güldü:

– Aya, sən ölmüyəsən, bu Səriyyə xanımdan qorxmaq lazımdır.

Buldozerçi isə, nə dinir, nə də gülümsəyirdi. Üzündə elə bir ifadə vardı ki, elə bil, oyunu aparacağına qətiyyən şübhəsi yox idi. Bu da məni hər şeydən çox yandırırdı. Bu dəqiqələrdə mən onu məğlub etsəydim, ürəyimdən tikan çıxardı. Mənim özümə və ona acığım tuturdu. Onun üzündəki o qəribə ifadə və əlinin arxayın, sərbəst hərəkəti diqqətimin bir hissəsini oyundan yayındırırdı. Bəzi anlarda tennisdən ziyadə öz hisslərimin anlaşılmaz gərginliyinə uyurdum. Oyunda onu aldatmaq əvəzinə özüm aldanırdım. Belə hallarda o, xəfifcə gülümsəyir və sərrast zərbə endirirdi.

Bütün cidd-cəhdimə baxmayaraq, mən yenə də dünənki kimi məğlub oldum. Heç olmazsa, bir oyun da apara bilmədim. Saçlarımı düzəldərək, əlim çatmadığı üçün:

– Jaketi alıb mənə verin, – deyə acıqla buldozerçiyə müraciət etdim.

O, eyni sakit, sərbəst hərəkətlə jaketi budaqdan götürüb, geyməyim üçün iki əli ilə tutdu, mən də bu xidməti kibrli bir təşəxxüslə qəbul edib, ona təşəkkür etmədim.

– Bəs turu davam etdirməyək? – deyə Soltan məndən soruşdu.

– Bu günlük bəsdir, – dedim.

Daha oynamağa marağım qalmamışdı.

Kərəmxan içəridən bir boşqab təzə gilas gətirdi:

– İndi ki, oynamırsınız, gəlin novbar eləyin.

Mən yerdə otların üstündə oturub, onlarla birlikdə gilas yeyir və ağzımı büzüb çəyirdəyini uzağa üfürürdüm. Buldozerçi isə, yenə də çubuğa naxış vururdu. Birdən o mənə baxaraq gülümsədi.

– Hə, nə var, – dedim, – yoxsa öyünürsünüz?

– Yox, – dedi, – sizin gilasın çəyirdəyini elə tullamağınız uşaqlıq günlərimi yadıma saldı. Bəhsə girib ağzımızı su ilə doldurardıq ki, görək kim uzağa atacaq...

– Demək istəyirsiniz mən də indi uşaqlıq dövrü keçirirəm?

– Yox, elə deməz, – Kərəmxan dostunun əvəzinə cavab verdi.

Buldozerçi gözləri əlindəki işində olduğu halda:

– Bəyəm uşaqlıq pisdir? – dedi, – indi uşaqlığımı mənə qaytarsaydılar...

– Nə edərdiniz? – deyə maraqla soruşdum.

Lakin o, qaşlarını çatıb cavab vermədi. Birdən-birə bütün acığım soyudu. Meh əsib onun yumşaq, sarı saçlarını hərdən tərpədir və bu zaman o mənə haradansa, uzaq, çox uzaq yerdən gəlmiş naməlum bir adam kimi görünürdü. "Nə üçün mən Kərəmxan və ya Soltanla olduğu kimi ona da "sən" deyə xitab eləmirəm. Nə üçün Adil də, mən də onu yoldaşlarından ayırırıq?.. Açıq olmasa da, ürəyimizdə ayırırıq..."

Elə bu zaman üçtonluq böyük yük maşını körpünün altına qoyulacaq boruları gətirdi. Dördümüz də qalxıb maşının qabağına yeridik. Oğlanlar köməkləşib, boruları maşından endirdilər.

Soltan, şoferə düşüb dincəlməyi təklif etdi. Lakin o:

– Yox, gecdir, gərək tez qayıdam. Səhər tezdən sizin üçün sement gətirəcəyəm, – deyib maşını döndərdi.

Sərin axşam kölgəsində, çiçəkli otların içində yanaşı qoyulmuş üç paslı boru mənə üç təzə qonaq kimi qəribə bir təsir bağışlayırdı. Elə bil ki, onlar bu saat dil açıb bizə bir xəbər verəcəkdilər. Elə bil ki, onlarla bizim aramızda bir ünsiyyət, bir yaxınlıq vardı. Bu qara çuqun borular tər otlar içində sanki sevinirdi. Sanki onlar gülümsəyir və pıçıldaşırdı.

"Görəsən, uşaqlığı geri qayıtsaydı, bu buldozerçi nə edərdi? Ax, lap yadımdan çıxıb ki, Adilin duran vaxtıdır. Gecikmişəm..."

– Sağ olun, uşaqlar, mən qaçdım!

... Adil bayırda oturub, ucu həmişə səliqə ilə yonulmuş karandaşla dəftərçəsinə nə isə yazıb-pozurdu.

– Adil, çoxdan durmusan?

– Bir az olar...

– Bu saat çay dəmləyim. Bilirsənmi, borular gəldi...

– Gördüm.

– Adil, maraqlıdır, elə deyilmi?

– Nə maraqlıdır?

– Bu meşələrin, otların, çiçəklərin arasında çuqun borular görmək adama birtəhər gəlir...

– Necə yəni, birtəhər gəlir?

– Heç özüm də bilmirəm. Ancaq buldozerçi yenə də məni apardı.

– Doğrudanmı?

– Lap yanıb-töküldüm, bu gün onu elə məğlub etmək istəyirdim ki... Sənin üçün mürəbbə də gətirimmi?

– Gətir...

Mən balaca rozetkanı şəhərdən gətirdiyim gilənar mürəbbəsi ilə doldurub, stolun üstünə qoydum. Sonra çaylarımızı tökərək (mən rəngli çayın əsəbləri sakit etdiyini bildiyim üçün Adilin çayını tünd elədim):

– Adil, – dedim, – bu gün elə işləmişik ki, belə getsə, körpünü lap tez salacağıq.

Bir qədər susaraq əlavə etdim:

– Demək, bunu qurtarandan sonra yuxarıda, Qızılqayanın altındakı körpünü başlayırıq?

O, çayından bir qurtum alaraq, başı ilə təsdiq etdi.

– Bu yol, bu körpülər bizdən yadigar qalacaq. Kim bilir, bu yol ilə dağların o tərəfindəki o varlı fermalara nə qədər adam, maşın gəlib-gedəcək! Elə deyilmi, Adil?

– Elədir...

– Biz hələ cavanıq, hələ əsl işə yenicə başlayırıq. Eh, hələ nə qədər bu cür yollar, körpülər salacağıq... Bilirsənmi, bu Soltangil çox yaxşı oğlanlardır. O buldozerçi ki, var, qiyabiçidir, politexnik institutunun mexanika fakültəsində oxuyur. Mühəndis olacaq...

– Nə bildin, özü dedi?

– Yox, yoldaşları dedilər. Dünən işdən sonra gördüm fizika öyrənir. Adil, mən də qiyabi oxuyaram. Bu daha yaxşıdır, elə deyilmi?

– Madam ki, sən istəyirsən, demək elədir. Ancaq o buldozerçi çox yaraşıqlı oğlandır... Bəzən dayananda elə bilirsən dahi bir rəssam tərəfindən çəkilmiş portretdir.

O bu sözləri mənim üzümə baxmadan, çayına mürəbbə saldığı zaman dedi. Mən, heç ürəyim istəmədiyi halda, qalxıb özümə yenə çay tökdüm, sonra mən də ona baxmadan:

– Əvvəllər, – dedim, – mənə elə gəlirdi ki, o buldozerçi özündən bədgümandır.

– Nə barədə?

– Bilmirəm. Elə-belə. Ancaq bayaq hiss elədim ki, mənim düşündüyüm kimi deyilmiş... Adil, sən orduda olmusan?

– Yox, olmamışam. Ancaq institutda hərbi dərs keçmişik. Nə üçün soruşursan ki?

– Heç, elə-belə. Bu kiçik leytenant rütbəsi nəyə lazımdır? Ola bilməzdi ki, elə serjantdan sonra birbaşa leytenant rütbəsi gələydi?

– Bu suala cavab verməkdə çətinlik çəkirəm. Məncə, ola bilərdi...

– Məncə də ola bilərdi. Axı, kiçik leytenantla leytenantın arasında nə böyük fərq varmış ki... Mən hərbi nazir olsaydım, bu barədə düşünərdim... Adil, müharibə zamanı, məsələn, bir kiçik leytenant general rütbəsinə çata bilərdi?

– Çata bilərdi.

– Yox, Allah eləməsin müharibə olsun... Mən müharibəyə nifrət edirəm. Ona görə yox ki, qorxuram. Ona görə ki, müharibə sözünün özündə, nə isə, dəhşətli bir soyuqluq var, elə deyilmi, Adil?

– Elədir...

– Sabah körpü divarlarının bünövrəsini qoyacayıq. Mən istəyirəm bu yol tez çəkilib qurtarsın. "QAZ-69"a oturub birbaşa dağların arxasındakı o fermalara sürüm.

– Tək? – deyə o gülümsədi.

– Yox, əlbəttə, səninlə.

Mən indicə nə demək istədiyimi yadıma salmaq üçün bir neçə an susdum. Sonra:

– Hə, – deyə sevinclə davam etdim, – bilirsənmi, Adil, dağların dalındakı o fermalar bəzən mənə qəribə, əfsanəvi bir aləm kimi görünür. Mənə elə gəlir ki, orada həyat başqa cürdür...

– Yəni, nə cür?

– Yəni... yəni, daha sərbəst, daha xoşbəxt...

– Məgər, biz burada sərbəst, xoşbəxt deyilik?

Mən susdum. Gözüm yol çəkdi.

– Əlbəttə, məncə, xoşbəxtik. Ancaq bil ki, orada, nə isə, daha fərəhli bir şey görəcəyik...

Adil mənə cavab verməyərək uçuruma tərəf baxırdı... Günəş çoxdan batmışdı. Uçurumdan o yana dəniz kimi qaralan tək-tək işıq gəlirdi. Dərənin göz işlədikcə uzaq qurtaracağında güclə seçilən, dağın döşündə isə yüzlərlə başqa işıqlar yanmışdı və elə görünürdü ki, elə bil, havada nəhəng bir gəmi dayanıb. Sanki bu gəmi məchul bir aləmdən gəlib, hara isə yenə də baş alıb gedəcəkdi. Hərdən körpüsalanların danışıq və gülüşləri eşidilirdi. Körpüsalanlar... demək biz, yəni, mən və onlar körpüsalanlarıq. Ancaq bu buldozerçi iki gündür, dalbadal məni tennisdə yaman aparır. Demək, əgər, müharibə olsaydı,

bu kiçik leytenant buldozer əvəzinə tankda oturardı. Kim bilir, bəlkə də qəhrəman olardı. Yox, mən müharibəyə nifrət edirəm. “Müharibə” sözü adamı üşüdür.

... Gecə çarpayıda arxası üstə uzanıb, gözlərimi qaranlıq çadırın qapısından görünən ulduzlarla dolu göyə zilləmişdim. Elə bil, yanımızdan üzüaşağı sürətlə axan balaca çay öz gümrah şırıltısı ilə hey təkrar edirdi: “Biz körpüsalanlarıq... Biz körpüsalanlarıq...”

... Səhər tezdən ikimiz də eyni vaxtda qalxdıq. Məhraba, sabun, diş fırçası götürüb suyun üstünə endik. Körpünün tikilişinə mane olmasın deyə, hələ biz gəlməmiş Soltangil digər fəhlələrlə birlikdə balaca çayı öz axarından başqa səmtə döndərmişdilər və bu yeni məcra o qədər də dərin olmadığından, su yayılaraq axırdı. Saysız-hesabsız xırda rəngarəng daşlar bu şəffaf suyun içində muncuq kimi işıldayırdı. Haradansa zərqanadlı böcəklər uçub gəlmişdi. Günəş uçurumdan o yana, ta uzaq dağlara qədər uzanan dərəni parlaq işıqla doldurmuşdu. O ağ qartal yenə də uçurumun üzərində hərlənərək, aşağıları sakit və məğrur baxışlarla süzürdü. Dərənin dibindən orada-burada boz tüstü burumları qalxırdı. Yaxındakı ağacların yarpaqları arasında quşlar səs-küy salmışdılar. Biz yuyunub qayıtdıqda, Soltan, Kərəmxan və Qəribcanın rayona tərəf gedən yolda, əyinlərində qolsuz köynək, başıaçıq dayanıb yüyürməyə hazırlaşdıqlarını gördük. Mən məhraba-sabunu tələsik Adilə verib körpüsalanların yanına yüyürdüm və onlarla yanaşı duraraq:

– Mən də ötüşürəm, – dedim.

Kərəmxan:

– Lap yaxşı, – dedi. – Ancaq şərtimiz budur ki, kim birinci çıxsa, dalda qalanların hərəsinə on beş lopuq vuracaq.

– Olsun! – dedim.

– Bax, yolun qırağındakı o yemişan ağacına qədər qaçacağıq.

Kərəmxan bunu deyib komanda verdi:

– Hazır ol! Bir, iki, üç!

Mən təxminən yüz metr məsafəni necə qaçdığımı bilmədən, ağaca çatıb, dərhal geri döndüm. Körpüsalanlar yalnız indi gəlib yetişdilər. Azı, on beş-iyirmi saniyə sonra...

– Sağ ol, vallah, – Kərəmxan tövşüyə-tövşüyə mənə baxdı.

– Hə, – dedim, – uzun söz nə lazım, sıraya durun, ovurdlarınızı hazırlayın.

Onların üçü də yanaşı durub ovurdlarını şişirtdi. Soltanla Kərəmxana lopuq vurandan sonra buldozerçiyə yaxınlaşıb:

– Boyunuz çox ucadır, bir az əyilin, – dedim.

O, uşaqla rəftar edirmiş kimi, gülümsəyib başını aşağı əydi, üzünü mənə yaxın tutub ovurdlarını şişirtdi. Bir bu üzünə, bir o üzünə elə vurdum ki, yazığın gözləri yaşardı.

Soltan bərkdən gülərək:

– Vur, Səriyyə, – dedi, – tennisdəki heyfimizi al.

Lopuqları vurub qurtarandan sonra buldozerçinin qızarmış üzünə baxdım:

– Hə, necədir, istəyirsiniz bir də qaçaq?

– Qaçaq, qaçaq! – deyə Soltan qışqırdı.

– Mənim işim deyil, – buldozerçi üzünü ovuşdurdu.

– Amma nə vurdu, – deyə Soltan ona nəzər saldı.

Bu vaxt "QAZ-69" sürətlə gəlib yanımızdan keçdi. Mən sükan arxasında oturmuş Adili görüb, çığırdım: "Bay, Adil niyə belə tez getdi?" Sonra dönüb tələsik çadıra gəldim. Adil çay içməmiş çıxıb getmişdi. Mən bir neçə saniyə hərəkətsiz dayanıb, onun stolun üstünə atılmış pencəyinə baxdım. Bu, dörd-beş ay bundan qabaq məhz mənim zövqümlə tikilmiş idmançı formasında açıq rəngli kostyumun pencəyi idi. Mən onun bu paltarını çox xoşlayırdım. Bu kostyumda o mənə daha yaxın və daha sadə görünürdü. Elə bil ki, bu kostyumu geyəndə, onun özünü ciddi və tox tutmaq cəhdi birdən-birə yox olub gedir, əvəzində mənim çoxdan tanıyıb-xoşladığım, gülüb-zarafat elədiyim gənc oğlan zahir olurdu və mən həmin bu səmimi oğlanın ərim olmasından məmnun qalırdım.

İndi mən bunları düşünərək pencəyə baxarkən, birdən o mənə bütün bizi əhatə eləyən varlıqdan təcrid olunub sonsuz boşluqda dayanmış kimi görünürdü. Bu yaxınlarda Mars haqqında yazılan bir məqalədə oxumuşdum ki, əgər, Yer kürəsi daim sıfırdan aşağı filan temperaturda qalsaydı, o zaman bütün dənizlərin, okeanların yuxarı hissəsi, üzərini toz basmış bərk bir maddəyə çevrilərdi. Mən ürəyimdə, nə isə, soyuq və darıxdırıcı bir şey hiss edib, gözümü Adilin pencəyindən çəkdim. Sonra tamam qeyri-şüuri bir hərəkətlə irəlilədim, çaydanı götürüb özümə çay tökdüm. Eyni donuq hərəkətlə çörək kəsib üstünə yağ çəkdim. Lakin birdən-birə heç iştaham olmadığını hiss etdim və çörəyi süfrəyə qoydum, Adilin pencəyini stolun üstündən götürüb, burada

meşə ağaclarından düzəltdiyim asqıya keçirtdim. Qəribədir, mən pencəyi əlimə alanda, sanki o birdən-birə canlandı və elə bil, özü mənim əlimdən aralanıb asqıda bənd aldı. Bu gözəl yaylaq sabahında, yaşıl kol-kos altındakı qayalardan çıxaraq, günəşin brilyant şüalarını əks etdirib gümrah şırıltı ilə uçuruma tökülən suyun yaxınlığında, çadırın içindəki sükut dözülməz, ağır bir şeyə çevrildi. Mən heç nə düşünməməyə çalışaraq, cəld çadırdan çıxdım. Buldozerçi körpü salınan yerə gedirdi, üzünü təzə yumuşdu, saçları hələ yaş idi. Məni görərkən gülümsədi.

Mən yuyunandan sonra saçlarımı yaxşı səliqəyə salmadığımı xatırlayaraq, təkrar dönüb çadıra girdim və balaca stolun üstündəki güzgünün qabağında dayandım. Mənim sol yanağımda uşaqlıqdan ilyarasının yeri qalmışdı. Dünən biz tennis oynayanda iki-üç dəfə buldozerçinin nəzərlərini, ani olaraq, öz üzümdə hiss eləmişdim. O həmin bu ilyarasının yerinə baxırdı.

Təbiətin qəribə işləri var. Vaxtilə məni çox incitmiş, əzab vermiş o yaranın yeri indi mənim üzümə, necə deyim, qəribə bir yaraşıq verirdi və bunu başqa birinin duyub-hiss etməsi, gizli olaraq, mənim xoşuma gəlirdi.

Mən özümü quş kimi yüngül və təravətli hiss edirdim. İşin üstünə getdim. Üç yoldaş buradaydı. Onlara yaxınlaşarkən Soltan bir kağızla avtomat qələmi uzadıb:

– Səriyyə, – dedi, – al qol çək.

Mən kağızı alıb orada yazılmış bu sözləri oxudum: "Biz dörd yoldaş – Soltan, Kərəmxan, Qəribcan və bir də mən Səriyyə 1959-cu il mayın otuzunda həmin bu körpünün bünövrəsini qoyduq".

Mən onların imzasının yanından qol çəkib kağızı Soltana qaytardım. Sonra bünövrə yerini təkrar-təkrar nəzərdən keçirdim, hörüləcək divarların arasını təkrar ölçdüm. Hər şeyin layihədəki kimi olduğunu bir daha dürüst yoxlayandan sonra:

– İndi başlaya bilərik! – dedim. Mən fövqəladə bir iş görən adamlar kimi ciddi və həyəcanlı idim.

Soltan kağızı şüşəyə salıb, ağzını tıxacla möhkəm bağladı, sonra şüşəni bünövrəyə qoydu.

– Əmr olunsun, iyirmi bir topdan yeddi yaylım atəşi açılsın! – deyə Kərəmxan körpünün divarını hörməyə başladı.

Buldozerçi ilə Soltan bir-bir ona daş verirdilər. Bu bünövrəyə kağız yazıb qoymaq məsələsi heç mənim ağlıma gəlmədiyindən, özümü birtəhər hiss edirdim. Elə bil ki, mən, nə isə, tamam yeni bir aləmə daxil olmuşdum. Lakin bu "sirr" və bu "aləm" nə idi, nədən ibarət idi – mənə məlum deyildi. Qəribədir, mən Soltanla, Kərəmxanla danışıb güldüyüm halda, buldozerçiyə tərəf baxmırdım. Yalnız bir anlığa mənim başımdan son dərəcə xoşagəlməz bir fikir keçdi... Mənə elə gəldi ki, subay qızam və indicə həmin bu buldozerçiyə ərə getdim! Elə bil, o bünövrəyə qoyulan bizim nikah kağızımız idi. Mən əsəbi bir həyəcanla bu hissi özümdən qovaraq, başımı qaldırıb, cəsarətlə buldozerçiyə baxdım və ona müraciətlə:

– Heyf ki, – dedim, – Adil burada olmadı, yoxsa məktubda onun da adını yazardıq...

– Doğrudan da... – deyə buldozerçi ciddi ifadə ilə cavab verdi, – gərək naçalnik də olaydı.

Lakin onun sözləri məni təskin etmək əvəzinə daha da əsəbiləşdirirdi. Onun üzündə həddindən artıq ağıllı ifadə var idi. Cavabı da həddindən artıq ləyaqətli və ciddi idi. Mən boş vedrəni qapıb, bir kənarda düzəldilmiş palçığın yanına yüyürdüm və beli götürüb vedrəni doldurmağa başladım. Lakin buldozerçi yaxınlaşıb:

– Verin bura, – dedi, – sizin işiniz deyil.

– Yoxsa ki, siz göydən gəlmisiniz? – deyib, mən beli vermək istəmədim.

O, heç bir söz demədən zorla barmaqlarımı belin sapından qoparıb, onu məndən aldı...

Mən ona acıqlı bir nəzər salıb kənara çəkildim. Ona demək üçün, onu da özüm kimi hirsləndirmək üçün acı bir söz axtarırdım. Lakin o sözü tapmadım. O, vedrəni doldurub apardı. Mən də əlacsız halda onun ardınca getdim.

Kərəmxan daşları üst-üstə qoyaraq, mənə müraciətlə:

– Sən, – dedi, – naçalnikin burada olmadığına görə darıxma. Hələ o qədər körpülər salacağıq ki...

"Lakin mən bir də bünövrəyə qoyulan kağızda adımın yazılmasına icazə verməyəcəyəm... Belə romantika nə mənə lazımdır, nə də Adilə! Qoy bu buldozerçi ilə yoldaşları öz adlarını yazsınlar! Lakin mən... mən istəmirəm. Buldozerçi ilə birlikdə istəmirəm. Bu mənə pis gəlir. Nə üçün pis gəlir?" O zaman mən bu suala cavab verə bilməz-

dim. Mən bu cavab haqqında heç düşünmürdüm də. Mən yalnız ruhi bir gərginlik və iztirab hiss edirdim. Hətta, mən bu iki daşın arasında Adilin də qarasına deyinirdim.

“Mənim bu ərim nə qəribə adamdır! Çay içmədən, mənə heç bir söz demədən çıxıb gedir...”

Kərəmxan, Soltanın verdiyi guşə daşını alıb hörgüyə qoyaraq:

– Səriyyə xanım, – dedi, – gələcəkdə bu Zoğallı körpüdən (körpü salınan yerdə çoxlu meşə zoğalı olduğu üçün biz ona “Zoğallı körpü” adını qoymuşduq) gəlib keçəndə bizi yada salarsan.

Soltan da dərindən nəfəs alaraq:

– Kim bilir, – dedi, – biz onda harada olacağıq...

Buldozerçi isə mənə baxmadan:

– Səriyyə xanım elə o zaman da bizimlə olacaq, – dedi.

– Doğrudan? – deyə mən qəzəblə ona baxdım.

– Doğrudan, – deyə o məni yandırıb-tökən bir arxayınlıqla cavab verdi.

Sonra bünövrəyə işarə ilə əlavə etdi:

– Adımız bir kağızda yazılıb bünövrəyə qoyuldu. Tay bizi bir-birimizdən ayırmaq olmaz.

Birdən ürəyimə anlaşılmaz bir vahimə çökdü. Mənə elə gəldi ki, “biz” dedikdə, buldozerçi məhz ikimizi, yəni, özü ilə məni nəzərdə tutur və elə bil ki, onun bu sözlərində, nə isə, sehrli bir qüvvə, bir hökm vardı. Sonra belə bir mövhumata qapıldığıma bərkdən gülərək:

– Amma yaman da çoxbilmişsiniz, – deyə ona baxıb başımı buladım.

O isə, mənə ciddi və sürəkli bir nəzər salıb dinmədi. “Yoxsa, zarafat eləmir? Yoxsa, bu buldozerçi bizim heç zaman bir-birimizdən ayrılmayacağımıza, doğrudan da, əmindir? Yox, mənim özünü belə əsrarəngiz göstərən adamdan xoşum gəlmir (halbuki indiyə qədər mən belə bir adama rast gəlməmişdim). Bu Soltan, Kərəmxan necə açıqürəkli, necə sadə oğlanlardır! Amma bu buldozerçi! Özünü elə aparır ki, elə bil, cadugərdir. Tutaq ki, həyatda, doğrudan da, belə bir fövqəladəlik mümkündür. Lakin onun məni tilsimə salmağa nə haqqı var? Qəribədir... Bu boş şeylər haradan mənim ağlıma gəlir?”

Mən soruşdum:

– Usta Kərəmxan, səncə divarları ayın on ikisinə qədər qurtara biləcəyik?

– İnşallah qurtararıq, – deyə Kərəmxan keçmiş qocaların dili ilə cavab verdi.

Onun səsindəki inam və arxayınlıq sanki məni o üzüntülü xəyallardan ayırıb, təkrar öz adi vəziyyətimə qaytardı. Mən işgüzar bir ifadə ilə:

– Soltan, – dedim, – məncə, divarlar hörülüb qurtaran kimi boruları qoyub, bərkidə bilərik. Sonra da...

Bu vaxt dünənki üçtonluq maşın siqnal verə-verə düşərgəyə yanaşdı.

Soltangil maşında gəlmiş üç nəfər cavan fəhlə ilə birlikdə sement çəlləyini və başqa tikinti materiallarını yerə boşaltdılar. Sonra maşın həmin üç nəfər fəhlə ilə birlikdə qayıdıb getdi, mən də istirahət saatı olduğu üçün (biz hər gün saat on ikidən birə qədər tənəffüs edirdik) çadıra getdim. Naharın yaxşı olmasına hər zamankından daha artıq səy etdim. Adilin çaysız-çörəksiz çıxıb getməsi xoşuma gəlmirdi. Əlbəttə, əgər, mən səhər oğlanlarla qaçışmasaydım, çadıra tez qayıtsaydım, Adil belə etməzdi. Lakin, əgər, sabah onlar yenə ötüşmək fikrinə düşsələr, mən mütləq o yarışda iştirak edəcəyəm.

Mənim plovum Adilin çox xoşuna gələrdi. Ona görə də, düyü arıtlayıb, turşuqovurmalı plov bişirib dəmə qoydum. Stolun üstünə təzə ağ süfrə saldım. Badımcan şorabası çıxarıb doğradım (Adil bu məzəni çox sevdiyi üçün Bakıdan bir balon gətirmişdim), nazik, ağ yuxadan bir neçəsini sulayıb süfrəyə qoydum. Onu da deyim ki, bu yuxanı özüm bişirirdim. Kərəmxan mənə balaca bir sac gətirmişdi. Özüm xəmir yoğurub kündələyirdim. Sonra çadırın qapısında ocaq qalayıb sac asırdım. Bəzən Kərəmxan da yuxaları çevirməkdə mənə kömək edirdi, yəni, mən yuxanı oxlovla yayıb sacın üstünə qoyurdum, o da dəmir şişlə çevirirdi. Belə vaxtlarda buldozerçi də çadırlarının qabağındakı balaca dikdirdə oturub, dinməz-söyləməz, bizə tamaşa edirdi. Sağ olsun anam, mənə hər şeyi öyrətmişdi. Hər nə desəniz bişirə bilirdim. Stolun üstünü tamam düzəldəndən sonra təkrar işin üstünə qayıtdım. Qəsdən heç nə yemədim. Mən istəyirdim ki, Adillə birlikdə iştaha ilə nahar edim.

Hələlik başqa işimiz olmadığından, üçümüz də hörgü işində Kərəmxana kömək eləyirdik. Körpünün divarı yüksəldikcə bizim həvəsimiz də artırdı. Kərəmxan:

– Biri kitab yazır, biri maşın çıxarır, – deyə hey danışırdı, – biri, nə bilim, nə icad eləyir... Bu körpü də bizim əsərimizdir. Elədir, yox?

– Elədir, – deyə Soltan təsdiq etdi. – Zarafat deyil, biz təzə bir dünya qururuq!

“Biz təzə bir dünya qururuq!” deyə mən ürəyimdə təkrar etdim və mənə elə gəldi ki, biz və bütün insanlar, o “təzə dünya”ya məhz bizim saldığımız bu körpüdən keçib gedəcəyik. Dağların o tayındakı varlı fermalar yenə də parlaq ulduzlarla dolu əfsanəvi bir aləm kimi qarşımda canlandı. “Oraya gedən insanlar bu körpüdən keçəcəklər. Körpünün bünövrəsinə isə bizim adımız qoyulmuşdur. Bizim! Buldozerçinin və mənim! Nə üçün buldozerçi ilə mənim? Bəs Soltan?.. Bəs Kərəmxan? Biz iki yox, dörd yoldaşıq! Biz körpüsalanlarıq!..”

Bu sözlər qəlbimdə gərgin duyğular və məchul intizar ifadə edən bir mahnının nəqaratı kimi təkrar olunurdu.

– Uşaqlar, – Soltan ruh yüksəkliyi ilə sözünə davam edirdi, – biz bu Zoğallı körpünü qurtaranda yuxarı Qızılqaya meşələrinin qiyamət vaxtı olacaq.

– Nə cür? – deyə mən maraqla soruşdum.

Bu dəfə Kərəmxan cavab verdi:

– Moruq yetişəcək, qarağatlar qızarıb qaralacaq...

– Bundan başqa, – deyə Soltan əlavə etdi, – aşağılarda, aranda isti düşəndə, Qızılqaya meşələri cənnətə dönür. Deyirsən, bəs, havaya ətir səpmisən. Qızılqaya körpüsündən sonra Dəli Alı keçidində işə başlarıq. Ordakı körpünü də salıb qurtarandan sonra daha sovxoza çatırıq. Təzə naçalnik də ki, belə başlayıb (naçalnik dedikdə onlar Adili nəzərdə tuturdular), yol lap tez çəkilib qurtaracaq. Ondan sonra buyura bilərsiniz.

– Hə, – deyə Kərəmxan şirin bir nağıl başlayırmış kimi davam etdi. – Bir də görəcəksən böyründən qəşəng bir maşın keçdi. Səriyyə xanım oturub sükanın dalında, naçalnik də böyründə. Gedirlər fermalar olan yaylağa...

Bayaqdan bəri kimsənin üzünə baxmadan sükut içində Kərəmxana daş-palçıq verən buldozerçi gözünü hörgüdən çəkməyərək:

– Nə bilirsən, – dedi, – bəlkə rulun dalında naçalnikin özü oturacaq.

– Yox, – Kərəmxan etiraz etdi, – bilirəm ki, Səriyyə xanım rulu heç kimə verməz. Elə döyül, Səriyyə xanım?

– Elədir! – mən, buldozerçiyə meydan oxuyurmuş kimi bir nəzər salaraq, qətiyyətlə cavab verdim. – Mən oturduğum maşının rulunu başqasına verməyi xoşlamıram.

– Naçalnik ki, başqası deyil, – buldozerçi yenə də gözləri hörgüdə olduğu halda gülümsədi.

Mən tutularaq bir neçə saniyə susdum. Sonra özümü topladım:

– Əlbəttə, başqası deyil, – deyə qürurla cavab verdim.

Yalnız bu zaman o, gözlərini hörgüdən çəkib mənə ciddi bir nəzər saldı. Etiraf edim ki, onun belə gözlənilməyən ani baxışları çox təsirli olurdu. Sanki mən qəlbimdə gizlənən hansı bir sirri isə onun görüb-duyduğunu hiss edərək, dərhal mülayim və qorxaq bir vəziyyət alırdım. Bəlkə bu, mənə belə gəlirdi.

Soltan:

– Uşaqlar, – dedi, – işimiz bu cür getsə, körpünü vaxtından, azı, on beş-iyirmi gün qabaq qurtaracağıq. Siz nə fikirdəsiniz?

– Mən lap srağagündən o fikirdəyəm, – deyə Kərəmxan cavab verdi.

– Mən zarafat eləmirəm.

– Kim deyir ki, mən zarafat eləyirəm...

– Yaxşı, siz nə deyirsiniz? – deyə Soltan buldozerçi ilə məndən soruşdu.

"Bu oğlan nə üçün məhz ikimizə birlikdə müraciət edir?" deyə mən, sanki diksindim və özümü onda qoymayaraq, dərhal Kərəmxan kimi zarafatyana cavab verdim:

– Mən srağagündən o fikirdəyəm.

– Elə isə, yaşasın körpüsalanlar!

Saat dörddə az qalmış Adil işdən qayıtdı. "QAZ-69"u çadırın qapısında qoyaraq, düşüb bizim yanımıza gəldi. Onun kefi kök idi. Doğrusu, bu gün mən belə gözləmirdim...

– Hə, uşaqlar, işlər necə gedir?

– Pis deyil, yoldaş naçalnik, şikayətimiz yoxdur.

– Bu gün nazir özü mənə zəng eləmişdi... İşimizdən çox razı qaldığını bildirdi.

Mən buldozerçiyə baxdım. Birinci dəfə biz bura gələrkən gördüyüm və məni əsəbiləşdirən o məğrur təbəssümü yenə də üzündə idi. Elə bil ki, o, buldozeri yenə də lap uçurumun kənarına qədər sürür və mənim qorxmağımdan ləzzət alırdı...

– Yaxşı işləyənlərin haqqında danışdım. Sizin də adınızı dedim (o, Soltana müraciətlə "sizin də" sözünü xüsusi vurğu ilə dedi). Özüm də xahiş elədim ki, redaksiyalardan biri ilə danışsın, adam göndərsinlər, gəlsin baxsın, oçerkdən-zaddan yazsın...

Lakin Soltanın da, Kərəmxanın da üzü birdən-birə ciddi və soyuq ifadə aldı. Buldozerçi eyni təbəssümlə Adilə deyil, mənə baxırdı.

– Oçerk yazsalar da olar, yazmasalar da, – deyə Soltan cavab verdi.

– Nə üçün? – Adil təəccüblə soruşdu. – Qabaqdan respublikanın böyük bayramı gəlir. Orden-zad məsələsi olacaq.

Kimsə dinmədi. Araya dərin sükut çökmüşdü. Ayrı vaxt dil qəfəsə qoymayan Kərəmxan da bir söz deməyərək, pərgar götürüb, hörgünün düz qalxıb-qalxmadığını təkrar yoxladı.

– Nazir dedi bəlkə özüm də gəldim...

– Gedək, Adil, yəqin ki, sən bərk acsan, səhər də heç nə yeməyib getmisən.

O, heç bir şey başa düşməyən adamlar kimi, oğlanlara və mənə baxdı. Sonra bir söz demədən mənimlə birlikdə dönüb çadıra getdi. Geyimini dəyişdi. Yuyunub-qurulanaraq gəlib əyləşdi.

Körpüsalanlar nə isə danışıb bərkdən gülüşdülər. Mən bir boşqab plov çəkib Adilin qabağına qoydum.

– Özünə nə üçün çəkmirsən?..

– Özüm hələ acmamışam.

– Bəs, mən tək...

– Eybi yoxdur. Tək yeyəndə nə olar ki?

– Nazir bizdən çox razıdır...

Körpüsalanlar nə isə danışıb-gülüşürdülər...

– İşin başlanğıcı üçün bu yaxşı əlamətdir, elə deyilmi?

– Elədir, Adil.

– Bilirsənmi, bizim nazir çox avtoritetli adamdır, – deyə o, eyni ruh yüksəkliyi ilə davam edirdi. – Yuxarılarda bir sözü iki deyil...

Kərəmxan oxuyurdu:

Pəncərədən daş gəlir,
Ay bəri bax, bəri bax.
Xumar gözdən yaş gəlir,
Ay bəri bax, bəri bax...

Sonra üçü də birlikdə təkrar edirdi:

Ay bəri bax, bəri bax...

– Sən bunların üstündə möhkəm dur, – Adil körpüsalanlar tərəfə işarə elədi.

– Necə yəni "üstündə möhkəm dur"?

– Yəni, qoyma vaxtlarını laqqırtı ilə keçirsinlər.

– Onlar, onsuz da, vaxtlarını laqqırtı ilə keçirmirlər. Dünəndən soyuq dovğa var, gətirimmi?

– Sağ ol, hələlik bəsdir.

O, naharını bitirib stulunu geri çəkdi. Mən qalxıb süfrəni yığışdırdım. Onun üzünə baxmasam da, tutulduğunu, qayğılı görkəm aldığını hiss edirdim. Mən qabları ehtiyatla götürmürdüm, bir-birinə vurub səs salırdım. Bu dəqiqə bu qablardan mənim xoşuma ən çox gələni, məsələn, incə çinidən olan bu zərli salat qabı düşüb sınsaydı, çox yaxşı olardı.

Kərəmxan isə oxuyurdu:

Pəncərədən daş gəlir,
Ay bəri bax, bəri bax...

Adil nahardan sonra qəzet oxumaq istədi. Lakin tezliklə onu kənara ataraq, qalxıb çadıra girdi və arxası üstə çarpayıya uzanıb, sağ əlini gözünün üstünə qoydu.

Mən süfrəni yığışdırıb çaydanı pilitənin üstünə qoyandan sonra körpüsalanların yanına getmədim. Çadıra da girmədim. Qapıda oturub gözümü uçurumdan o tərəfdə görünən mənzərələrə dikdim. Dərə dəniz kimi dərin, geniş və mavi idi. Dərədən o yanda, uzaqlarda xəfif duman altındakı meşəli dağlar bir xəyala bənzəyirdi. Uçurumun üzərində hərlənən o cəsur qartal, yəqin ki, istədiyi vaxt bu ucsuz-bucaqsız dərənin üstündən süzüb keçər və uzaq dağların zirvəsinə qona bilərdi.

Mən ağlamaq istəyirdim. Mənim həyatım və bizim yerə mıxlanmış bu brezent çadırımız son dərəcə durğun və cılız idi. Mən təbiətin bu əzəməti içində ikən ondan uzaq və pərişan idim. Mən nə istəyirdim? Bilmirdim. Lakin mən bu dəniz kimi dərin və mavi dərədən axıb gələn səssiz simfoniyanı dinlədikcə, taleyimin həm də fərəhli olmadığını acı-acı hiss edirdim. Mənə elə gəlirdi ki, kim tərəfindənsə təhqir olunmuşam, alçalmışam. Halbuki dünyada uçurumun üzərində hərlənən, sərt qayaları hakim nəzərləri ilə süzən bu ağ qartal kimi yaşamaq mümkündür! Kim deyir ki, mən acizəm? Kim deyir ki, mən koramal kimi güneylərdə sürünmək üçün yaranmışam?! Təbiətin bu təntənəsinə qovuşmaqda kim mənə mane ola bilər? Nahaq yerə bu Qəribcan buldozeri lap uçurumun kənarına sürməklə məni qorxutmaq istəyirdi. Mən duyğuların əsarətinə, köləliyinə nifrət edirəm!..

Mən bu mavi dərənin oxuduğu mahnıda əsl insan ləyaqətinin nəhayətsiz və azad yüksəlişini hiss edirəm.

Yox, mən ağlamaq istəmirəm!

... Mən çayı dəmləyib, təkrar işin üstünə getdim və bu dəfə onların məni necə soyuq qarşıladıqlarına, özlərini necə məğrur tutduqlarına təəccüb etmədim!.. Mən belə də gözləyirdim. Onlar həmin bu dəniz kimi dərin dərənin üstündən süzüb keçərək, gümüşü duman altındakı o dağlara çata bilən cəsur qartallar idi! Mənim kimi onlar da duyğuların köləliyinə nifrət edirdilər. Lakin onlar mənim kim olduğumu bilmirdilər. Bu dəqiqələrdə onlar məni özlərinə yad hesab edirdilər. Onlarla mənim aramdakı sədd nədən ibarət idi və bu səddi necə vurub uçurtmaq olardı? Buldozerçi gör necə qaşqabaqlıdır! O bir dəfə də olsun mənə tərəf baxmır. O mənə nifrət edir.

– Bu gün tennis oynayırıqmı? – deyə nəvazişlə gülümsəyərək ondan soruşdum. Və birdən-birə özümün qırx səkkiz kilo gələn çəlimsiz, yazıq bir qız olduğumu hiss etdim (çox qəribədir, hələ də mənə elə gəlirdi ki, qadın deyiləm, bakirə bir qızam). Lakin bu duyğu yalnız bir an davam etdi.

– Bu gün mənim vaxtım yoxdur, – o mənə baxmadan təşəxxüslə cavab verdi:

– Doğrudan? – deyə başımı azca yana əyərək kinayə ilə sözü uzatdım.
– Yəni, sizin vaxtınız o qədər qiymətlidir?

O mənə nifrət və qəzəb dolu uzun bir nəzər salaraq:

– Yox, – dedi, – elə bircə sizin ərinizin vaxtı qiymətlidir.

“Afərin buldozerçi!”

– Qərib! – Soltan ona acıqlandı.

Lakin buldozerçi sanki onu eşitməyərək:

– Bilirsinizmi, – deyə mənə müraciətlə sözünə davam etdi, – yaxşısı budur, siz ona deyin ki, öz nazirinin mərhəmətindən az danışsın. Biz nə onun, nə də nazirin “sağ ol” deməsi üçün işləmirik.

Mən kirpiklərimi qırpmadan düz onun gözlərinə baxırdım.

– Yaxşı! – deyə Soltan təkrar məzəmmətlə səsləndi, – sən də qəribə adamsan. Səriyyə xanımın nə günahı var?

Mən gözlərimi buldozerçidən çəkməyərək, işgüzar bir məsələdən danışırammış kimi, sakit və arxayın ifadə ilə:

– Yaxşı, – dedim, – mən sizin sözlərinizi olduğu kimi Adilə çatdıraram.

– Çatdırın, yoxsa...

– Qərib, daş ver! – deyə Kərəmxan onun sözünü kəsdi.

Mən axşamçağı Adillə oturub çay içdiyimiz zaman buldozerçinin sözlərini olduğu kimi ona söylədim. Sonra onun boşalmış stəkanına yenidən çay tökərək:

– Hələlik, Adil, – deyib körpüsalanların yanına tennis oynamağa getdim.

Mən buldozerçinin sözlərinə qarşı Adilin nə deyəcəyini soruşmadım, çünki bunu soruşmaq mənim üçün çox çətin idi. Bir də ki, buna ehtiyac yox idi.

... Soltanla Kərəmxan oynayırdılar. Buldozerçi isə, əllərini başının altına qoyaraq, arxası üstə uzanıb göyə baxırdı. Mən gələn kimi qalxıb oturdu. Lakin mənə deyil, uçuruma tərəf baxdı.

Kərəmxanla Soltan qurtaran kimi mən raketkanı aldım və buldozerçiyə amiranə:

– Durun, görək, – dedim.

Sonra düz onun gözlərinə baxıb əlavə etdim:

– Mən sizin sözlərinizi olduğu kimi rəisə söylədim.

– Çox sağ olun!

Onun kefi birdən-birə kökəldi və o çevik hərəkətlə qalxıb oynamağa başladı. Hiss edirdim ki, o indi mənim qalib gəlməyimə çalışır, qəsdən səhv edir. Ona görə də, əl saxlayıb, eyniilə bayaq körpünün üstündə onun söylədiyi sərt ifadə ilə:

– Bilirsinizmi, – dedim, – mən kimsənin mərhəmətinə möhtac deyiləm. Xahiş edirəm, nə qədər bacarırsınız, ciddi oynayın.

O mənə baxaraq:

– Doğrudur, – dedi və yenə də məni apardı.

Sonra biz Soltanla Kərəmxanın yanında, göy otların üstündə əyləşib söhbət elədik. Soltan:

– Səriyyə xanım, – dedi, – siz Qəribcanın bayaqkı sözlərindən inciməyin.

– Mən inciməmişəm.

– İnciməyiniz də lazım deyil. Siz də bizim yoldaşımızsınız. Bu balaca körpü bizi bir ailə kimi etmişdir. Əgər, bizim işimizdən nazirin, ya da rəisin xoşu gəlirsə, lap yaxşı. Ancaq gərək onlar elə düşünməsinlər ki, biz özümüzü gözə dürtmək üçün, kiminsə "sağ ol!"unu qazanmaq üçün əlləşirik.

O, bir qədər susub yoldaşlarına baxdı. Kərəmxan da, buldozerçi də gözlərini yerə dikib onu dinləyirdilər.

Soltan qəddini düzəldib, tanışlığımızdan bəri birinci dəfə onda görüb-hiss etdiyim məğrur, ötkəm bir əda ilə:

– Biz, – dedi, – xalq üçün, ölkəmiz üçün işləyirik. Biz istəyirik ki, dağların o tərəfindəki fermalara gedən yol tez salınsın. Yəqin yoldaş rəis özü də bunu istəyir. İnsafən, işdən çox möhkəm yapışıb.

– Əlbəttə! – deyə mən buldozerçiyə baxdım. – Adilin işləməyinə nə söz ola bilər?

Soltan:

– Biz rəisi də, lap naziri də öz yoldaşımız hesab edirik, – dedi.

“Lakin biz istədiyimiz vaxt bu qorxulu uçurumun, dəniz kimi dərin və ucsuz-bucaqsız olan bu mavi dərənin üzərindən süzüb keçərək, zirvəsində ulduzlar yanan o qəlbi dağlara qona bilərik” deyə mən qəlbimdə, xəyalımda onun nitqini davam etdirirdim. “Biz xırda duyğuların cəbrinə nifrət edirik! Görəsən, Adil durub gedib? Adilə çay vermək lazımdır. Adil məni gözləyir.”

Birdən Kərəmxan başını qaldırıb:

– Yaşasın körpüsalanlar! – deyə nəşə ilə səsləndi.

– Sabah istirahət günüdür. Yəqin ki, evinizə gedəcəksiniz? – qüssə ilə soruşdum.

– Yox, – Soltan cavab verdi, – sabah ova gedəcəyik.

– Ova? – deyə sevinclə səsləndim. – Mən də gedəcəyəm...

– Sizin üçün çətin olar. Biz ayı ovuna gedəcəyik.

– Ayını neyləyirsiniz?

– Ətini satacağıq, dərisini də, püşk atacağıq, kimə düşsə, o götürəcək.

– Mən də gedəcəyəm.

– Qorxmursunuz?

– Yox, qorxmuram.

– Yaxşı, gedək.

– Ayının yerini bilirsiniz?

– Bilirik.

– Səhər nə vaxt çıxacaqsınız?

– Lap tezdən.

– Hələlik.

Mən qalxıb öz çadırımıza getdim.

... Adil yolun xəritəsini bayırdakı stolun üzərinə sərərək baxır və başqa bir kağızda, nə isə, haqq-hesab edirdi. Mən çadıra gedib fənəri yandırdım, çarpayıların üstünü açdım. Adilin gecə yeməsi üçün balaca

kasada çaldığım qatığın necə uyuşduğunu yoxladım və sərin olsun deyə qabı üstündən götürdüm. Paltarımı çıxarıb xalat geydim. Daha görüləcək bir işim olmadığından çıxıb Adilə mane olmamaq üçün, ondan bir az aralı, kətilin üstündə oturdum. Hava qaralmışdı. Çadırın ortasından asdığımız fənər Adilin üzünü və qabağındakı kağızları işıqlandırırı.

Qaranlıq meşədən ara-sıra yuvalarına gecikmiş quşların səsi eşidilirdi. Texnik olduğuma baxmayaraq, Adilin yazdığı, haqq-hesab elədiyi rəqəmlər mənə birdən-birə son dərəcə cansıxıcı göründü. Mənə elə gəldi ki, bizi əhatə eləyən qaranlığın sonu yoxdur. Elə bil ki, min ildir biz bütün işıqlı və canlı aləmdən ayrı düşərək bu cür sükut edirik. Min ildir Adil bu quru rəqəmləri yazıb-pozur. Mən əllərimi qoynumda "çarpazlayıb" dərindən "ah" çəkdim (bu necə oldu bilmədim, çünki mənim "ah" çəkməkdən zəhləm gedərdi). Adil başını kağızların üzərindən qaldırıb, işıqdan qaranlığa – mənə baxdı və çox qəribə bir təbəssümlə:

– Nə olub, Səriyyə? – dedi.

Sonra mənim cavabımı gözləmədən yenə də haqq-hesabını davam etdirdi.

"Nə olacaq? Heç bir şey!" deyə mən ürəyimdə cavab verdim.

Doğrudan da, nə olmuşdu ki? Mən heç nə bilmirdim. Mənim nəzərlərim və xəyalım bizi əhatə eləyən bu qatı qaranlıq içində itib-gedirdi. Uzaqlarda, dərədən o yandakı dağların döşündə hava gəmisinin çıraqları kimi görünən işıqlar isə mənim əsəblərimə toxunurdu. Qaranlıqda gizlənmiş çiçəklərin ətri mənə soyuq, dözülməz kədər təlqin edirdi. Birdən hardansa bir daş qoparaq, qaranlıqda gurultu ilə qayalara dəyib uçurum aşağı yuvarlandı. Gurultu getdikcə uzaqlaşaraq, dərənin dibində boğuq bir uğultuya çevrildi.

Adil başını kağızın üstündən qaldırmayaraq:

– Yəqin, – dedi, – yuxarıda, haradansa əlikdən-zaddan keçdi.

Mən birdən-birə sanki canlanaraq fövqəladə ruh yüksəkliyi ilə:

– Adil, – dedim, – sabah biz ayı ovuna gedəcəyik.

O işıqdan qaranlığa – mənə baxaraq bir neçə saniyə dinmədi və sonra olduqca arxayın cavab verdi:

– Nə olar, gedin. Deyirlər, ayı ovu çox maraqlı olur.

Adil başını aşağı salıb yenə də işləri ilə məşğul oldu. Lakin biz insanlar anadan qəribə doğulmuşuq. Bizim kim olduğumuzu duyub-dərk edə bilmək üçün dünyaya bir yox, yüz minlərlə loğman gəlib-getməlidir.

Ərimin mənim körpüsalanlarla ayı ovuna getməyimə bu qədər asanlıqla, bu qədər arxayınlıqla razı olması məndə ona qarşı amansız bir acıq, bir qəzəb oyadırdı.

Mən durub çadıra girərək soyundum. Əynimdə yalnız qolsuz ipək köynək qalanda, balaca güzgüdə öz əksimə baxdım. Üzümün, boy-buxunumun, bədənimin yaraşığından bu vaxta qədər hiss eləmədiyim bir məmnuniyyət duydum. Özümə məftun nəzərlərlə baxdım. Sonra şıltaq, xudpəsənd bir ləzzətlə çarpayıma uzandım. Qapıdan dolan sərin meh üzümə toxunub saçlarımı tərpətdikcə, mən öz gözəlliyimi daha dərindən hiss edirdim. Hiss edirdim ki, mən özüm bu sükut edən kainatın, bu qaranlıq gecənin sevinci, səadətiyəm. Mən əsl və qüdrətli həyatın özüyəm! Mənsiz bu dünyada yaşamaq heç nəyə dəyməz. Körpüsalanların qüruru, çadırımızın böyründən axıb uçuruma tökülən suyun şırıltısı mənimlə tamamlanır, mənimlə həmahəng olur. Dünyanın bütün dahi şairləri məni tərənnüm etmişlər.

Mən acıqlı halda belə düşünür, belə hiss edirdim. Lakin mənim bu xudpəsənd bəxtiyarlığımda nə isə çatmırdı. Sanki yatağıma saysız-hesabsız balaca tikanlar dolmuşdu və hər dəfə o tərəf-bu tərəfə çevriləndə bu tikanlar bədənimə batır, məni zəhlətökən bir ağrı ilə incidirdi.

Nəhayət, Adil durub işığı söndürdü, soyunub yerinə girdi və elə bil ki, çadırda qaranlığın hakim olması ilə, Adilin çarpayısının xəfifcə səslənməsi ilə bayaqdan bəri məni göyün yeddinci qatına çıxaran səadətim də uçub getdi. Mən yenə də bu ucsuz-bucaqsız qaranlığın içində yalqız qaldım. Mən sabahkı ov barəsində düşünərək yuxuya getdim.

Səhər hava işıqlanar-işıqlanmaz qalxıb ayağı büzməli şalvar və qısa corabla yüngül məs geydim, çayda əl-üzümü yuyub qayıtdığım zaman Adil də oyanmışdı. O, əllərini başının altında çarpazlayıb, çadırın qapısından görünən və hələ qaranlıq olan meşəyə baxırdı. Mən jaketimi geydim və balaca çamadanıma dörd adamlıq çörək, kotlet qoyaraq:

– Hələlik, Adil, – dedim, – termosda kakao var, kotlet də bişirmişəm.

– Termosu sən götürsən yaxşıdır, mən bu gün kakaosuz da ötüşərəm.

– Yox, hələlik, Adil!

– Hələlik, Səriyyə!

Onun, termosu mənim götürməyimi təklif etməsi ürəyimi kövrəltdi və mən ağlayacağımdan qorxaraq, tələsik çadırdan çıxdım.

Körpüsalanlar geyinib məni gözləyirdilər.

– Üçünüzün də tüfəngi var. Bəs mən?

Kərəmxan:

– Eybi yoxdur, – dedi, – mən öz tüfəngimi sənə verərəm... Əgər, ayıdan qorxmasan, gələn dəfə sənə də bir qoşalülə alarıq.

Soltan qabağa düşdü:

– Getdik!

Biz, fermalara gedən qədim köç yolundan ayrıldıq, qərbə burulan cığırla meşəli dağa çıxıb o biri üzə aşdıq. Bura göz işlədikcə uzanan qalın meşə, sərt qayalı sıldırım dağ idi. Adama elə gəlirdi ki, bu yerlər ömründə insan üzü görməmişdir. Elə bil ki, bura heç kəsə məlum olmayan yeni bir aləm idi. Hava işıqlandıqca quşların səs-küyü də artırdı. Biz dar cığırla irəliləyirdik. Soltan ilə Kərəmxan qabaqda, mən ortada, buldozerçi isə arxadan gəlirdi. Hava sərin və ətirli idi. Yolun o tərəf-bu tərəfində şehli otlar arasında tez-tez sarı-qırmızı çiçəklər nəzərə çarpırdı və onlar yarıqaranlıq içində yuxulu kimi görünürdü.

Biz sarıçiçəklə örtülü yamaca çatanda günəş çıxdı. Meşə birdənbirə min rəngə boyandı. Yamacdakı çiçəklər isə eynilə limon ətri verirdi. Dar cığır bu yamacı qalxıb o biri tərəfə aşırdı. Lakin biz köndələninə irəliləyib, yenə də qalın ağaclığa girdik. Burada heç bir cığır, heç bir iz yox idi.

– Azmırıq ki? – deyə qabaqda gedənlərdən soruşdum.

– Azmarıq. Ancaq sən yorulmamısan ki? – deyə Soltan dilləndi.

– Nə vaxt siz yorulsanız, bilin ki, mən də yorulmuşam. Yorulmasanız, demək, mən də yorulmamışam.

– Səriyyə bacı qız deyil, oğul qırığıdır! – Kərəmxan zarafat elədi.

– Yaxşı! Mənim tərifdən xoşum gəlmir. Yaxşısı budur sən vədinə əməl elə. Tüfəngi ver bəri!

– Hələ ayı olan yerə çox qalıb, səni yorar.

– Yormaz.

– İndi ki, yormaz, onda al. Nə cür atıldığını bilirsənmi?

– Doludur?

– Əlbəttə. Ancaq nə zaman atmaq lazım olduğunu bizə Soltan işarə eləyəcək.

– Bildim.

Soltan geriyə dönərək:

– Buradan o yana, səssiz! – deyə əmr verdi. Soltanın xəbərdarlığı məni qorxutmadı. Əksinə, özümdə heç bir zaman duymadığım bir cəsa-

rət hiss elədim. Mən ayını tez görmək, mənə aydın olmayan təhlükə ilə tez qarşılaşmaq istəyirdim.

Mən buldozerçinin heç dinib-danışmaması haqqında düşünürdüm. Elə bil, ağzına su almışdı. Adamı lap darıxdırırdı. Başını geri döndərərək, mülayim bir ifadə ilə:

– Sizin tüfənginiz də doludur? – deyə ondan soruşdum.

Sualımın mənasız olduğunu bilirdim. Ayı ovuna boş tüfənglə getməzlər ki... O, başı ilə təsdiq etdi və elə bil ki, bu hərəkəti ilə mənə karlı bir sillə tutuzdurdu. Mən hirsləndim:

– Bir batman başınızdansa, iki misqal dilinizi tərpətsəniz olmaz? – deyə Kərəmxan da çiyinlərini qısıb xısın-xısın güldü.

– Sss... – Soltan geri dönüb bizə gözlərini ağartdı.

Bu zaman şıqqıltı eşidildi. Elə bil, kimsə budağı əyib sındırdı. Buldozerçi sürətlə qabağa keçib Soltana yanaşdı. Sonra ayaq saxlayıb diqqətlə qulaq asdılar. Daha heç bir səs-səmir yox idi. Üçümüz də tüfəngimizi hazır tutaraq, ehtiyatla irəlilədik. Kərəmxan kəmərindən asdığı iri ov bıçağını qınından çıxartdı. Birdən Soltan əyilib yerə diqqətlə baxaraq:

– Görürsünüz? – deyə pıçıldadı.

– Düzdür, – deyə buldozerçi təsdiq etdi.

– Nə olub? – mən Kərəmxandan soruşdum.

– Ot ayaqlanıb... Deməli, buradan nə isə keçib...

Mən çox diqqət elədikdən sonra yumşaq meşə otlarının, doğrudan da, bəzi yerlərdə ayaqlandığını seçə bildim. Soltanla buldozerçi qabaqda, mənimlə Kərəmxan isə, arxada, izi tuş tutub dağ yuxarı diklənməyə başladıq. Oğlanlar çox sərvaxt yeriyirdilər. Ən kiçik bir şıqqıltı belə eşitdikdə, dayanıb diqqətlə qulaq asır, aşağı əyilib ətrafı nəzərdən keçirirdilər. Yoxuşun yarısında təkrar qərbə tərəf yol aldıq. Bu cür dik və qayalıq yoxuşu düzünə çıxmaq dolayı getməkdən asan olur. Biz yıxılmamaq üçün tez-tez budaqlardan, qayalardan yapışaraq səssizcə irəliləyirdik. Nəhayət, qabağımıza qalın qarağat kolluğu çıxdı. Mən, ayıların armudu, qarağatı çox sevdiyini uşaq vaxtı qoca nənəmin nağıllarından eşitmişdim. Qarağat kolluğunu keçib bir az da getdik və arxa tərəfi hündür və sıldırım qaya olan balaca meşə açıqlığına çatanda, çox qəribə bir mənzərə ilə üz-üzə gəldik; iri, boz bir ayı adam kimi dal ayağı üstündə dik qalxaraq bizə baxırdı. Mənə ən çox təəccüblü görünən onun üzündəki ifadə idi. Ayı elə baxırdı ki, elə bil, bizi gör-

düyündən məmnun olmuşdu. Onun balaca, bulanıq gözlərində mülayim bir ifadə var idi. Elə bil pişvazımıza çıxmışdı. Soltan ilə buldozerçinin tüfəngləri açıldı. Əvvəlcə mən heç nə seçmədim. Barıtın tüstüsü çəkiləndə ayının yerə yıxıldığını gördüm. Yalnız bu zaman hazır tutduğum tüfəng yadıma düşdü və elə bu vaxt başqa bir dəhşətli hadisə oldu. Buldozerçi dörd-beş addım irəlilədi.

– Dayan! – deyə Soltanın səslənməsi ilə yerə yıxılmış ayının qəzəblə qalxıb buldozerçini qucaqlaması bir oldu. Mən hələ indi də yadıma düşəndə utandığım, əcaib bir səslə qışqıraraq, tüfəngi atıb, onların yanına yüyürdüm. Buldozerçi ayının çənəsindən tutub var gücü ilə altdan yuxarı qaldırır, onun ağız atmasına imkan vermirdi. Ayının və oğlanın hərəkətləri ildırım sürətilə gözümün qabağından sanki zahir olub keçir və mən ayıdan başqa heç bir şey seçmirdim. Birdən heyvanın oğlanı buraxıb, nərilti ilə yerə yıxıldığını, Kərəmxanın isə, tələsmədən iri ov bıçağını onun böyründən dartıb çıxardığını gördüm. Sonra bir güllə daha açıldı. Tüstü çəkiləndə buldozerçi əl yaylığı ilə üzündən axan qanı silirdi. Soltan və Kərəmxan onun üzünü, boyun-boğazını diqqətlə nəzərdən keçirirdilər.

Nəhayət, Soltan:

– Bir şey yoxdur, – dedi, – azca cırmaqlayıb.

Kərəmxan mənə baxıb qəhqəhə ilə güldü.

Mən də əvvəlcə gülümsədim. Sonra birdən əllərimlə üzümü tutub ağladım. Soltan:

– Bay, Səriyyə xanım, – deyə zarafatla səsləndi, – yoxsa qorxdun?

Mən heç bir söz demədən əllərimi üzümdən götürüb, gözümün yaşını sildim və buldozerçiyə baxmamağa çalışdım. Kərəmxan dəsmalından bir az cırıb yandıraraq, külünü onun qan axan yerlərinə basdı. Yod və spirt olmayanda, təzə külün yaralanmış yer üçün ən yaxşı dezinfeksiya vasitəsi olduğunu bilirdim. “Lakin, görəsən, ayının dırnaqlarında infeksiya yox idi ki...” Mən heyvana baxaraq, bir az qabaq bizi qarşılarkən, onun üzündəki xoşhallığı xatırlayırdım. Bəlkə də, o bizi dost hesab edirdi. Lakin biz onu öldürdük.

Oğlanlar ayının ətini necə aparmaq barədə məsləhətləşirdilər. Nəhayət, bu qərara gəldilər ki, buldozerçi gedib yeddi-səkkiz kilometr buradan aralıda, meşədə olan arıçılıq fermasındakı tanışlarından bir at alıb gətirsin. Buldozerçi tüfəngini doldurub gedəndə:

– Orada yaralarınıza da yod vurun, – deyə sərt ifadə ilə arxadan səsləndim.

O, geri qanrılaraq, mənə ani bir nəzər salıb yoluna davam etdi.

Soltan ilə Kərəmxan isə, biləklərini çirməyib ayını soyurdular. Mən onların necə cəld və həvəslə işlədiklərinə tamaşa edirdim. Kərəmxan:

– Qışdan çıxmağına baxma, kökdür, – dedi.

– Yaxşıdır, – deyə Soltan sakit halda təsdiq etdi.

Onlar həm işləyir, həm də zarafat edərək, mənim kefimi açmağa çalışırdılar. Buldozerçinin ayaq səsləri eşidilməz olduqda, mən gəlib onların yanında yerə çökdüm, gülümsəyərək zarafatyana soruşdum:

– Birdən yolda buldozerçinin qabağına belə yekə bir ayı çıxsa neyləyər?

– Atasını yandırar, – deyə Kərəmxan cavab verdi, – qoşalüləsi doludur.

Soltan isə:

– Ayı adamın qabağına asanlıqla çıxmır, – dedi, – bu da bir təsadüfdür. Bəzən on-on beş dəfə ova gedirsən, amma bir dəfə də rast gəlmirsən.

– Amma nəhəng şeydir, – deyə mən sözümü dəyişdim.

Heç yarım saat çəkmədi ki, onlar heyvanın dərisini, başını, hətta, pəncələri də üstündə, soyub bütöv çıxardılar. Sonra Soltan xəncərini siyirib ayını şaqqaladı. Ətinin yaxşı yerlərini daşıyıb vələs ağacının kölgəsindəki balaca qayanın üstünə yığdılar və milçək qonmasın deyə yarpaqlı budaqlardan kəsib üzərinə döşədilər. Sonra dərəyə enib çayda əllərini yuyub qayıtdılar. Kərəmxan:

– Hə, indi toqqanın altını bir az bərkitmək olar, – deyib ov heybəsini açdı. – Səriyyə xanım, gəlin əyləşin.

Biz sərin kölgədə yumşaq otların üstündə oturduq. Mən öz qadınlıq vəzifəmi unutmayaraq, çörək bükdüyüm balaca, təmiz süfrəni əl çamadanından çıxarıb kotletləri, çörəyi ortalığa qoydum. Onlar da balıq konservi və bu yerlərdə məşhur olan axtarma motal pendiri gətirmişdilər. Soltan yeməklərin hərəsindən bir az götürərək, eynilə mənim tələffüz elədiyim kimi:

– Bu da buldozerçinin payı, – dedi.

– Siz məndən çox yaşayacaqsınız, – dedim, – elə mən də bu saat o barədə düşünürdüm.

Üçümüz də iştaha ilə yeyib qurtarandan sonra oradan-buradan söhbət elədik.

– Ora qoyduğunuz nə qədər olar? – mən vələs ağacının altına işarə ilə soruşdum.

Soltan cavab verdi:

– Altmış-yetmiş kilo, bəlkə də çox...
– Harada satacaqsınız?
– Yuxarı dağ kəndlərində...
– Bizlərdə ayının əti yeyilmir...
– Amma bu tərəflərdə ayı əti dərman hesab olunur.
Soltan:
– Dərisini sənin üçün qurudacağıq, – dedi.
– Sağ olun, istəməz.
– Götürəcəksən. Qışda çarpayının qabağına salarsan. Zoğallı körpüdən yadigar qalar.
– Mən yadigar xoşlamıram.
– Onda elə-belə... Götürərsən, axı, bu ovda sənin də zəhmətin var?!
– Yaxşı, elə-belə götürərəm.
Sonra, bir qədər aralıda qayanın altında, qarağat kolları arasında qaranlıq ağzı görünən mağaranı göstərib:
– Bəlkə, – dedim, – ora ayının yuvasıdır?
– Ola bilər, – deyə Soltan diqqətlə baxıb cavab verdi.
– Durun gedək baxaq.
– Nə olar, gedək.
Soltan tüfəngini doldurdu.
Kərəmxan da açılmamış dolu tüfəngini götürdü.
– Belə hazırlaşmaqda, deyirsiniz, bəs, orda yenə ayı ola bilər?
– Ağlım kəsmir, – deyə Soltan cavab verdi, – ancaq yenə də ehtiyat yaxşıdır.
Biz mağaraya yaxınlaşanda mən birdən-birə qorxmağa başladım. Mənə elə gəldi ki, bu saat qaranlıq mağaradan dəhşətli bir heyvan çıxıb üçümüzü də parçalayacaq və buldozerçi gəlib bizi də vələsin kölgəsindəki ayının vəziyyətində görəcək.
Soltan:
– Səriyyə xanım, sən hələ gəlmə, burada dayan.
– Nə üçün? Gələcəyəm.
– Yox, belə lazımdır.
O, əl fənərini çıxarıb yandırdı. İkisi də çox ehtiyatla mağaranın ağzına yaxınlaşdı. Kərəmxan qoşalüləni qaldırıb hazır saxladı. Soltan fənəri qabağa tutaraq, mağaranı işıqlandırıb, diqqətlə baxdı. Kərəmxan tüfəngi çiyninə salaraq, geri qanrılıb:
– Bir şey yoxdur, – dedi. – İstəyirsən, gəl bax.

Mən cəld irəliləyib içəri girdim. Dib tərəfə quru ot və balaca ağac budaqları tökülmüşdü. Deməк, ayı bütün qışı bunların üstündə yatırmış və günlərin birində körpüsalanların gülləsinə rast gələcəyi barədə heç düşünmürmüş. İçərinin havası pis və rütubətli olduğundan, mən qayıdıb bayıra çıxdım. Meşə gur günəş işığında min rəngə çalırdı. Hava sarı çiçəklərdən qalxan limon ətri ilə dolu idi.

– Görəsən, buldozerçi niyə gecikdi? Mən bunu ürəyimdə düşündüyüm halda, tamam qeyri-şüuru olaraq, ucadan dedim və öz səsim mənə tanınmayacaq dərəcədə qəribə gəldi.

Soltan:

– Gələr, – dedi.

Sonra Kərəmxana baxıb gülümsəyərək əlavə etdi:

– Yəqin başı söhbətə qarışıb...

– Oradakı tanışı kimdir?

– Bir qəşəng qız, – deyə Kərəmxan cavab verdi, – özü də bal aqronomudur...

– Bal aqronomu?

– Hə, bal aqronomu...

– Yamanca özündən quraşdıransan. Bal aqronomu...

Mən bərkdən qəhqəhə ilə güldüm.

– Doğrudan qəşəng qızdır?

– Doğrudan!

Mən qolumdakı balaca saata baxıb, fikirli halda:

– Gecikəcəyik,– dedim, – yəqin ki, indi Adil də bərk darıxır.

– Gecikmərik, – deyə Soltan cavab verdi, – odur, bax, buldozerçi gəlir.

Mən diksinərək geri döndüm. (Adilin bəzən məni tənqid eləməyə haqqı var. Çox zaman mən öz hərəkətlərimi ölçüb-biçmirəm. Məsələn, burada nə üçün diksinirdim ki?)

Buldozerçi qıvraq bir atın üstündə, tərkində də bir oğlan uşağı gəlirdi. Biz onların qabağına yeridik.

Buldozerçi atdan düşəndə:

– Bal aqronomunun kefi necədir? – deyə birdən soruşdum.

O, təəccüblə üzümə baxaraq:

– Yaxşıdır, – dedi. – Siz onu tanıyırsınız?

– Bəli, tanıyıram.

Soltanla Kərəmxan bərkdən güldülər. Buldozerçi məsələnin nə yerdə olduğunu anlayaraq, onlara məzəmmətlə baxıb başını buladı.

– Eybi yoxdur, – dedim, – pərt olmayın, biz bir briqadayıq. Briqada üzvlərinin bir-birindən ayrı sirri olmamalıdır.

– Sirri ha! – deyə o, xəfifcə gülümsədi.

– Bəli, sirri.

Mən elə danışırdım ki, elə bil, xalqın oğluna meydan oxuyurdum. "Bütün bunların sizə nə dəxli var?" deyə o, məndən soruşa bilərdi. Lakin o soruşmadı. Mən bunu hiss edirdim, soruşmazdı. Çünki biz bir briqadanın üzvləri idik...

Soltan yoldaşlarına:

– Səriyyə xanım tələsir, – dedi, – tez olun.

Onlar ayının ətini buldozerçinin gətirdiyi xaşalara doldurub ata yüklədilər. Sonra şeylərimizi götürüb yola düzəldik.

Biz Zoğallı körpüyə çatanda günəş qüruba enirdi. Körpüsalanlar yükü götürüb, atı uşaqla geri göndərdilər.

– Yolda qorxmazsan ki? – deyə balaca oğlandan soruşdum.

O, gülümsəyərək heç bir söz demədən ata mindi və tezliklə ağaclar arasında görünməz oldu.

– Qorxmaz! – Soltan oğlanın ardınca baxmadan cavab verdi.

Sonra ayının dərisini duzlayıb günə sərdik. Mən onlarla xudahafizləşib çadıra qaçdım. Adil çarpayısına uzanıb kitaba baxırdı. Məni görərkən kitabı kənara qoyub çarpayıdan qalxdı:

– Hə, ovunuz nə cür keçdi?

Mən onun səsinin ahəngindən pərt olmayaraq:

– Çox gözəl, – dedim, – heç belə uğurlu ov olmazdı. Yekə bir ayı vurduq.

O daha heç nə soruşmadı.

– Yəqin ki, acmısan, Adil, naharının vaxtından keçib.

– Mən nahar eləmişəm.

– Afərin. Mən bir az uzanmaq istəyirəm, yorulmuşam...

Lakin mən xalatımı yenicə geyinmişdim ki:

– Yoldaş naçalnik, olarmı? – deyə bayırdan Soltanın səsi eşidildi.

Adil qapıya yeriyərək sakit halda soruşdu:

– Nə olub?

– Dedik, əgər, mümkünsə, maşını bir-iki saatlığa verəsiniz, ayının ətini qonşu kəndə aparaq, tez satıb qayıdarıq.

– Maşını yolun işi üçün veriblər, kəndlərdə ayı əti satmaq üçün yox.

– Elədir. Bir də ayı vursaq, nəzərə alarıq... Ancaq bu dəfə.

Mən içəridən səsləndim:

– Adil zarafat eləyir...

– Yox, zarafat eləmirəm.

– İki saatlığa heç nə olmaz, Adil, onsuz da evdəsən. İstirahət günüdür.

– İcazə ver bunu mən bilim, – o, hövsələdən çıxmış halda dönüb mənə cavab verdi.

– Eybi yoxdur, Səriyyə xanım, özümüz birtəhər eləyərik, – Soltan bərk incimiş halda qayıdıb getdi.

– Nə üçün vermədin, Adil? Maşını yeməyəcəkdilər ki...

– Mən ilk dəfədir səndən belə kobud söz eşidirəm. Səriyyə, eyib deyilmi?

Mən düz onun gözlərinin içinə baxaraq dinmədim.

O birdən-birə yumşaldı:

– Səriyyə, axı, sən işin birini bilirsən, birini yox. Tutaq ki, mən maşını verdim. Yolda və ya kənddə onlara bir avtomobil müfəttişi rast gəldi. Onda necə olar? Mən kimə sübut eləyə biləcəyəm ki, bu işdə mənim heç bir şəxsi marağım yoxdur? Səni inandırıram ki, götürüb birbaş nazirə yazarlar ki, filan yolun rəisi işləmək əvəzinə, ov eləyib dövlətin maşınında ət satdırmaqla məşğuldur. Sən adamları tanımırsan...

– Qoy yazsınlar. Biz ki, həqiqəti bilirik...

– Biz bilirik. Amma nazir bilmir. Kimlərinsə beş şahı qazanması üçün mən özümü şübhə altında qoya bilmərəm. Aydındırmı?

– Aydındır.

– Birinci dəfədir ki, mənə bu cür müstəqil, məsul iş tapşırıblar. Bilirsənmi, Səriyyə, bu yol, bu körpü, eyni zamanda, bizim, yəni, sənin və mənim gələcəyimiz üçün salınır. Biz indidən özümüz öz gələcəyimizi korlaya bilmərik... Gərək sən özün də razı olmayasan ki...

– Yaxşı, Adil. Mən sənin karyeranın yüksəlməsinə mane olmayacağam.

– Nəinki mane olmayacaqsan, sən gərək buna kömək edəsən!

– Əlbəttə.

– Onda gəl barışaq... Sən bu gün elə qəşəng yanmısan ki, – o əlimdən tutaraq məni özünə sarı çəkdi. Lakin mən onun əlini ehmallıca kənar edərək çadırdan çıxdım. Mən artıq dincəlmək meylində deyildim. Mən palıd ağacının kölgəsində oturub, uçuruma baxırdım və ilk dəfə biz bura gələrkən buldozerçinin yolun ortasına tökülmüş qayaları maşının döşünə verib, bu uçurumdan üzüaşağı necə yuvarlatdığını

xatırlayırdım. Mənə elə gəlirdi ki, o vaxtdan düz bir əsr keçmişdir və bu müddət ərzində, nə isə, çox qüssəli hadisələr baş vermişdir. Mən xeyli qocalmışam, xeyli incimişəm. Bakıdakı günlərimiz yadıma düşdü. Orada yaxşı idik. "Qu" desən qulaq tutulan bu meşələrdə isə mən çox yalqız və mükəddərəm.

Tennis oynamaq, ov... Bunlar hamısı mənasız, boş işlərdir. Bizim xoşbəxtlik üçün doğulmağımız haqqındakı aforizm adi şair xəyalının ani uydurmasıdır.

Pəncərədən daş gəlir,
Ay bəri bax, bəri bax.
Xumar gözdən yaş gəlir,
Ay bəri bax, bəri bax...

Körpüsalanların birdən ağız-ağıza verib oxuduqları bu mahnı məni diksindirdi. "Bunlar nə qəribə adamlardır?!"

Səni mənə versələr,
Hər görənə xoş gələr...

– deyə onlar təkrar edirdilər. Birdən mən qəribə bir arsızlıqla gülümsədim və bu saat subay bir qız olmadığıma təəssüf elədim. Yox, mən subay deyiləm. Mən ərimin gələcəyi üçün məsuliyyət daşıyan bir qadınam. Ərimin gələcəyi, gələcək böyük vəzifələri üçün! Əlvida, subaylıq, əlvida, azadlıq... Mən daha azad deyiləm! Onlar, körpüsalanlarsa azad və xoşbəxtdirlər. Onlar kimsənin gələcək vəzifələri üçün narahat olmurlar. Onlar körpünü, dağların o biri tayındakı fermalara tez getmək üçün salırlar və bundan zövq alırlar. Lakin onlar nə üçün mənim adımı da öz adlarının yanına qoşub bu körpünün bünövrəsinə qoydular? Mən ki, onlardan deyiləm. Mən ki, Adilin həyat yoldaşıyam. Həyat yoldaşı, həyat yoldaşı!.. Biz, yəni, mən və mənim həyat yoldaşım bu körpünü başqa məqsəd üçün salırıq. Biz, yəni, mən və mənim hörmətli, istedadlı həyat yoldaşım bu körpüdən keçib daha yüksək vəzifələrə, daha ali mövqelərə çatmaq istəyirik. Bu körpüsalanlarsa gələcəkləri barədə düşünmək əvəzinə hey oxuyurlar:

Səni mənə versələr,
Ay bəri bax, bəri bax...

Onlar susdular. Sonra dünyada zərrəcə dərdi-qəmi olmayan Kərəmxan, çiynində ov tüfəngi, çadırlarından aralanıb üzüyuxarı, meşəli dağa dikləndi. Yəqin arxadan onu səsləyib nə isə dedilər və o, geri qanrılıb yoldaşlarına cavab verərkən məni görüb gülümsədi, sonra əlini havada yelləyərək dönüb yoluna davam etdi. Ona cavab olaraq necə kədərlə gülümsədiyimi hiss elədi. Mənə elə gəldi ki, şən, dərdsiz-qəmsiz Kərəmxan həmişəlik çıxıb getdi. Elə bil ki, köç gedib məni burada yalqız qoymuşdu. Mən o ki var, ağladım və bunu Adilin bilməməsi üçün qalxıb üzümü yudum. Mərcantək xırda daşların üzəri ilə axan dağ suyu günəşin şüalarını güzgü kimi əks etdirirdi. Təzə ağ çiçək açmış böyürtkən kollarının sərin kölgəsində zərqanadlı böcəklər uçuşurdu.

Təbiətin gözəlliklərində heç bir təbəddülat yox idi.

Axşamçağı Adillə çadırın qapısında oturub çay içdiyimiz zaman yük maşını yanımızdan sürətlə körpüsalanların çadırına tərəf getdi. Kərəmxan da kabinədə oturmuşdu. Heç on dəqiqə çəkmədi ki, maşın təzədən geri qayıtdı. Bu dəfə körpüsalanların üçü də maşında idi. Adil onların ardınca baxaraq, mürəbbəli çayından bir qurtum alıb, tamam sakit:

– Əgər, – dedi, – sabah onlar geciksələr, üçünü də işdən qovacam. Biz hər bir intizamsızlığın qarşısını dərhal almalıyıq.

“Biz!” Məni maraq götürdü. Mən Adilin bu üç oğlanı işdən necə çıxaracağını və bu zaman buldozerçinin nə deyəcəyini və üzündə necə ifadə olacağını eşidib görmək istərdim. Bu mənim üçün təzə bir aləm olardı. Lakin ertəsi gün düz saat səkkizdə onlar işin üstündə deyib-gülür və ikinci hörgünü başa çatdırırdılar.

Adil çay-çörəyini yeyib-içdikdən sonra “QAZ-69”a əyləşib işinə getdi.

“Doğrudanmı, Adil heç nə görüb-hiss etmir?” – zehnimdən, cavabı özümə də aydın olmayan bir sual keçdi və mən ev-eşiyi yığışdırıb, xörəyi asaraq körpüyə getdim.

Körpüsalanlar məni şən səs-küylə qarşıladılar. Kərəmxan:

– Səriyyə xanım, – dedi, – dünən ayı ətini verdik xırda-xırda getdi. Düz mincə manatımız var.

– Nə çox çıxarıb...

– Hələ ucuz verdik. Lap müftə...

Soltan:

– Bilirsiniz? Biz toxunulmaz fond düzəltmək istəyirik, ağlınız nə kəsir?

– Necə yəni, toxunulmaz fond?

– Yəni, ovdan gələn pulu yığıb saxlayaq. Elə ki, on beş-iyirmi min oldu, ondan sonra nəyə sərf eləmək lazım olduğu barədə fikirləşərik.

Kərəmxan:

– Təklif var ki, – dedi, – xəzinədarımız da sən olasan.

– Mən?

– Hə, sən.

– Yəni, ovdan nə qədər pul yığacaqsınız ki, ona bir xəzinədar da lazım olsun?

– Biz köhnə ovçuyuq, yığarıq, – Kərəmxan özünü çəkdi.

“Köhnə... guya ki, hərəsinin neçə yaşı varmış...”

Soltan:

– Gələn istirahət günü qabana gedəcəyik; ən azı, iki min beş yüz – üç min başının altındadır.

– Doğrudan? Yaxşı, mən sizin bölünməz fondunuzun xəzinədarı.

– “Sizin” niyə? Bəs, sən şərik olmaq istəmirsən? – deyə Kərəmxan soruşdu.

– Mən? Mən nə haqla şərik ola bilərəm? Ovu eləyən siz...

Buldozerçi gülümsəyərək soruşdu:

– Yoxsa, daha bizimlə ova getmək istəmirsiniz?

– İstəyirəm, əlbəttə, istəyirəm, – deyə heç düşünmədən cavab verdim, – ancaq bu şərtlə ki, qoyun mən də atım. Mənim də gülləm dəysin.

– Şübhəsiz.

– Bilirsiniz, məsələn, əgər, qılınc işi olsaydı, onda sizə göstərərdim. Ancaq güllə atmaq...

Buldozerçi eyni təbəssümlə:

– Güllə atmaq çətin deyil, öyrənərsiniz, – dedi.

– Yaxşı. Mən xəzinədar.

Kərəmxan:

– Təklif var ki, Soltan briqadanın başçısı olsun.

– Ovçuluqdamı?

– Ovçuluqda da, körpü salmaqda da, yoldaşlıqda da.

– Başçının hər bir ədalətli əmrini yerinə yetirəcəyimə and içirəm! – deyə mən zarafatmı, həqiqətmi olduğunu bilmədiyim bir təntənə ilə əlimi yuxarı qaldırdım.

– Biz də and içirik! – Kərəmxanla buldozerçi də birlikdə səsləndilər.

Kərəmxan qışqırdı:

– Yaşasın briqadanın başçısı!

Soltan əlavə etdi:

– Yaşasın briqada!

Sonra bərkdən gülüşdük. Soltan dedi:

– Briqadanın ən mühüm şərtlərindən biri budur ki, gərək üzvlərdən heç biri öz sirrini yoldaşlarından gizlətməsin. Kim bu cəsarəti özündə hiss eləmirsə, indidən desin. Yoldaş yoldaşa tən gərək, tən olmasa, gen gərək. Heç kəsə məcburiyyət yoxdur. Əgər, biz ürəyimizdəkini bir-birimizdən gizləyəcək olsaq, demək, həqiqi yoldaş deyilik. Demək, ikiüzlülük edirik.

"Yoxsa, bunlar mənə tələ qururlar?"

Hamımızın üzü ciddi bir ifadə almışdı. Hamımız susurduq.

"İkiüzlülük... oğlan nə yaman dedi! Afərin! Güllәni atma, atdın, düz hədəfə vur. Doğrudan da, nə vaxtacan biz insanlar ürəklərimizi bir-birimizdən gizlədəcəyik?! Nə vaxtacan ikiüzlülük eləyəcəyik?! Kifayətdir!"

– Mən bu cəsarəti özümdə hiss edirəm! – dedim.

– Mən də!

– Mən də!

– Doğrudan da, uşaqlar, – deyə Soltan davam edirdi, – sirlər həmişə insanların arasında bir böyük sədd olmuşdur. Bu səddi uçurub dağıtmaq lazımdır. Həqiqi birlik, həqiqi yoldaşlıq ancaq bu zaman ola bilər. O səddi uçurmaq nə qədər çətin olsa da, biz bunu bacarmalıyıq! Biz bilirik ki, inqilab asanlıqla yaranmır.

Kərəmxan buldozerçinin verdiyi daşı hörgüyə qoyub palçıqla suvayaraq:

– Uşaqlar, – dedi, – mən kimə aşiq olsam, o saat gəlib sizə deyəcəyəm ki, məni intihar-zad eləməyə qoymayasınız.

Yoldaşları gülüşdü. Lakin mən:

– Aşiq olursunuz-olun, daha intihar nə üçündür? – deyə maraqla soruşdum.

– Birdən qız məni istəmədi, ya da istəyib sonra atdı, onda nə cür yaşayaram?

– Hə, – mən də onun kimi zarafatyana cavab verdim, – doğrudan da, çətin olar...

Kərəmxanın bu zarafatı mənə pis təsir elədi. Özümü nəyi isə salıb itirmiş adam kimi narahat hiss elədim.

"Bu buldozerçi nə üçün belə qaşqabağını töküb?" deyə əsəbi halda düşündüm. "Yoldaşları danışıb-gülür, bu isə, dünyanın haqq-hesabını

çəkir.” Mən buldozerçini acılamaq, hirsləndirmək üçün bir söz axtarırdım. Mən, dostlarının sevincinə biganə adamları xoşlamıram, bunu xudpəsəndlik hesab edirəm. Axı, mən bilirəm ki, buldozerçinin heç bir dərdi yoxdur. Bilirəm gözəl bir anası var, arteldə işləyir. Özü də, deyirlər, üç dəfə Moskvaya Kənd Təsərrüfatı Sərgisinə gedib. Deyirlər buldozerçinin özü kimi boylu-buxunlu gözəl bacısı da Gəncədə Kənd Təsərrüfatı İnstitutunu bitirib və həmin institutun müəllimi olan yaxşı bir oğlana ərə gedib. Kefi kök, damağı çağ yaşayırlar. Qaldı ki, özü... Maşallah, deyirsən, bəs, buz baltasıdır. Gündə dörd adamın işini görür, heç yoruldum demir. Amma o gün mən ovurdlarına vurduqca kirpiklərini necə qırpırdı... Mən bu saat onun ovurdlarına məmnuniyyətlə yüz zərbə vurardım.

Soltan saatına baxaraq:

– Tənəffüs! – deyə elan etdi. – Səriyyə xanım, gedək bizə. O gün deyirdiniz ki, kabab xoşlayırsınız. Axşam kənddən təzə qoyun əti gətirmişik.

– Doğrudanmı? Yaxşı. Siz gedin, mən də xörəyə baş çəkim, gəlim.

– Bunu da qoyun xəzinəyə, – Soltan kağıza bükülü pulu mənə uzatdı.

Mən min manatı çamadana qoyub, xörəyin soğanını tökdüm. Nahara hazır olsun deyə, stolun üstünü düzəltdim. Sonra əl-üzümü yuyub, körpüsalanların çadırına getdim.

Buldozerçi qapıda yekə bir ocaq çatmışdı. Soltan stolun üstündə kənddən gətirdikləri pomidorlardan, göy-göyərtidən salat düzəldirdi. Kərəmxan isə, ağac budaqlarından kəsib qayırdığı şişlərə kabab çəkirdi. Doğranıb mis qaba yığılmış ətdən kəklikotu ətri gəlirdi:

Kərəmxan:

– Səriyyə xanım, elə bir basdırma düzəltmişəm ki, ləzzətindən doymayacaqsınız.

Mən də bir iş görüb, kömək eləmək istədim.

– Yox, sən əlini bulama, – deyə Kərəmxan qoymadı, – kabab çəkməyin elmi var.

Başımı buladım:

– Pah-pah!

– Bu, borş-sup deyil ki, sən biləsən. Kabab bişirmək oğul işidir.

O, ilk şişləri gətirib boşqablara çəkəndən sonra:

– Səriyyə xanım, – dedi, – Allahdan gizli deyil, səndən nə gizlin, bir çaxırımız var. İcazə versəydin, onu da gətirərdik.

– İcazə verirəm, gətirin.

– Sağ ol, vallah, – deyib Kərəmxan çadırdan bir şüşə çaxır və dörd stəkan gətirib birini də mənim qabağıma qoydu.

– Etiraf edim ki, heç bir zaman bu qədər ləzzətli kabab yeməmişdim...

– Yaşasın briqada, – deyə Soltan zarafatyana əda ilə qırmızı şərabla dolu stəkanı yuxarı qaldırdı.

Biz də stəkanlarımızı qaldırıb toqquşdurduq. Onlar birnəfəsə stəkanlarını boşaltdılar. Mən bir qurtum alıb, qoydum yerə.

İkinci stəkandan sonra buldozerçinin üzü o qədər mülayim və nəzakətli bir ifadə aldı ki, mən gözümü ondan çəkə bilmirdim. Bu, mənim ilk etirafım idi...

Şüşə boşaldıqda, oğlanlar bir-birinin üzünə baxdılar. Sonra Kərəmxan:

– Səriyyə xanım, – dedi, – Allahdan gizli deyil, səndən nə gizlin, çadırda bir şüşə də var.

– Gətirin!

Mənim birinci stəkanım isə hələ yarısına qədər idi. Lakin kababda onlardan geri qalmırdım. Doğrusu, onların içməyi xoşuma gəlirdi. Elə bil ki, şərab məsum uşaqlıq ifadələrini yenidən geri qaytarırdı. Qəddqamətli, məğrur buldozerçi iynənin ulduzundan keçəcək dərəcədə incə olmuşdu. O mənə baxmamağa çalışsa da, mən tez-tez baxırdım. Mən ikiüzlülük etməməyə – briqadadan heç nə gizlətməməyə and içmişdim. Kərəmxan axırıncı stəkanını yuxarı qaldıraraq:

– Uşaqlar, – dedi, – arzumuz budur ki, briqada xoşbəxt olsun. Ürəyimiz dərd-qəm görməsin. Körpüləri tez salaq, dağın o tərəfindəki fermalara gedən yolu tez qurtaraq. Maşınların Zoğallı körpüdən qıjıltı ilə necə keçdiklərinə baxıb ləzzət alaq.

– Sağ olsun körpüsalanlar! – deyə mən həyəcanla əlavə edərək, stəkanımı onların stəkanları ilə toqquşdurdum.

Bir saatlıq tənəffüs tamam olan kimi Soltan ayağa qalxaraq:

– İndi isə, briqada, iş başına! – deyə nəşə ilə komanda verdi.

Biz düz saat beşə qədər qızğın işlədik. Körpünün hörgüləri artıq hazır idi. Biz bu işi nəzərdə tutduğumuzdan dörd gün tez qurtarırdıq. Kərəmxan hörgünün təzə divarlarına baxaraq:

– Körpəmiz, deyəsən, yavaş-yavaş ayaq üstə durur, – dedi.

Biz körpünü zarafatla "körpəmiz" adlandırırdıq. İşi tez qurtaraq deyə üç-dörd gün bundan qabaq Adil bizə iki nəfər əlavə işçi vermək istəyirdi, lakin briqada buna razı olmadı.

Mən:

– Öz körpəmizi özümüz böyüdəcəyik! – dedim.

– Yaxşı, etiraz eləmirəm, – deyə Adil cavab verdi, – ancaq körpü, mərkəzə vəd etdiyimiz vaxtda qurtarmalıdır.

Soltan da gülümsəyərək:

– Narahat olmayın, – dedi, – sizi mərkəzin yanında xəcalət eləmərik.

Sonra daha ciddi ifadə ilə əlavə etdi:

– Balaca selav körpüsüdür. Dördümüz öhdəsindən gələ bilərik.

Adil razı halda maşına minib getdi.

Bu əhvalatdan bir neçə gün əvvəl, biz öz aramızda məsləhətləşib söz qoymuşduq ki, körpünü vaxtından iyirmi beş gün tez qurtaraq. Soltan da bunu yol rəisinə xəbər vermək əvəzinə, "qorxmayın, sizi mərkəz yanında xəcalət eləmərik" dedi. Buldozerçi isə, səbrsiz halda üzünü yana çevirdi.

Körpü tikildikcə, onunla bizim aramızda qəribə bir ünsiyyət yaranırdı. Sanki o, yenicə ayaq tutan körpə bir məxluq kimi, yosunlu qayadan çıxıb tökülən balaca çayın şırıltısını, bizim nəşəli səs-küyümüzü, gülüşümüzü sevinclə dinləyir, ətrafdakı qalın meşələrə maraqla baxıb gülümsəyirdi...

... Axşam saat yeddiyə işləyəndə Adil işdən çox nəşəli qayıtdı. Naharını böyük iştaha ilə yedi.

– Saata nə tez-tez baxırsan, Adil? Yoxsa, bir yerə gedəcəksən?

– Səkkizə on beş dəqiqə işləyəndə yol barəsində oçerk veriləcək. Radionu aç.

– Nə bildin? – deyə mən radioqəbuledicini açaraq, onun üzünə baxmadan soruşdum.

– Gündüz Bakıdan zəng eləmişdilər.

Oçerkin adı "İstedadlı mühəndis" idi.

Əvvəlcə Adilin xarici görünüşü, hətta, geyimi və müəlliflə necə nəzakətli bir təbəssümlə söhbət elədiyi təsvir olunurdu. Sonra institutda oxuduğu illərdən, nazirlikdəki fəaliyyətindən danışılırdı.

... "O, təbiətin işgüzar bir adamıdır. Nazirlikdə işlədiyi dörd il müddətində bir dəqiqə də olsun işə gecikməmişdir. O həmişə irəliyə can atır. Heç bir zaman bugünkü işini sabaha qoymur..." Mənim tanımadığım diktor qız çox aydın və təbii danışırdı.

Mühəndis qaşlarını çataraq dinləyirdi.

Sonra diktor onun "K" rayonundan dağlardakı fermalara çəkilən yola rəis təyin olunmasına keçərək dedi:

“Gənc mühəndis gələn kimi sanki burada həyat görünməz bir qüvvə ilə qaynamağa başladı. Onu, ayaqlarında brezent çəkmə, əynində qolları qısa köynək, daim bu və ya digər sahədə görmək olar...”

İndi onun qaşlarının çatılışında və uçurumdan o yana, dərəyə zillənən gözlərində məmnun bir ifadə oxunurdu. Hiss edirdim ki, ərim öz taleyindən razıdır. Hiss edirdim ki, onun uzaqlara baxan gözləri qarşısında gələcək fəaliyyətinin təntənəsi canlanmışdır. Birdən diktor: “Onun həyat yoldaşı gənc texnik Səriyyə Musabəyli də hazırda Zoğallı körpünün salınmasına rəhbərlik edir” dedi və mən diksinərək, Adilə baxdım. O mənim baxışıma cavab olaraq, məhəbbətlə gülümsədi. Adil öz taleyindən razı idi. Lakin onun təbəssümü sanki minlərcə iynəyə çevrilib mənim əsəblərimə sancılırdı. Diktor məni tərifləyirdi:

“Səriyyə uzaq və qalın meşələrdə, sıldırım dağlar arasında körpüsalanlara məharətlə başçılıq edir. Onun təşəbbüsü ilə yoldaşları əlavə işçi istəməyərək, körpünü öz qüvvələri ilə salıb qurtarmağa söz vermişlər. Səriyyə işləməklə barabər, ali məktəbə girməyə də hazırlaşır.

Mühəndis Adildə güclü təşkilatçılıq bacarığı vardır. O...”

Diktor daha bir neçə dəqiqə danışdı. Lakin mən daha qulaq asmırdım. Mühəndis Adilin fəaliyyəti artıq mənə məlum idi...

Onun uzaqlara, öz şöhrətinin təntənəsinə zillənmiş baxışları dözülməz idi. “Yəqin ki, körpüsalanlar da indi öz balaca radioqəbuledici aparatlarında qulaq asırlar” deyə düşünürdüm.

Oçerk oxunub qurtarandan sonra o, dərindən nəfəs alaraq, yenə də məhəbbətlə mənə baxdı...

Mən:

– Bilirsən, Adil, – dedim, biz bu gün körpüsalanlarla şərab içdik, heyf ki, sən olmadın.

– Körpüsalanlarla nə içdiniz? – deyə o, təəccüblə soruşdu.

– Şərab. Gözəl Azərbaycan şərabı...

Onun baxışlarındakı təəccübü dərin düşüncə kölgəsi əvəz etdi. Yavaş və mülayim səslə soruşdu:

– Nə əcəb? Sən ki, içməyi sevmirsən...

– Yoldaşlarım təklif etdilər, mən də içdim!

– Nə olar, yaxşı eləmisən...

“Ax... demək, belə...”

Mən başqa zəhərli bir söz axtardım və bunu tapmadıqda, ona kinli bir nəzər salaraq, qalxıb çadıra girdim.

## ADİL

... Mən o dəhşətli fırtına buludlarının sıxlaşa-sıxlaşa bizim çadırımızın üzərinə yeridiyini görürdüm... Mən, hər şeydən əvvəl, öz hərəkətlərimi diqqətlə təhlil edirdim.

Oçerkdə deyilənlərin hamısı həqiqət idi. Mən dağların o biri tərəfindəki fermalara gedən yolu bacardıqca tez qurtarmağa can atır və bunun üçün əlimdən nə gəlirdisə eləyirdim. İş sahələrinə baş çəkmədiyim bir gün də olmurdu. Fəhlələrin məəttəl qalmaması üçün bütün materialları həmişə vaxtından bir neçə gün qabaq daşıtdırırdım. Adamların maaşını bir gün də gecikdirmirdim. İstər yerli idarələr, istərsə də mərkəz mənim işimdən çox razı idi. Mən hər ikimizin (Səriyyənin və özümün) həyatı qarşısında məsul idim. Bilirdim ki, bu çəkdiyimiz yol, eyni zamanda, bizim gələcəyimizə gedir. Sadəcə desək, əgər, mən pis işləsəm, yolu vaxtında qurtarmasam, bir də heç bir zaman bu cür müstəqil, məsul iş üzü görmərəm. Mən fatalist deyiləm. Bilirdim ki, hər gənc ailənin gələcək səadəti, birinci növbədə, ailə başçısının ağıllı hərəkət etməsindən asılıdır. Mən boş xəyallara, təsadüflərə bel bağlayanlardan deyildim. Mən bütün şahmat fiqurlarının qabaqcadan əsaslı surətdə düşünülmüş möhkəm plan üzrə hərəkət etməsini istəyirdim, həyata qarşı həmişə hücumçu olmaq fikrindəyəm. Daha doğrusu, bu mənim prinsipim, əqidəm idi. Mən müdafiə mövqeyində dayanmağa nifrət edirdim. Ona görə də, yola rəis təyin olunub gəldiyim lap ilk gündən işi elə qurdum ki, adi idarələrin qarşısında mən yox, idarələr mənim qarşımda başlarını itirirdilər. Mən smeta üzrə yola lazım olan materialları, məsələn, sementi, betonu, boruları dərhal daşıtdırır, qalanını isə, vaxtından azı bir ay qabaq tələb edirdim. Onlar materialı tələb etdiyim vaxtdan gec verdikdə isə, aləmi bir-birinə vururdum.

– Yoldaş Adil, xahiş edirəm, üççə gün də dözsəniz...

– Yoldaş Adil, siz nazirə nahaq şikayət eləmisiniz. Biz həmişə əvvəlcə sizin sahənizi təmin etməyə çalışırıq.

– Yoldaş Adil, olub-qalan taxtanı sizə verdik. Bir az səbr eləyin.

Lakin mən səbr eləmirdim. Bu barədə özümü tamamilə haqlı hesab edirdim: "Əgər, hamı mənim kimi işləsə, vaxtında tələb eləsə, heç nəyə "yox" deyilməz. Vaxtında tələb etməmisənsə, vaxtında almamısansa, onda zəhmət çək cavab ver!"

Beləliklə, yolun çəkilişində, körpülərin salınmasında hər iş, mənim üslubuma uyğun olaraq, öz qaydası ilə gedirdi. Plan hər həftə nəzərdə

tutduğumdan da artıq həyata keçirilirdi. Bununla belə, mən narahat idim. Çox narahat idim...

Biz Səriyyə ilə bir-birimizi istəyərək, neçə ay gəzib-dolanaraq evlənmişdik. Doğrudur, anam-atam bu işə narazı idilər. Onlar deyirdilər ki, mən adlı-sanlı ailədən olan, yaxşı təhsil görmüş bir qızla evlənə bilərəm. Xüsusən, anam ipə-sapa yatmırdı. Lakin evlənmək barədə mənim ancaq özüməməxsus gizli mülahizələrim var idi. Mən belə güman edirdim ki, istər ailə cəhətincə, istərsə də təhsildə, hətta, xarici görünüşdə də qız oğlana nisbətən bir pillə aşağıda dursa yaxşıdır. O zaman sənin sözün (əlbəttə, əgər, sən ədalətli və ağıllı bir ailə başçısısansa) daha kəsərli olar. Sən ailə barəsində öz fikirlərini (əlbəttə, haqlı fikirlərini) daha asanlıqla həyata keçirə bilərsən. Sən öz arvadına qarşı son dərəcə həssas və diqqətli olmalısan. Hər bir kiçik səhvi dərhal duyub ləğv etməyi bacarmalısan. Əks təqdirdə...

Bura gələndən bir neçə gün sonra mən onun buldozerçinin köynəyinə düymə tikdiyini görərkən əvvəlcə təəccüb etdim. Sonra anamın "yaxşı ailədən olan, yaxşı təhsil görmüş qız..." haqqındakı fikirlərini xatırlayaraq, ürəyimdə gülümsədim, "aha, yavaş-yavaş mətləb üstünə gəlirik" dedim.

Sonra o, körpüsalanlarla tennis oynamağa gedəcəyini söylədikdə, mümkün qədər sakit tərzdə narazılığımı bildirdim. Buna baxmayaraq, o getdi. Qayıdanda isə, mən bu barədə ona heç bir söz demədim. Mən bilirdim ki, belə işlərdə ehtiyatla hərəkət etmək, aradakı pərdəni götürməmək lazımdır. Həyat çılpaqlığı sevmir. Səhəri gün o yenə də tennis oynamağa getdi və mən yenə də bir söz demədim...

Mən onun buldozerçini görərkən narahat vəziyyət aldığını hiss edirdim. Lakin bu barədə düşünməyi belə özümə ar bilirdim. Mənim arvadım... buldozerçi haqqında ayrı nə fikirdə ola bilərdi?!.

Mən, Səriyyənin körpüsalanlarla ova getməsinə də etiraz eləmədim. Mən zor tətbiq eləyə bilməzdim, hər şeyi onun özünün başa düşməsi lazım idi. Doğrudur, onun öz iş yoldaşları ilə tennis oynamasında və ya ova getməsində heç bir qəbahət yox idi. Lakin mən onun getməsini istəmirdim. Mən yol rəisi idim. Həyat yoldaşım bunu anlamalı idi. Madam ki, mən getmirdim, demək onun da getməsi lazım deyildi. Həkim xəstəni müşahidə eləyən kimi, mən də onun hərəkətlərinə fikir verir, haradan başlayacağımı bilmirdim. Hər şeydən əvvəl, xəstəliyin özünü düzgün müəyyən etmək lazım idi. Bunsuz müalicə mümkün

olmazdı. Əgər, mənim haqqımda oçerk oxunan zaman onun keçirdiyi ruhi vəziyyəti görməsəydim, əgər, o, körpüsalanlarla şərab içdiyini mənə elə kinli-kinli söyləməsəydi, bəlkə də, mən indi bu çətin düşüncələrə qərq olmazdım. Oçerk oxunub qurtarandan sonra onun necə qızardığını, mənə necə baxdığını və körpüsalanlarla şərab içdiyini ağlasığmaz, heç gözlənilmədən, nə cür gizli bir qəzəblə söylədiyini indi də yadıma salanda ürəyim ağrıyır. Bu nə qəribə hal idi? O nə üçün birdənbirə mənə qarşı bu qədər kinli olmuşdu? Mən nə etmişdim? Qəbahətim nə idi? Əgər, məni tərifləyirdilərsə, burada pis nə var idi? O nə üçün bunun əvəzində məni yandırmaq istəyirdi? Mən ki, onun əri, həyat yoldaşı idim. Mənim təriflənməyim onun tərifləməyi deyildimi? Bir də, axı, məni havayı yerə tərifləmirdilər! Mən bu haqqı öz zəhmətimlə, işimlə qazanmışdım. Məgər, mən onun və onun gələcək uşaqlarının səadəti üçün əlləşib-vuruşmurdummu?

Birdən nəğmə səsi eşidildi. Arsız və yüngülxasiyyət oğlan olan Kərəmxan, nə isə, gülməli bir şey oxudu, sonra yoldaşları ağız-ağıza verib dedilər.

Ay Dadaş,
Atma daş –
Mən yaralıyam,
Şəkinin, Şirvanın
Mən maralıyam.

Onlar bu axmaq nəqəratı təkrar edib bərkdən gülüşdülər. Səriyyə içəridən çıxıb qapının ağzında dayanaraq, körpüsalanların çadırına tərəf baxdı və onun üzündəki gərgin ifadəni xoş bir təbəssüm əvəz elədi. Mən oxuyanlara tərəf işarə edərək kəskin istehza ilə:

– Deyəsən, içdiyiniz şərabın təsiri özünü indi göstərir, – dedim.

Lakin o, əvvəlcə, elə bil, məni eşitmədi. Sonra üzümə elə qəribə, soyuq bir nəzər saldı ki, elə bil, məni ilk dəfə görür və kim olduğumu xatırlamağa çalışırdı. Elə bil, mən tamamilə uzaq, yad bir adam idim. Bayaqkı şərab söhbətindən sonra bu, mənə ikinci ağır zərbə idi. Mən bir anlığa özümü alçalmış, təhqir olunmuş kimi hiss elədim. Mənə elə gəldi ki, hələ iyirmi yaşı tamam olmamış, orta təhsilli bir çilingər qızı mənə xeyli yuxarıdan baxır!..

Lakin bu duyğunun mənim üzərimdəki hökmü yalnız bir an çəkdi. Mən qətiyyətlə ayağa qalxaraq:

– Bilirsənmi nə var, – dedim, – işdən sonra onlara getməyi sənə qadağan edirəm.

O gülümsədi və birdən-birə mənə fövqəladə dərəcədə gözəl göründü. Onun təbəssümündə dərin bir məmnuniyyət var idi. Ona sillə vurmaqdan özümü güclə saxladım.

– Yox, Adil, – dedi, – mən "qadağan" sözünü xoşlamıram.

– Yaxşı, onlara getməyi sənə məsləhət görmürəm.

– Nə üçün? – deyə o elə arxayınlıqla soruşdu ki, elə bil, sualın cavabı ona əvvəlcədən məlum idi. O, dəhşətli dərəcədə cazibədar və qəddar idi!

– Bir özün düşün: cavan qadın subay oğlanlara qoşulub...

– Nə olsun? Yoxsa, qısqanırsan?

Hiddətimi boğaraq:

– Əgər, onlar mənim tayım-bərabərim olsaydılar, bəlkə də, qısqanardım...

O, təkrar gülümsədi, məmnun göründü.

– İndi ki, tayın-bərabərin deyillər, bəs, niyə deyirsən?

– Sən mənim mövqeyimin tələb etdiyi yüksəklikdə dayanmağı bacarmalısan!

– Sənin mövqeyinin... Yox, Adil, mən sənin tələb etdiyin yüksəklikdə dayana bilmərəm. Mən onların yoldaşıyam. Biz dördümüzün də adını bir kağıza yazıb, hörgünün bünövrəsinə qoymuşuq. Biz bir briqadayıq.

– Sonra söz-söhbət olar. Gedər yuxarılara-zada çatar.

– Çatsın! Sən ki, məni tanıyırsan. Briqada ki, məni tanıyır.

– Bilirsənmi, Səriyyə, – deyə bu dəfə mülayim ifadə ilə izaha çalışdım, – biz həyatda hələ təzə-təzə ayaq tutub yeriyirik. Bizim haqqımızda pis bir fikrin əmələ gəlməsi bütün gələcəyimizə təsir eləyə bilər. Məni pilləkənin yarısından qayıdıb təkrar aşağı düşməyə məcbur edərlər, bir də yuxarı qoymazlar. Sən bunu başa düşməlisən!

– Başa düşürəm.

– Odur ha... Əsas məsələ budur. Yoxsa, onlar kimdirlər ki, səni onlara qısqanım?

– Onlar körpüsalanlardır!

– Nə olsun körpüsalanlardır! Müftə işləmirlər ki? Körpü salıb, pul alırlar.

– Sən də pul alırsan.

– Elədir. Ancaq mən mənəm. Onlar da onlar!

– Hər halda, onlar sənin kimi qorxaq deyillər.

– Mən qorxağam?

– Bəli, qorxaqsan!

– Mən nədən qorxuram?

– Rəislikdən çıxarılmaqdan! Karyerandan!

– Rəislik mənim vəzifəmdir. Mən öz ailəm qarşısında, cəmiyyət qarşısında məsulam, mən sənin kimi yelbeyin qadına xoş gəlmək üçün özümü uçuruma ata bilmərəm... Sən... Sən...

Mən qəzəbimi ifadə etmək üçün söz tapa bilmirdim. O isə, mələk donuna girmiş iblis kimi gülümsəyib:

– Doğrudur, – dedi, – buna görə də, hər yerdə özünü gözə dürtmək istəyirsən... Özün haqqında oçerklər yazdırırsan.

– Oçerkləri mən yazdırmıram! – deyə qışqırdım.

– Sən yazdırırsan! Əgər, sən yazdırmasaydın, yanına gələn müəllifə deyərdin ki, məndən də artıq zəhmət çəkən adamlar var. Get, əvvəlcə onlardan yaz.

– Məsələn, kimdi onlar?

– Məsələn, onlar iki ayda görüləcək işi iyirmi beş gündə yerinə yetirən Soltan, Kərəmxan...

– Bəs, o yekəpər buldozerçini niyə demirsən? Sən öz ərini gör kimlərlə müqayisə edirsən...

– Onlar “kimlər” deyil, Adil! Onlar mənim yoldaşlarımdır. Biz bir briqadanın adamlarıyıq. Mən onları çox istəyirəm. Sən onların heç birini təhqir eləyə bilməzsən.

Cavab vermədim. Daha doğrusu, cavab vermək iqtidarında deyildim. O bütün gözəlliyi və amansızlığı ilə qarşımda dayanmışdı. Mən subay çağlarımda ideal ailə həyatı haqqında çox düşünərdim. Bu da sənə ideal ailə! Bu da sənin müqəddəs həyat yoldaşın! Sən onun səadəti üçün özünü oda-közə vurursan, o isə, səni vəzifəbazlıqda, saxtakarlıqda təqsirləndirir. Bundan sonra gəl səmimiyyətdən, məhəbbətdən danış!

... Mən onu ilk dəfə texnikumun buraxılış imtahanında görmüşdüm. Əynində qolları disəkdən yuxarı idman köynəyi, ayaqlarında qısaboğazlı corab, yüngül məs var idi. Mən nazirlik tərəfindən imtahanda nümayəndəydim. Onun cavabları o qədər tərifli olmasa da, aydın və cəsarətli idi. O tez-tez mənə baxaraq, yanındakı qıza nə isə deyirdi. Riyaziyyatdan şifahi imtahan verdiyi zaman orta məktəbdə mənimlə birlikdə oxumuş müəllim:

– Adil, – dedi, – bizim bu Səriyyə xanım almanca yaman bilir. Hötenin şerlərini sənə əzbərdən deyər.

– Doğrudanmı? – deyə mən gülümsəyərək qıza baxdım.

Sonra almanca soruşdum:

– Yol texnikumunda oxumaq sizin haradan ağlınıza gəlmişdir?

– Mən əvvəlcə, – deyə o da eyni dildə cavab verdi, – atamın məsləhəti ilə neft texnikumuna daxil olmaq istəyirdim. Ancaq orada riyaziyyatdan kəsildim. Sonra elə oldu ki, bura gəldim.

Almanca bilməyən müəllim dostum maraqla qulaq asaraq:

– Hə, necədir? – soruşdu.

– Çox gözəl bilir, – dedim.

Birdən qız:

– Siz də yaxşı danışırsınız, – deyə mənə baxıb gülümsədi. Və elə bil, bu bir cümlə ilə birdən-birə məni öz hökmü altına aldı. Mən almanca ondan haralı və kimin qızı olduğunu soruşdum.

O:

– Neyləyirsiniz?

– Elə-belə, maraqlanıram.

Mən başqalarını şübhəyə salmamaq üçün ciddi və işgüzar bir görünüş alaraq, yenə də almanca öz telefon nömrəmi ona söyləyib, xahiş elədim ki, buraxılış imtahanlarını verib qurtarandan sonra mənə zəng eləsin.

O, mənə baxmadan:

– Yaxşı, – deyə cavab verdi.

– Telefon nömrəsi yadınızdan çıxmadı ki?

O, telefon nömrəsini təkrar etdi.

“Siz də yaxşı danışırsız” sözləri o gecə yüz dəfə fikrimdən gəlib keçirdi və hər dəfə də mən onun əsmər bənizini bütün aydınlığı ilə görürdüm. Onun gülümsəyən qara gözlərinin dərinliklərində indiyə qədər mənə məlum olmayan bir aləm var idi. Bu aləmdə hər şey təzə və maraqlı idi. Mən çarpayımda uzanaraq gözlərimi qaranlıq divara zilləyib, bu aləmi həsrətlə seyr edirdim. O biri otaqda yatmış atam-anam sanki çox uzaqlarda qalmışdılar. Elə bil, mən bir də onları görməyəcəkdim. Mən özümdən başqa heç nə duymurdum, yalnız öz varlığımı və onun şiddətli arzusunu hiss edirdim. Mən bu arzuya qovuşmaq üçün hər şeyi vurub-dağıtmağa hazır idim. Mən acmış pələng kimi qəzəbli və narahat idim. Başımın altındakı balışı dönə-dönə o tərəf-bu tərəfə çevirirdim. Balışımın yumşaqlığı məni hirslən-

dirirdi. Birdən xatırladım ki, bu balış içinə doldurulan quş tüküdür. Vaxtilə həyatda olmuş, yaşamış quşların tükü!

Lakin o həyatın artıq mənə dəxli yox idi. Mənim indi görüb-duyduğum ailəmdə nə quşlar var idi, nə də bu mənfur yumşaq yastıqlar. Qalxıb işığı yandıraraq, güzgünün qabağına keçdim və diqqətlə özümə baxdım. Gündüz "almanca yaman bilir" deyə Səriyyəni mənə təqdim eləyən müəllim dostumu xatırlayaraq, onun kimi çirkin olmadığımdan dərin bir məmnuniyyət duydum. Səriyyənin almanca mənim telefon nömrəmi necə pıçıldadığını təkrar-təkrar eşidirdim. Mən həyəcanla otağın içində var-gəl edərək səhərin tez açılmasını istəyirdim. Damarlarımdakı həyat qüvvəsi heç bir zaman bu qədər tələbkar və amansız olmamışdı.

İşıqda tək qalmaq mənə ağır görünürdü. Elə bil, kimin qarşısında isə ifşa olunurdum. Əsəbi addımlarla irəliləyib çırağı söndürdüm. Təkrar qaranlıq divarlarla üz-üzə qalanda qədim yunanların sevgi allahlarını xatırladım. "Qəribədir, görəsən, insanlar bu allahları nə üçün uydurmuşlar? Onları buna nə məcbur etmişdir?"

Biz evlənən zaman mən növbəti məzuniyyət götürdüm və düz iyirmi dörd gün, demək olar, evdən çıxmadım.

Sonra... hər şey öz qaydası ilə getməyə başladı. Mən daha yunanların eşq allahları haqqında düşünmürdüm. Mən onları unutmuşdum. Lakin bu gün oçerk oxunandan sonra, Səriyyə körpüsalanlarla şərab içdiyini söyləyərkən, onu birinci dəfə gördüyüm günü yenidən xatırladım. Qanım yenidən coşdu, yenidən mənə elə gəldi ki, onu indicə görürəm, ona nə qədər bağlı olduğumu, onsuz bir gün də yaşaya bilməyəcəyimi bu qədər aydın hiss edirəm. Lakin onun bu lənətə gəlmiş körpüsalanlara münasibəti mənim üçün müəmma idi... Mən bütün gücümü toplayaraq bunu açıb-ağartmamağa çalışırdım. Ona görə də, onun hər axşam körpüsalanlarla tennis oynamasına, hətta, onlarla ova getməsinə mane olmurdum. Bu maneçilik vəziyyəti daha da tündləşdirə bilərdi. Onun gözündə bu körpüsalanların əhəmiyyətini daha da artırardı. "Körpüsalanlar" dedikdə isə, istər-istəməz, gözümün qabağına dərhal buldozerçi gəlirdi. Yuxarıda dediyim kimi, mən Səriyyənin bu istefaya çıxmış kiçik leytenantı hər dəfə görəndə nə üçünsə narahat bir vəziyyət alaraq, tez mənə baxdığını duyur və bunu səbəbsiz hesab etmirdim. Lakin gerisini düşünmürdüm. Elə bil, qarşımda dərin bir uçurumun açıldığını hiss edərək geri qayıdırdım. Hətta, bu

gün o, körpüsalanlarla şərab içdiyini söyləyəndə də, mən şübhələrimdə uzaqlara getməkdən çəkindim. Mənə elə gəldi ki, bu sözü acığı tutduğu üçün deyir. Ancaq onun mənə nə üçün acığı tutmalı idi?

Burada çox ehtiyatlı hərəkət etmək lazım idi. Ona görə də, mən səhər durub işə gedəndə özümü axşam aramızda heç bir şey olmamış kimi şən apararaq:

– Səriyyə, – dedim, – bu gün bəlkə Gəncəyə getdim, sənə nə alım gətirim?

O da heç bir şey olmamış kimi:

– Nə istəyirsən, – deyə cavab verdi.

– Bilirəm, yəqin ki, “Mişka” yadına düşüb, – deyə zarafatla onun üzünə toxundum.

– Yox, yox, lazım deyil.

– Nə üçün? Sən ki, konfet xoşlayırsan.

– Daha istəmirəm. Şirin şeydən acığım gəlir.

Buna baxmayaraq, Gəncədən qayıdanda dörd-beş cür konfet və Səriyyə üçün yaxşı bir paltarlıq alıb gətirdim. O bu hədiyyələri əvvəlki həvəslə almasa da, hər halda, yaxşı qarşılayıb, təşəkkür elədi. Nahardan sonra mən mümkün qədər sakit bir ifadə ilə:

– Səriyyə, – dedim, – hər gün bura gəlib-getmək mənim üçün çətin olur. Ona görə də, bu qərara gəlmişəm ki, hələlik, köçüb rayonun mərkəzində qalaq. Havalar da o qədər isti keçmir.

O mənə iti bir nəzər saldı:

– Bəs, mənim işim nə olsun?

– İşin nə olacaq? Körpü sənsiz də salınar, – deyə mən qəsdən əsnəyərək cavab verdim.

– Yox, Adil, – dedi, – körpünü salıb qurtarmayınca heç yerə getmərəm.

Mən yenə də əsnəyərək biganəliklə:

– Özün bil, – dedim, – burada sənin üçün də narahat keçir.

– Eybi yoxdur. Mən heç bir çətinlik çəkmirəm.

Mən qəzəbimi güclə saxlayaraq gülümsədim:

– Yəni, körpünün taleyi səni məndən çox maraqlandırır?

– Səni körpünün taleyi maraqlandırmır, Adil.

– Bəs, nə maraqlandırır?

– Öz taleyin!

– Səriyyə, – deyə mehribanlıqla soruşdum, – niyə sən mənim gözümün içinə belə sözlər deyirsən?

– Mən ikiüzlülük eləməmək üçün briqada qarşısında and içmişəm, Adil! Ona görə də, hiss elədiyimi deməliyəm.

– Hansı briqada qarşısında and içmisən?

– Körpüsalanlar briqadası qarşısında. Bizim qanunumuz belədir.

– Yaxşı, sözüm yoxdur. Məgər, mənim taleyim sənin taleyin demək deyil?

– Bilmirəm, ancaq biz hələ bu körpüdən sonra yuxarı dağlarda ayrı bir körpü də salmalıyıq. Sən özün deyirdin ki...

"Doğrudan, mən deyirdim, lakin mən bu körpülərin bizim aramızda bu cür vəziyyət yaradacağını bilmirdim. Bu körpü səni məndən uzaqlaşdırır. Bu isə dəhşətdir... Sənin indiki əhvali-ruhiyyən mənim yuxuma da girməzdi. Sən nə yaman soyuq olmusan?! Nə yaman amansız olmusan?! Briqada qabağında and içmişəm... Briqada..."

## SƏRİYYƏ

... Mən körpüsalanlar briqadasından ayrılmayacağımı qəti bildirəndən sonra, Adil bir də bu barədə danışmadı. Mənə qarşı daha mehriban, daha şən oldu. Tez-tez zarafat edir, axşamçağları mənimlə birlikdə meşəyə gəzməyə çıxırdı. Nə körpü barədə, nə də bizim briqada haqqında heç nə soruşmurdu. Lakin rayona köçmək söhbətindən dörd gün sonra biz körpünün böyük borularını bərkitdiyimiz zaman, motosikletdə bir oğlan gəlib buldozerçiyə bir zərf verdi. O da cəld açıb, içindəki balaca kağızı gözdən keçirdi. Buldozerçi gülümsəyərək kağızı Soltana uzatdı. O da alıb bərkdən oxudu. Bu, buldozerçinin birinci sahəyə dəyişilməsi barədə yol rəisi Adil tərəfindən verilmiş əmr idi. Soltanla Kərəmxanın nəzərləri bir anlıq mənə dikildi.

– Bəyəm, bizə buldozerçi lazım deyil? – deyə Kərəmxan soruşdu.

– Necə lazım deyil? – Soltan acıqla cavab verdi. – Naçalnik bizimlə məsləhətləşə bilməzdi?

Buldozerçi:

– Yaxşı, uşaqlar, – dedi, – mübahisə yersizdir. Vaxta ki, naçalnik belə məsləhət bilir, demək, əməl olunmalıdır.

– Düz demirsən, – deyə Soltan etiraz etdi, – biz uşaq-zad deyilik ki, hər bir əmrə kor-koranə tabe olaq. Axı, əslində bu körpüdə dörd yox, yeddi-səkkiz adam işləməli idi. Biz özümüz istəmədik. Gördülər

ki, sözümüz sözdür. Yeddi-səkkiz adamın bir ayda görəcəyi işi biz iyirmi gündə başa vurduq. Bəs, niyə belə eləyirlər?

Sonra mənə müraciətlə əlavə etdi:

– Biz yoldaşıq. Bundan qabaq Girdmançayın üstündə salınan körpüdə də birlikdə işləmişik, bir-birimizin xasiyyətinə bələd olmuşuq. Birlikdə təşəkkür almışıq. İndi rəis götürüb belə edir.

Buldozerçi:

– Məncə, – dedi, – bu giley-güzar mənasızdır. – Sonra zərfin üstünə qol çəkib, motosikletdə gələn oğlana qaytardı.

Mən də həmin oğlana:

– Rayon mərkəzinə qədər məni də apararsınızmı?

– Əlbəttə, buyurun.

Sonra mən Soltana zarafatyana:

– Yoldaş briqadir, – dedim, – mənim rayon mərkəzində çox vacib bir işim var, səhər yadıma düşməyib Adilə deyim, icazə olarmı?

Soltan qaşqabaqlı tərzdə:

– Gedin, – dedi.

Mən paltarımı belə dəyişmədən motosikletdə gələn oğlanın tərkinə əyləşdim...

Yol idarəsi rayon icraiyyə komitəsi binasının ikinci mərtəbəsində yerləşmişdi. Adilin on yeddi-on səkkiz yaşlı göyçək bir qız olan katibəsi məni başdan-ayağa süzərək:

– Naçalnik məşğuldur, – deyib üzünü o yana çevirdi.

– Nə ilə məşğuldur?

– Hər gələnə haqq-hesab verəsi deyilik ki! Sizdən başqa da gözləyənlər var, – deyə katibə, o tərəfdə əyləşmiş üç kişini göstərdi.

Mənimlə motosikletdə gələn oğlan yaxınlaşıb, onun qulağına nə isə dedi və qız cəld ayağa qalxıb gülümsəyərək:

– Bağışlayın, – deyə məndən üzr istədi.

Sonra qapıya işarə ilə:

– Buyurun, – dedi.

Adilin səliqəsinə nə söz! Heç nazirin özünün də bu cür kabineti ola bilməzdi. Qoz ağacından qayırılmış təzə yaraşıqlı yazı stolu. Ağ mərmər ləvazimatı. Səliqə ilə çərtilmiş rəngarəng karandaşlar. Büllur qrafin və stəkan. Qar kimi ağ örtüklü stullar, məxmər pərdələr...

Adili yaxından tanımayan bu az zaman içində onun bütün bunları necə düzəltdiyinə təəccüb edərdi.

O, stolun arxasında oturub nə isə yazırdı.

Başını qaldırıb məni görəndə bir neçə saniyə diqqətlə üzümə baxdı, sanki nəyi isə aydınlaşdırmağa çalışdı.

Sonra gülümsəyib qələmi yerə qoydu.

– Nə əcəb?

– Elə-belə gəldim, – dedim və stul çəkib oturdum.

– Nə ilə gəldin?

– Motosikletlə. Sən göndərdiyin oğlanın tərkində...

O, qıpqırmızı qızardı:

– Axı, yaxşı deyil, camaatın içində belə iş eləyirsən. Əgər, gəlməyin bu cür vacib idisə, sifariş eləyəydin, maşın göndərəydim.

– Eybi yoxdur.

– Sənin üçün eybi yoxdur, amma mənim üçün...

– Briqada sənin əmrinə etiraz edir.

– Hansı əmrimə?

– Buldozerçinin başqa yerə dəyişilməsi haqqındakı əmrinə.

– Sən bundan ötrü gəlmisən?

– Bundan ötrü.

O, dərindən nəfəs alaraq, stulun arxasına söykəndi. Sonra yavaş səslə:

– Briqadanın nə ixtiyarı var, – dedi, – rəisin əmrinə etiraz eləsin?! Anarxiya-zad deyil ki...

– Doğrudur, anarxiya deyil, ancaq rəis haqsız olduqda, etiraz eləmək olar.

– Nədən bilirsən ki, rəis haqsızdır?

– Özün də bilirsən ki, haqsızsan!

– Sən nə üçün belə işlərə qarışırsan? Buldozerçinin başqa yerə dəyişilməsinin sənə nə dəxli var?

– Mənə dəxli var, çünki biz bir briqadanın üzvüyük! Əgər, sən əmrini geri götürməsən, mən bu saat nazirliyə zəng edəcəyəm, gəlib kimin haqlı olduğunu ayırd eləsinlər. Biz körpünü birlikdə başlamışıq, birlikdə də qurtaracağıq. Buldozerçi bizə hamıdan çox lazımdır.

– Sonra ayrısını göndərərəm.

– Ayrısını Qəribi təyin elədiyin yerə göndərsən nə olar?

– Səni bura onlar göndərib?

– Yox, özüm gəlmişəm.

O, nəzərlərini yerə dikib bir neçə saniyə susdu və bu zaman gözlərinin küncündəki, alnındakı incə cizgilər mənə həddindən artıq dərin

və qaranlıq göründü. Mənə elə gəldi ki, bu cizgilərin altında mənim yaxşı anlaya bilmədiyim ağır, lal bir əzab gizlənmişdir. Elə bil ki, bu cizgilərin dərinliyindən mənə yüzlərcə müztərib göz baxırdı.

Mən mümkün qədər mülayim səslə:

– Adil, – dedim, – axı, sən gərək bu cür briqadaların yaranmasına, onların arasındakı dostluğun möhkəmlənməsinə kömək eləyəsən. Axı, biz dörd yoldaş adımızı yazıb o körpünün bünövrəsinə qoymuşuq.

Axırıncı sözləri deyərkən, buldozerçinin siması bütün aydınlığı ilə gözlərimin qarşısında canlandı. Mən anlaşılmaz bir qorxu hiss edərək tələsik soruşdum:

– Nə deyirsən, Adil?

– Yaxşı, Səriyyə, qoy sən deyən olsun.

– Tək mən deyən nə üçün? Bu, bütün briqadanın arzusudur.

– Etiraz eləmirəm.

– Çox sağ ol, Adil, – deyib sevinclə onun əlindən tutdum.

O, üzümə ani bir nəzər salıb, əlini üsulluca geri çəkdi. Mən onun bu hərəkətindən incimədim. Elə bil ki, bu cür ifadə ilə baxan adama birinci dəfə rast gəlirdim. Elə bil ki, o, nə isə, böyük bir sirri məndən gizləyirdi. Kabinet birdən-birə mənə qaranlıq və cansıxıcı gəldi.

– Yayın günündə bu pərdələr nəyə lazımdır, Adil?

– Toz-zad olur, – deyə o, pəncərəyə baxmadan cavab verdi.

Mən qalxdım:

– Gedim bazara, bir az ayın-oyun alım. Sən yəqin ki, iş qurtaranda gedəcəksən...

– Sən tez getmək istəyirsən?

– Yox, nə üçün? Birlikdə gedərik...

– Yaxşı, get, nə alırsan al, gəl.

Mən kabinetdən çıxanda katibə ayağa qalxaraq gülümsəyib, məni gözləmə otağının qapısına qədər müşayiət etdi. Mən qəsdən özümü dartaraq təşəxxüslə:

– Xudahafiz, – deyib ondan aralandım və pilləkəni düşərkən öz hərəkətimə özüm də güldüm.

Bazarda əvvəlcə böyük bir zənbil alıb içini göy-göyərti, meyvə və tər xiyarla doldurdum. İri qırmızı pomidor və kabablıq qoyun əti aldım. Sonra kitab mağazasına gedib, mərkəzi və respublika jurnallarının son nömrələrini götürdüm. Bazarlığım çox xoşuma gəldi. Aldığım şeylərin hamısı təzə və təravətli idi. Hamısında, nə isə, könülaçan bir şey vardı.

Geri qayıtdığım zaman qapıları taybatay açıq balaca bir dükanda birisi cavan, digəri nisbətən yaşlı iki manikürçünün müştəri gözlədiyini görüb içəri girdim.

Cavan qadın dırnaqlarını açıq çəhrayı rəngdə manikür edir, yaşlı isə, ordan-burdan danışırdı. İkisi də bir-birinə oxşayırdı. Məlum oldu ki, ana-baladırlar. Qışı Bakıda yaşayır, yayı isə, buraya gəlirlər. Anasının qırx iki-qırx üç, qızın isə, iyirmi dörd yaşı olardı. İkisi də yaraşıqlı və xoşrəftar idi. Manikürçü qadın saçlarını tünd-qəhvəyi boyadaraq, buruq-buruq eləyib arxasına atmışdı. Danışdıqca tez-tez gülümsəyir və bu zaman yanlardakı qızıl dişləri görünürdü. Qızı isə, nazik, incəbel bir gəlin idi, mənim kimi, alçaqdaban tufli geymişdi.

Mənim də Bakıdan gəldiyimi və yol rəisi Adilin arvadı olduğumu bilib çox sevindilər. Manikürçü qadın dedi:

– Bütün şəhər sizin ərinizdən danışır...

– Nəyindən?

– Deyirlər çox ağıllı oğlandır. Yuxarılarda bir sözü iki deyil.

Sonra gülümsəyərək əlavə etdi:

– Özü də çox gözəldir. Siz xoşbəxtsiniz.

Manikürçü qadın axırıncı sözü elə səmimi dedi ki, elə bil, özü dünyanın ən dərdsiz-qəmsiz və xoşbəxt adamı idi.

Qızı isə:

– Maşını da özü sürür, başqa naçalniklər kimi şofer saxlamır, – dedi.

Manikürümü qurtarandan sonra məni çaya dəvət elədilər. Bərk susadığımdan, məmnuniyyətlə razı oldum. Dükanın arxasında balaca, işıqlı bir otaqda olurdular. Otağın pəncərə və arxa qapısı birbaş həyətə açılırdı. Bayırda pəncərənin qabağında çoxlu qərənfil, ətirşah və zanbaq əkilmişdi. Ev-eşik, qapı-baca çiçək kimi tərtəmiz və sərin idi.

Məni şəkərçörəyi və təzə gilənar mürəbbəsi ilə çaya qonaq elədilər. Sonra biz yeni kino-filmlərdən, musiqi əsərlərindən söhbət elədik.

... Mən, əlimdə böyük, dolu zənbil, kefi kök halda təkrar Adilin kabinetinə daxil oldum.

– Nə çox bazarlıq eləmisən, – deyə o, gülümsədi.

– Yarısını körpüsalanlar üçün almışam.

– Özləri tapşırmışdı?

– Yox.

O, üzünü yana çevirib:

– Bəs, bu vaxta qədər elə bazarda idin? – deyə tutulmuş halda soruşdu.

– Manikürçügildəydim...

– Hansı manikürçügildə?

– Bu küçənin aşağısındakı manikürçülər yoxdurmu?

– Sən onları haradan tanıyırsan?

– Dırnaqlarımı düzəltdirəndə tanış olduq. Məni evlərinə dəvət etdilər.

– Axı, bilmədiyin-tanımadığın evə nə üçün gedirsən?

– Adamlar anadan tanış olmurlar ki, Adil?

– Sən nə vaxtacan mənə bu cür cavablar verəcəksən?

– Bilmirəm!

– Bilməyin lazımdır.

Mən ona diqqətlə baxaraq:

– Amma, – dedim, – manikürçülər səni tərifləyirdilər.

– Mənim elələrinin tərifinə ehtiyacım yoxdur.

– Bəs kiminkilərinə ehtiyacın var?

Adil gözlərini üzümə dikərək bir neçə saniyə susdu. "Yəqin ki, məni vurmaq istəyir" deyə düşündüm. Əlbəttə, o belə şey eləməzdi. Lakin mən onun nəzərləri altında özümü narahat hiss edirdim. Elə bil ki, bu baxışlar ağır bir yük olub məni sıxırdı.

– Saat altıya işləyir, getmək istəmirsən? – deyə mən səbrsiz halda qalxdım.

– Gedək.

O, zənbildən yapışmaq istədikdə:

– Yox, Adil, özüm götürərəm, – deyib ağır zənbili qaldıraraq, qapıdan çıxdım.

Zənbili maşının dal tərəfinə qoyub özüm sükanın arxasına keçdim.

– Burada niyə oturursan?

– Mən sürəcəyəm.

– Lazım deyil, o yana keç.

– Yox, Adil, bu dəfə mən sürəcəyəm.

O keçib mənim yanımda əyləşdi.

Mən, maşının sürətini artırıb rayon mərkəzindən çıxdım.

"Nə üçün bizim duyğularımız getdikcə bir-birindən bu cür uzaqlaşır? Nə üçün, o, mənim isinişdiyim, dost və yoldaş hesab elədiyim adamlara bu qədər yaddır? Bəlkə mən heç işləməyəydim? Lakin bu necə ola bilərdi? Mən özümü vətəndaşlıq hüququndan necə məhrum eləyə bilərdim?

Yox, Adil, bu mümkün deyil! Mən bunu bacarmaram. Mən özümü sənin və körpüsalanların gördüyü işdən təcrid eləyə bilmərəm. Bəlkə sən özün bir yol tapasan? Nə üçün sən heç öz hərəkətlərin barədə düşünmürsən? Axı, sən ağıllı, işgüzar oğlansan... Nə üçün sən mənim kölgədə sürünməyimi istəyirsən? Mən sürünməyə nifrət edirəm."

Mən uçmaq... hey uçmaq istəyirdim. Mən meşəli dağların, sıldırım qayaların, dibi görünməyən dərin dərələrin yanından qıjıltı ilə vurub keçdikcə, daha iti sürətlə uçmaq istəyirdim. Mən sürəti artırdıqca, tez-tez görünüb qeyb olan mavi üfüqlər də uzaqlaşırdı. Mən meteor, fövqəladə bir raket kimi yüz min kilometrləri bir anda qət etmək istəyirdim. Mən ərimin varlığını büsbütün unutmuşdum. Mən hər şeyin necə amansız bir sürətlə arxada qalmasından aldığım zövqdən başqa heç nə duyub-dərk etmirdim.

Mən pəncərə şüşəsi kimi çərçivəyə salınmış "əqlisəlimin" pedant soyuqluğuna nifrət edirdim! Əsrləri bir anda vurub-keçən dahilərə eşq olsun! Əgər, biz koramal kimi yerlərdə sürünəcəkdiksə, manikürçü qadın demişkən, bəs, bu dünya kimin üçünmüş? Əgər, biz fərsiz, məhdud arzuların əsiri olacaqdıqsa, bəs, bu əzəmətli dağlar, bu uçurumlu yollar nə üçünmüş? Bütün məxluqatın əşrəfi olan insanın ləyaqətinin mənası nədən ibarət imiş?.. Mən, insan əli, insan dühası ilə düzəldilmiş maşının gedib aya çatdığını eşitdiyim gecə uzun zaman yata bilmədim. Mən uçmaq, uçmaq istəyirdim.

– Yavaş, nə edirsən? – deyə o, qolumdan yapışdı, – sürəti azalt, görmürsən, yol xarabdır?

– Qorxma, heç nə olmaz.

– Yox, azalt!

– Yaxşı, Adil, bu dəfə sən deyən olsun, – deyə zarafatyana cavab verib sürəti azaltdım.

– Necə yəni "bu dəfə"?

– Yoxsa, həmişə sən deyən olmağını istəyirsən? – mən eyni zarafatla yanakı ona baxdım.

Adil də mənə baxdı. Biz qadınlar xarici görünüşümüzün kişilərə nə cür təsir bağışladığını dərhal duyuruq. Bu anda mənim ona çox cazibədar göründüyümə şübhə yox idi və bunu hiss etmək mənə zövq verirdi. Elə bil ki, mən bununla ondan nəyin isə qisasını alırdım.

Yolun alt tərəfi hər yerdə uçurum idi. Əgər, maşın aşsa, tikəmiz də tapılmazdı. Ona görə, xüsusi döngələrdə çox ehtiyatlı olmaq lazım gəlirdi.

Buna baxmayaraq, sürəti artırmaq həvəsi ilə yanırdım. Mən, hətta, tez-tez siqnal verməyi belə unutmuşdum. Ona görə də, çətin döngələrin birində qəflətən qabağımıza çıxan yük maşını ilə az qala toqquşmuşduq.

Lakin mən özümü itirməyərək, maşını dərhal sağa burub, saxladım. Qabaq təkərlər lap uçurumun üstündə dayanmışdı. Vəziyyət o qədər qorxulu olmuşdu ki, yük maşınının şoferi də maşını saxlayaraq, kabinədən başını çıxarıb acıqlı-acıqlı mənə baxırdı. Mən gülümsəyərək "QAZ-69"u yavaşca geri verdim və bu zaman buldozerçini ilk dəfə gördüyüm anı xatırladım...

Adilin rəngi azca qaçmışdısa da, özü heç bir şey olmamış kimi sakit oturmuşdu.

– Bağışla, Adil, – dedim, – bir də belə iş görmərəm.

O mənə cavab verməyərək, eyni soyuqqanlılıqla üzünü yana çevirdi. Onun bu hərəkəti ilə mənim maşını qanadlandırmaq həvəsim də sönüb getdi. Mən həyatda hər bir coşğun qəzəb və ehtirasın axırda necə cansıxıcı bir adiliklə nəticələnə bildiyini acı-acı düşünərək maşının sürətini lap azaltdım. Bəlkə Adilə necə xoş gəlirsə elə yaşamaq lazımdır? Axı, deyirlər, keçmiş analarımız belə edirmişlər... Aramızda baş qaldıran bu örtülü çəkişməyə bu cür son qoymaq olmazmı? Bəlkə mən Adili heç istəmirəm?! İndi onunla yanaşı oturduğumuz bir zamanda bu fikrin ağlıma gəlməsi mənə dözülməz dərəcədə ləyaqətsiz göründü. Mən özümü onun qarşısında ikiüzlü bir miskin kimi hiss elədim. Mənim əqidəmcə, dünyada ən böyük alçaqlıq namərdlikdir. Sənin bir yastığa baş qoyduğun adamdan heç nə gizlətməyə haqqın yoxdur! Ona görə də, mən tezliklə öz hisslərimi aydınlaşdırmalıyam.

Mən heç kəsin qarşısında ikiüzlülük eləməmişəm. Bundan sonra da etməyəcəyəm. İndi bizim zəmanəmizdə "ər-arvad" sözləri çox zaman "həyat yoldaşı" ifadəsi ilə əvəz olunur. "Yoldaş yoldaşa tən gərək, tən olmasa gen gərək!" Çox gözəl deyilmişdir! Ataların hər sözü qızıla bərabərdir.

...Buldozerçinin dəyişilməyib yerində qalmasını briqada arasındakı birliyin ilk qələbəsi kimi qiymətləndirərək, işə daha qızğın girişdiyimizdən, körpü sürətlə qurulmaqda idi. Yolun körpü üzrə mühəndisi üç-dörd dəfə gəlib işimizi diqqətlə yoxlayaraq, çox razı qalmışdı. Lakin Adil özü səhərdən axşamacan iş sahəsini gəzdiyi

halda, son zamanlar bir dəfə də olsun, nə bizim körpünün üstünə gəlmiş, nə də o barədə bir söz soruşmuşdu. O, körpüyə sarı heç baxmırdı da. Elə bil ki, bizim Zoğallı körpü onun ögey oğlu idi, bu, əlbəttə, mənim xətrimə dəyirdi. Elə bil ki, o körpüyə deyil, mənim doğma balama biganəlik göstərirdi. Onun briqada üzvlərinə bu soyuq, məğrur münasibəti məni yoldaşlarımın yanında utandırırdı. Onlar bunu hiss etdikləri üçün Adil barəsində mənimlə bir kəlmə də danışmırdılar... Lakin mən istəyirdim ki, onlar bu barədə danışsınlar! Rəisin yad münasibətini pisləsinlər! Mən bunu şiddətlə arzulayırdım. Mən öz qəzəbimi ifadə üçün bir vasitə, bir münasibət axtarırdım.

Hamısından da çox mənə Adilin məhz buldozerçini ayrı yerə dəyişmək istəməsi qəribə görünürdü... Özü etiraf etməsə də, mən onda bu oğlana qarşı, nə isə, bir kin hiss edirdim. Lakin mən o zaman buldozerçinin nədə təqsirkar olduğunu bilmirdim. Sonralar da onda heç bir günah yox idi. Mən bu barədə onun əvəzindən indi də and içə bilərəm. Lakin hələ o zamanlar, yəni, arada hələ heç nə yox ikən, Adilin buldozerçini görmək istəməməsi məndə ona qarşı xoşagəlməyən bir duyğunun getdikcə güclənməsinə səbəb olurdu. Mən haqlı-haqsız onun qarasına əsəbiləşir, onu acılamaq istəyirdim. Onun buldozerçini dəyişmək təşəbbüsü isə, bu duyğunu daha da tündləşdirdi, buldozerçi ilə mənim aramda tamamilə yeni və lal bir münasibətin yaranmasına sanki təkan verdi. Çünki mən buldozerçinin nələr keçirdiyini hiss edirdim. Buldozerçi namərdlik etmirdi. Adil bunu bilməli idi! Adil mənə şillə vuraydı, danlayaydı, lakin körpüsalanların böyük səmimiyyətinə yuxarıdan aşağı baxmayaydı. Adil yalnız o zaman məni itirməzdi.

...Buldozerçinin dəyişilməyib yerində qalması xəbəri körpüsalanların böyük sevincinə səbəb olmuşdu. Onlar bunu məndən gizlətmirdilər, lakin buldozerçi özü əvvəlkinə nisbətən daha qaşqabaqlı olmuşdu. Onun öz baxışlarını mənim nəzərlərimdən yayındırmağa indi daha çox cəhd etdiyini hiss edirdim. İş zamanı ikimiz də tək qalanda o bir bəhanə ilə məndən uzaqlaşırdı. Mən də onu daha əvvəlki kimi cürbəcür zarafatlarla sancmırdım...

Tennis oynayanda onun məni aparmasından əvvəlki kimi yanıb-yaxılmırdım. Mən öz baxışlarımla, gülüşümlə, ona, nə isə, mehriban sözlər deyirdim. Mən onun soyuq və hətta, acıqlı rəftarından qəzəb deyil, fərəh duyurdum. Mən onun üst köynəklərini və dəsmallarını

zorla alıb özümüzünkülərlə bərabər yuyub ütülədiyim zaman özümü fövqəladə dərəcədə səmimi, ləyaqətli bir insan kimi hiss edirdim.

Biz artıq körpünün dəmir-beton tağını düzəltməkdəydik. Bizim "körpəmiz" keçmiş nağıllardakı qəhrəmanların uşaqlığı kimi görünməmiş bir sürətlə böyüməkdəydi.

Dağ günəşi qollarımızı, üzümüzü yandırıb qaraltmışdı. Buldozerçi isə, sarıbəniz olduğundan, boyun-boğazı mis kimi qızarmışdı.

Oğlanların əynində mayka, mənim əynimdə isə yüngül, qolsuz don olurdu. İndi daha tənəffüsdə çadırlarımıza getmir, dördümüz də körpüdən bir azca yuxarıda, böyük palıdın kölgəsində oturub qəlyanaltı eləyirdik. Yemək hazırlamaq üçün baş aşpaz mən, müavinim isə Kərəmxan idi. Bəzən oğlanların vurduqları quşları qızardırdıq. Bəzən mən onlar üçün ət qutabı bişirirdim ki, bunu hamısından artıq xoşlayırdılar. Axı, qutab ən çox Bakıda dəbdir. Bu yerlərdə, demək olar ki, heç bişirmirlər. Mən qutabları bişirib sumaq vura-vura üst-üstə yığdıqca, Kərəmxanın necə ləzzətlə baxdığını görüb qəhqəhə ilə gülür, sonra bir-ikisini büküb ona verirdim:

– Al bir dadına bax, gör yaxşı bişibmi?

O, qutabları ötürdükcə başını tərpədərək:

– Sağ ol, vallah, Səriyyə bacı, – deyirdi, – ömrümdə belə dadlı şey yeməmişəm.

Mən də öz sənətimdən dərin bir zövq duyaraq:

– Hələ bu gün sən deyən yaxşı deyil, – deyirdim, – gör gələn dəfə necə bişirəcəyəm!

Biz qəlyanaltı etdikdən sonra mən çadıra qaçıb öz bişmişimizə baş çəkir, yuyunub saçlarımı düzəldir və təkrar işin üstünə qayıdırdım. Tənəffüsdən sonra dördümüz də özümüzü daha şən və daha gümrah hiss edirdik. Etiraf edim ki, mən bu tənəffüs saatlarını həmişə böyük həvəslə gözləyirdim. Həmin saatlarda duyduğum istirahəti, xoşhallığı heç nə ilə dəyişməzdim. Tənəffüsdə biz istədiyimiz qədər zarafatlaşırdıq. Tənəffüsdə mən öz baxışlarımla buldozerçiyə daha səmimi sözlər deyirdim, o isə, bunları eşitmək istəmirdi. O öz biganəliyi ilə məni ürkütmək istəyirdi, lakin buna müvəffəq ola bilmirdi. Əgər, o zaman biri məndən soruşsaydı ki, bu nə oyundur sizin aranızda başlayıb, nə ilə nəticələnəcək, cavab verə bilməzdim. Bu oyunun böyük bir təbəddülatın başlanğıcı olduğunu ağlıma gətirməzdim.

Sən demə, buldozerçi gələcəyi məndən aydın görürmüş...

... Bir gün tənəffüsdə Soltan:

– Uşaqlar, – dedi, – briqadanın işindən narazılıq etmək olmaz. Körpəyə pis baxmırıq, ancaq briqada mənəvi aləmlə məşğul olmur...

Kərəmxan onun sözünü kəsdi:

– Bəs, körpü salmaq özü, bəyəm, mənəvi aləm deyil?

– Zarafatı burax, əməlli söz deyirəm.

– Elə isə danış, – deyib Kərəmxan mənə göz vurdu.

Buldozerçi onun bu hərəkətini görüb qızardı və bu mənə hədsiz dərəcədə xoş gəldi.

– Bizdə, ancaq bircə buldozerçi qiyabi institutda oxuyur. (Mən Qəribcana həmişə buldozerçi deyə xitab elədiyim üçün onlar da çox vaxt zarafatyana məni təqlid edirdilər.) Bəs biz? Təklif var ki, bu il biz də instituta ərizə verək.

Kərəmxan:

– Siz ölmüyəsiz, – dedi, – institut adı çəkiləndə, o imtahan gəlir dağ kimi durur gözümün qabağında...

Soltan onun sözünü ağzında qoydu:

– İş stajı düşür. Qaldı imtahan, ona da hazırlaşarıq. Bəs, bu buldozerçi nə cür daxil olub? Səriyyə, sən necə, qiyabi oxumaq istəyirsənmi?

– Necə ola bilər ki, briqada istəsin, mən yox? Buldozerçi riyaziyyatdan bizə kömək eləsə, hazırlaşa bilərik.

– Riyaziyyat... Riyaziyyat, – Kərəmxan yana-yana təkrar elədi, – bir də ədəbiyyatdan yazılı imtahan...

– Ədəbiyyatdan qorxma. O barədə mən hazırlaşmağımıza kömək eləyə bilərəm, – dedim.

Soltan:

– Yaxşı da... tay nə istəyirsiniz? Riyaziyyatdan buldozerçi, ədəbiyyatdan da Səriyyə. Qaldı tarix...

– Onda da müəllimimiz sən. Axı, bizim bu Soltan yaman tarixçidir. Napoleonun davalarını soruş, sənə əzbər desin. Deməli, siz üçünüz müəllim, mən də şagird, bax, yaxşı öyrədin ha... Siz ölmüyəsiniz, imtahanda kəsilsəm, biabır olarsınız.

Soltan:

– İndidən kəsilmək barədə danışma, – dedi, – imtahan verəcəyik, vəssalam!

Mən:

– Buldozerçi dinmir, – dedim, – bəlkə heç o bizə kömək eləmək fikrində deyil?

Kərəmxan:

– Briqada tələb eləyəndən sonra necə öyrətməz? Ə, buldozerçi, bir dinsənə! Başa düşmürəm, Səriyyə bacı bura gələndə niyə ağzına su alıb durursan?

Buldozerçi sanki diksinərək, tələsik əvvəl mənə, sonra da Soltana baxdı və birdən qıpqırmızı qızararaq, Kərəmxana acıqlandı.

– Yekə oğlansan, hər zarafatın yeri var.

Mən qəhqəhə ilə gülərək:

– Tənqiddən incimək lazım deyil, yoldaş buldozerçi.

Soltan:

– Təklif var, – Səriyyə sinif rəhbəri olsun, etiraz yoxdur ki?

– Yox! – deyə Kərəmxan bərkdən səsləndi.

Soltan:

– Hər gün işdən sonra altı ilə yeddi arasında bir saat məşğələ keçirilsin. Etiraz yoxdur ki?

– Yoxdur! – Kərəmxanla mən orta məktəb şagirdləri kimi birdən cavab verdik.

– Məşğələ cədvəlini tutmaq Soltana tapşırılsın, etiraz yoxdur ki?

Kərəmxanla mən bu dəfə daha bərkdən:

– Yoxdur! – dedik.

– Bir sual olar? – Kərəmxan şəhadət barmağını yuxarı qaldırdı.

– Olar!

– Bəs dərs kitablarını tapmaq kimə tapşırılır?

– Sinifkoma! – deyə mən, əlimi döşümə qoydum.

Soltan əsl başçı kimi mənə müraciət edib:

– Kitab-dəftərimiz üçün nə qədər pul lazım olsa, ümumi fondumuzdan götürərsən, – dedi.

– Bir şey deyil, mən öz maaşımdan alaram.

– Yox, – Soltan eyni ciddiyyətlə etiraz elədi, – ümumi fonddan!

– Oldu! – deyə mən gülümsəyərək, əsgər kimi əlimi yuxarı qaldırdım, – sabah istirahət günüdür. Gedib nə lazımsa, alıb gətirərəm.

– Əsas onuncu sinifin kitablarıdır.

– Yeddinci-səkkizinci siniflərin riyaziyyat kitabları da lazımdır, – deyə Kərəmxan qayğı ilə cavab verdi, – gərək başdan təkrar eləyək.

Soltan:

– Yaxşı, heç demirsiniz, kim hansı instituta girmək xəyalındadır?

Araya uzun bir sükut çökdü.

Nəhayət mən:

– Gərək ki, – dedim, – buldozerçi institutun mexanika şöbəsində oxuyur.

– Elədir. İnstitutun tikinti fakültəsində yol-körpü şöbəsi də var.

– Mən oranın həvəsindəyəm. Ancaq...

Kərəmxan məzəli bir əda ilə boynunun ardını qaşıdı.

Soltan qətiyyətlə:

– Mən yol-körpü şöbəsinə girəcəyəm, – dedi.

Mən qaşlarımı yuxarı dartaraq:

– Qaldı yoldaş Səriyyə... – deyə sözü xeyli uzatdım, – vaxta ki, briqada üzvlərinin hamısı gələcəkdə də körpülər salmaq fikrindədir...

– Yox, – Soltan sözümü kəsdi, – hər kəsin öz həvəsi ilədir...

– Şübhəsiz. Mənim də həvəsim yol-körpü şöbəsidir.

Soltan:

– Bununla da məsələ qurtarır.

– İndi isə, xahiş edirəm, balaca bir konsertə qulaq asasınız.

Sonra o, oynaq bir hava üstündə, eynən estrada artisti kimi komik hərəkətlərlə oxumağa başladı:

Biz dağları yarırıq,
Dəmir körpü salırıq,
İnstituta baş vurub,
Dörd nədir, beş alarıq.
Ancaq bizim Qəribcan
Yaman dinməz olubdur.
Bilmirik nə dərdi var,
Nəyə peşman olubdur?
Bəzən xəyala dalır,
Bəzən ulduza baxır.
Yoxsa ki, bu binəva
Dönüb şair olubdur?!

Soltan gülümsəyərək əvvəlcə yerə, sonra da uçurumdan o yanda görünən dağlara baxdı. Buldozerçi məzəmmət dolu gözlərini Kərəmxana zilləmişdi. Kərəmxan isə, ona fikir vermədən təkrar edirdi:

Yoxsa ki, bu binəva
Dönüb şair olubdur?!

Mən bir an tutuldum, sonra dərhal özümü ələ alıb, bərkdən güldüm:

– Şair sən özün olmusan ki.

Dərhal raketka götürüb:

– Yoldaş buldozerçi, gəl görək, – deyə torun arxasına keçdim. Oğlan da mənə baxmadan, dinməz-söyləməz, oyuna başladı. Şarı sərrast vurmasına, özünü sakit aparmasına baxmayaraq, mən onun kefi olmadığını hiss edirdim.

## ADİL

O bu dəfə tennis oyunundan qəribə əhvali-ruhiyyə ilə qayıtmışdı. Elə bil, nə isə, itirmişdi, nəyi isə xatırlamağa çalışırdı... Mənim suallarıma fikri dağınıq halda cavab verir, bunun xətrimə dəyə biləcəyini, yəqin ki, düşünmürdü. Buraya gəldiyimiz gündən bəri mən birinci dəfə idi ki, aramızda soyuq, qaranlıq bir divarın yavaş-yavaş qalxdığını aydınca hiss edirdim.

Əli yanan ağzına təpər. Mən qəzəbin, acığın, gücün mənasız olduğunu anlayaraq gülür, zarafat edir, onun xoşuna gələcək sözlər danışmağa çalışırdım. Mən qapıda stolun dalında oturmuşdum. O da yanımda dayanıb sağ əlinin qeyri-iradi, yavaş hərəkəti ilə saçını darayır və uçurum üzərində hərlənən ağ qartala baxırdı.

Mən:

– Səriyyə, – dedim, – yolu çəkib qurtarandan sonra bir aylıq məzuniyyət götürüb gedərik səyahətə... Eləmi?

O, gözlərini qartaldan çəkməyərək, könülsüz halda başını tərpətdi.

– Bir pud ağırlığında başını tərpədincə, altı misqal dilini tərpətsənə... – deyə mən zarafat elədim.

Lakin o, cavab vermədi. O zaman mən onun əlindən tutub çəkərək yanımdakı kətildə oturdum:

– Niyə bikefsən, nə olub?

O, mənə diqqətli bir nəzər salaraq, əlini geri çəkdi:

– Mənə nə olduğunu bilmirəm, Adil, biləndə sənə deyəcəyəm.

Bu, çox qəribə cavab idi. Lakin mən daha heç nə soruşmadım. Ürəyimin necə sıxıldığını ona hiss etdirmədim. Bunun mənası yox idi.

Dişim bağırsağımı kəsirdi. Bununla belə, mən onu indiki qədər istəməmişdim. Həm də, mən onu tikə-tikə doğramağa hazır idim. Mən onun Madonna Sinkstinskayanın üzünə bənzəyən üzünün, dodaqlarının xəncərlə parça-parça olunmasını istərdim. Mən bu dərəcədə vəhşiləşdiyim anda onun bu dərəcədə gənc və gözəl göründüyünə yana-yana baxırdım. İndiyə qədər bu gözlər, bu nazik və elastik bel, əzələli, çiyninə qədər çılpaq olan bu qollar yalnız və yalnız mənə məxsus idi. Mənimki idi. İndisə, mən bu hüququn sarsıldığını duyurdum. Lakin, bununla bərabər, heç bir fənalıq etmək iqtidarında deyildim. Mən özümü çox yorğun hiss eləyərək, çadıra girib çarpayıma uzandım. Nə qədər yatdığımı bilmirəm. Birdən elə bil ki, yuxuda mənə "dur!" dedilər. Gözlərimi açıb, onu çarpayısının üstündə büzüşüb oturaraq, bayıra baxan gördüm. Mən oyandığımı hiss etdirməyərək, onun nəyə baxdığını bilmək üçün gözlərimi bayıra zillədim və körpüsalanların çadırı tərəfdə nöqtə boyda bir işığın qaranlıqda közərdiyini gördüm. Bu odlu nöqtə tez-tez havada yarımdairə cızıb dayanırdı. Yəqin kim isə papiros çəkirdi...

Lakin burda qəribə nə var idi? Onun gözləri nədən bu odlu nöqtəyə bənd olub qalmışdı?

O niyə yatmamışdı?

Birdən sanki qanım damarlarımda dondu və mən dəhşətlə xatırladım ki, körpüsalanlardan yalnız bir nəfər papiros çəkir... Yalnız bir nəfər... Buldozerçi!

Biz institutda oxuyanda Şekspiri təqsirləndirib deyirdik ki, nə üçün Otello bir dəfə də olsun, dəsmalı haradan aldığını Kassiodan soruşmurdu... Lakin burada Kassiodan heç bir şey soruşmağa lüzum yox idi...

Nəhayət, odlu nöqtə havada daha böyük bir yarımdairə cızaraq qeyb oldu. Səriyyə daha bir müddət qaranlığa tamaşa etdi. Dərindən nəfəs alıb, arxası üstə yastığa uzandı və bir dəfə də olsun mənim çarpayıma sarı baxmadı.

Çadırımızın yanından axan su həmişəki incə ahəngi ilə şırıldayırdı. Qapıdan görünən göy parçasında ulduzlar sevinclə sayrışırdı. İlıq bahar havası çiçəklərin ətri ilə dolu idi. Təbiət həmişəki kimi gözəl və dərdsiz, qəmsiz idi. Mən isə, bu qaranlıq çadırda əzab çəkirdim.

Cəhənnəm əzabı! Bir vaxt mən gəncliyimdən, namus və ləyaqətlə yerinə yetirdiyim işimdən gizli bir fərəh duyurdum. İndisə, bunlar hamısı bir heç olmuşdu. Bir an mənə elə gəldi ki, həyat saysız-hesabsız

aldanışlardan ibarət olub, uşaq oyuncağı kimi bir şeydir. Lakin yox! Madam ki, mənim içərimdə bu cəhənnəm zəbanə çəkir, demək, həyat yalnız aldanışlardan ibarət deyil. Demək, duyan, düşünən cəmi məxluqatın əşrəfi olan insanın əzəmətli bir taleyi olduğu həqiqətdir. Mən onun necə aramla nəfəs aldığını eşidir, lakin nələr düşündüyünü bilmirdim: Birdən körpüsalanların çadırı tərəfdə kiçik alov görünüb yox oldu. Sonra yenə nöqtə boyda işıq közərdi. Səriyyə təkrar qalxıb yerində oturdu. Mən onun bayıra zillənən gözlərinin qaranlıqda necə parıldadığını görürdüm.

Yenə də yadıma Otellonun dəsmal əhvalatı düşdü. Yox, hər halda, Otello dəsmalı haradan aldığını Kassiodan soruşmalı idi. Ədalət bunu tələb edirdi.

Mən özümü indi oyanmış kimi göstərərək yerimdə qurcalandım. Sonra çarpayımdan qalxıb yuxulu səslə soruşdum:

– Sən hələ yatmamısan?

– Yox.

– Nə üçün?

– Elə-belə, yuxum qaçıb.

– Uzan, beş yüzəcən say, yuxun gələr.

Sonra tələsmədən pijamamı geyinib bayıra çıxdım və çadırdan bir qədər aralanandan sonra ağaclığa girib səssiz addımlarla meşə yuxarı qalxmağa başladım. Madam ki, Səriyyə və mən çadırda uzanmış olduğumuz halda o odlu nöqtəni görürük, deməli papiros çəkən adam körpüsalanların çadırı yanındakı qayalı təpənin döşündə oturmuşdur və ya dayanmışdır.

Mən tez-tez havada yarımdairə cızan odlu nöqtəni nəzərdən qaçırmamağa çalışaraq, ehtiyatla, kiçik bir şaqqıltı belə salmadan irəliləyirdim. Çox həyəcanlı olduğumdan, tez-tez ayaq saxlayıb nəfəsimi dərirdim. Nəhayət, üstünü kol-kos basmış qayanın yanına çatıb dayandım. Çünki artıq burada, papirosun közərən zəif işığında buldozerçinin üzünü tanıya bildim... O, balaca daşın üstündə oturub, dalbadal papiros çəkirdi.

Bu da sənə Kassionun cavabı.

Mən dönüb bizim çadıra tərəf baxdım. İçərisi qətiyyən görünmürdü. “Bəlkə bu kişi də, Səriyyə kimi bədxah olub, yata bilmədiyi üçün çıxıb burada oturmuşdur... Bəlkə mən də yazıq ərəb kimi aldanıram... Bəs, Səriyyə? Bu qaranlıqda közərən papiros odu nə üçün onun

yerinə qor doldurub? Axı, mən bunu öz gözlərimlə gördüm. Bunu başa düşməmək üçün mən nə qədər axmaq bir sadədil olmalıyam...”

Mən dönüb yenə də buldozerçiyə baxdım. O mənim üçün əlverişli yerdə oturmuşdu. Otuz-qırx metr də qalxaraq, yuxarıdakı qayalardan birini tərpədib ona tərəf yumalatmaq kifayətdir. Sonra da arxayınca hərlənib çadıra gedərəm, dinməz-söyləməz çarpayıya uzanaram. Əgər, Səriyyə soruşsa ki, “o nə gurultudur” mən tamam biganə ifadə ilə deyirəm ki, “görəsən, yenə yuxarıdan heyvandan-zaddan keçib, nədir... yıxıl yat...”

Bununla da, hər şey qurtarar. Məni təqsirləndirmək kimin ağlına gələr? Sonra?! Sonra nə olsun? Uçub tar-mar olmuş bir sarayın xarabaları mənim nəyimə lazımdır? Mən lap uşaqlıqdan bayquşa nifrət edirəm.

“Mənə nə olduğunu bilmirəm, Adil! Biləndə sənə deyəcəyəm” – gündüz o belə dedi və mən onun doğru danışdığına zərrəcə şübhə eləmirdim. Görünür, böhran təzə-təzə başlayır. Nə etmək lazımdır?! Bunun qarşısını necə almaq olar?

Nəhayət, buldozerçi papirosu tulladı, qalxıb öz çadırlarına tərəf getdi. Mən də ağır addımlarla geri qayıtdım. Səriyyə nazik adyalı üstünə çəkərək üzünü o biri tərəfə çevirmişdi. Mən içəri girəndə nə tərpəndi, nə də bir söz dedi. Mən də heç nə demədim. Səssiz-səmirsiz yatağa uzandım və səhərə qədər yatmadım.

Səhər çaydan sonra o:

– Adil, – dedi, – biz qərara almışıq ki, bu il institutun qiyabi şöbəsinə imtahan verək.

– Siz, yəni kimlər?

– Biz, yəni mən, Soltan, bir də Kərəmxan.

– Bəs, buldozerçi?

– O, institut tələbəsidir, qiyabi oxuyur – deyə soyuq bir ifadə ilə cavab verdi.

Və sonra birdən başını qaldırıb, gözlərimin içinə şax baxaraq əlavə etdi:

– Gərək ki, bir dəfə mən bunu sənə demişdim.

– Bağışla, yəqin unutmuşam. Ancaq sən qiyabi instituta nə üçün girirsən? Şəhərə qayıdanda əməlli-başlı oxuyarsan.

– Yox, Adil, mən qiyabi oxumaq istəyirəm.

– Niyə axı?

– Ona görə ki, biz briqadada bu cür qərara almışıq. Biz həm oxu-yacağıq, həm də işləyəcəyik.

Mən acığımı güclə saxlayaraq:

– Əşi, – dedim, – briqadanın dediyi qanun-zad deyil ki...

– Mənim üçün qanundur. Biz uzun illər bir yerdə işləyəcəyik.

– Demək, sən gələcəkdə də onlarla birlikdə işləmək fikrindəsən.

– Əlbəttə!

– Bəlkə, bu yolu çəkib qurtarandan sonra mən yenə də nazirliyə qayıtdım.

– Nə olar ki... Sən qayıdarsan, mən qalıb işlərəm.

– Bu necə ola bilər?

– Nə üçün olmur ki?

– Sən doğrudan belə düşünürsən?

– Doğrudan.

– Daha onda bu nə ər-arvadlıq oldu ki...

– Adil, yaxşı olar ki, "ər-arvad" əvəzinə ayrı bir söz işlədəsən. Bu ifadə adama birtəhər təsir eləyir.

– Bağışla, – deyə mən bir neçə saniyə susdum.

Sonra:

– Yaxşı, Səriyyə, – dedim, – tutaq ki, sabah məni təkrar şəhərə qaytardılar. Bəs, sən burada üç oğlanla necə qala bilərsən?

– İndi necə qalıram?

– İndi mənimlə qalırsan.

– Sən gedəndə də yoldaşlarım çadırlarını söküb gətirib burada, mənim qonşuluğumda qurarlar. Briqada məni tək qoymaz. Burada çətin nə var ki?

– Çətin bir şey yoxdur. Ancaq sən elə danışırsan ki, elə bil, indicə ayrı bir planetdən gəlmisən.

– Ola bilər.

– Bəlkə sən daha mənimlə yaşamaq istəmirsən?

– O barədə fikirləşməmişəm, Adil. Səndən xahiş edirəm, əgər, mümkündürsə, hələlik, bu haqda məndən heç nə soruşmayasan.

– Demək, hələlik...

– Bəli, hələlik!

– Baş üstə, soruşmaram.

– Çox sağ ol, Adil! Nahara nə bişirəcəyəm?

– Hər nə istəyirsən.

– Onda ətin bir hissəsini xörək asım, qalanını da gəlib qızardaram.

– Sən hara gedəcəksən ki?

– İki-üç saatlığa rayon mərkəzinə dəyəcəyəm. İmtahanlara hazırlaşmaq üçün lazım olan kitabları almağı briqada mənə tapşırıb.

– Madam ki, briqada tapşırıb, gərək yerinə yetirəsən.

– Ancaq sən hərdən bax, xörəyin suyu çəkilməsin.

– Narahat olma, əti bişəndən sonra götürüb qoyaram yerə. Qalan şeyini özün gəlib düzəldərsən.

– Yaxşı!

O, neft pilətəsini yandıraraq, xörək qazanını rahatlayıb üstünə qoyandan sonra cəld əl-üzünü yuyub paltarını dəyişdi. Sonra "QAZ-69"a əyləşib getdi.

Mən onun ardınca baxaraq, "briqada... briqada" deyə pıçıldadım. Şəhərdə keçirdiyimiz o sakit günlərdə mən onu bu qədər istədiyimi bilmirdim. Heç mən bu barədə düşünmürdüm də. İşdən gəlib stolun üstünü səliqə ilə düzəlmiş görərək, paltarımı dəyişir, yuyunur, sonra onunla birlikdə nahar edirdim. Nahardan sonra isə, divanda uzanıb qəzetə baxırdım. Hər şeydə bir rahatlıq, bir arxayınlıq var idi. İndisə, bütün həyatımı daim irəliyə, əbədiyyətə sövq edən məhəbbətin yaz seli kimi qopub gəldiyi bir zamanda mən onu həmişəlik itirmək qorxusu qarşısında idim. Birdən mənim ağlıma qəribə bir fikir gəldi. O, maşını bərk sürür. Ola bilər ki, yolda qəzaya uğrayıb maşınla birlikdə dərəyə yuvarlansın. Bu yolda elə qorxulu uçurumlar var ki... Onun heç tikəsi də tapılmaz. Bəlkə o zaman mən... mən onun bu həyatda olmadığını və bir zaman olmayacağını, başqası ilə deyib-gülməyəcəyini düşünüb təsəlli tapa bilərəm! Yoxsa, əgər, biz ayrılırıqsa, ikimizin də bu dünyada yaşamağımız mənim üçün dəhşət olar...

Lakin bu vəhşi arzunun zühuru yalnız bir an çəkdi. Sonra mən həmin qorxulu uçurumu öz daxilimdə hiss elədim. Məni həyatla bağlayan duyğular sanki ağır bir cismə çevrilib, içərimdə dibsiz bir boşluğa yuvarlanmaqda idi.

O dediyi kimi, düz dörd saatdan sonra qayıdıb gəldi. Kitab bağlamasını maşından çıxardıb çadırın qabağına qoyan kimi paltarını dəyişib xörəklə məşğul oldu. Kartofu doğraya-doğraya:

– Manikürçü qadının əlindən güclə qurtarmışam, – deyə gülümsədi, – buraxmırdı. Deyirdi axşamçağı gedərsən.

– Nə olardı ki, qalıb axşamçağı gələydin!

– Xörəyi bişirib getsəydim, qalardım.

“Mənim narazılığıma baxmayaraq, o yenə də manikürçülərlə görüşmüşdü və bunu məndən gizlətmədi... Bəlkə manikürçü qadın da, qızı da yaxşı adamlardır. Lakin, əgər, mən öz arvadımın onlara getməsini istəmirəmsə, deməmk, o bununla hesablaşmalı idi. İctimai həyatda olduğu kimi, ailədə də böyük-kiçik olmalıdır. “Nə üçün bu böyük məhz o yox, sən olmalısan?” deyə soruşa bilərdilər. İndi keçmiş patriarxal həyat-zad deyil ki?! Doğrudur. Amma, ona görə mən olmalıyam ki, yaşım da, savadım da, düşüncəm də onunkundan artıqdır! Aydındırmı? Heç bir ağıllı kapitan sükanı təcrübəsiz, gənc bir adamın əlinə verməz. Lakin mən nahaq yerə əsəbiləşirəm. Mənim sükandan bərk-bərk yapışmağımın artıq bir qara qəpiklik əhəmiyyəti yoxdur. Həyat öz işini görməkdədir. Məndə gənc bir qadına lazım olan cəhətlərin hamısı: sağlam gənclik, gözəllik, ağıl, namuslu əmək qabiliyyəti var idi. Mən daha nə etməli idim?! Mən istəsəydim, Səriyyədən də yaxşısı ilə evlənə bilərdim, lakin bu “yaxşı” mənim üçün ancaq ondan, onun bütün varlığından ibarət idi. Əsl məsələ də burasında idi. Əgər, mən bir çarə tapıb, bu lənətə gəlmiş hissi məhv edə bilsəydim, başqa dünyaya, şübhəsiz, yol tapardım. Əgər, mən min bir gecə qəhrəmanları kimi dəmir qapıları sındırmaq, cadugərləri parçalamaq iqtidarında olsaydım, bu tilsimdən çıxa bilərdim. Təəssüf ki, bunların heç biri mümkün deyildi. Mən, cəmi bir neçə il ömrü olacaq məlun bir hissə qalib gələ bilmirdim. Mən ona mehriban, şirin sözlər söyləməyə çalışdıqca, öz-özümə gülür, öz gücsüzlüyümə istehza edirdim. O, tamam sakit halda qaşıqla xörəkdən az-az götürüb ağzına apardıqca mən yanıb tökülürdüm... Onun hər hərəkəti cazibədar və amansız idi.

Nahardan sonra o soruşdu:

– Daha bir şey lazım deyil ki?

– Çox sağ ol, heç nə lazım deyil.

– Onda hələlik, – deyə rayon mərkəzindən gətirdiyi bağlamanı götürüb getdi.

Mən bilirdim ki, hər bir gənc adamın ictimai pilləleri qalxması müəyyən dərəcədə onun ailə həyatı ilə əlaqədardır. Bilirdim ki, minlərlə ağıllı adamları cəmiyyət gözündən salan, onu yüksəlməyə qoymayan ailədə baş verən rəzalətlər olmuşdur. Ona görə də, mümkün qədər soyuqqanlı hərəkət etmək, yüz ölçüb, bir biçmək, onun hər bir davranışını, hərəkətini dərindən təhlil edib dürüst nəticə çıxararaq, xəstə-

liyin qabağını vaxtında almaq lazım idi. Bu saat mənim üçün ən düzgün yol Səriyyədən rəsmi surətdə ayrılmaq idi. Lakin bu mümkün deyildi. Birincisi, ona görə ki, Səriyyə körpüsalanlardan ayrılıb getmək fikrində deyildi... İkincisi, ona görə ki, məndən ayrılandan sonra onun buldozerçi ilə nə münasibətdə olacağını bilmirdim. Üçüncüsü ona görə ki, sadəcə olaraq, ondan əl çəkməyə gücüm çatmırdı.

## SƏRİYYƏ

... Onun son vaxtlar mənə həddindən artıq qayğı göstərdiyini, hər cür vəziyyətdən istifadə edərək mənə xoş sözlər deməyə çalışdığını hiss edirdim... Bu isə, məni hər şeydən çox acıqlandırırdı. Çünki mən uşaqlıqdan ikiüzlülüyə, qorxaqlığa nifrət edirəm... Biz körpüsalanlar, öz kiçik briqadamızda söz qoymuşduq ki, ürəyimizdən keçənləri bir-birimizdən gizlətməyək.

Bəs, ər-arvad necə?

Mənim köhnə neft ustası olan qoca babam həmişə deyərdi ki, insan dünyaya bir dəfə gəlir. Ona görə də, həmişə namusla yaşamalıdır. Başqasının yanında alnıaçıq olmalıdır. Mən indi babamın sözlərini xatırlayıb düşünürəm ki, əgər, bu dünyada namusla yaşamaq, aldatmamaq mümkündürsə, nə üçün belə etməyəsən?! Nə üçün bir damın altında yaşadığın halda, bir-birini aldadasan? Mən aldatmaqdan bir zövq duya bilmirdim. Mən ikiüzlülüyün, yaltaqlığın necə yarandığını hiss edirdim... və bu məndə ikrah hissi doğururdu.

Mən körpüsalanlarla birlikdə ilk məşğələni keçib qayıtdığım zaman Adil soruşdu:

– Bu gün nə öyrəndiniz?

Mən düz onun gözlərinin içinə baxdım və o dərhal nəzərlərini aşağı saldı. Onun gülümsəyən üzü qızarıb pörtmüşdü.

– Hələ, elə-belə, kitablarla tanış olurduq... – deyə mən soyuq cavab verdim.

Birdən yuxarı dağlardan sərin külək əsdi. Sonra hava qaraldı, göy guruldayıb dalbadal ildırım çaxdı. Əvvəlcə tək-tək, sonra şiddətli dolu yağmağa başladı. Biz stolun üstündəki şeyləri yığışdırıb çadıra qaçdıq. Sonra qapının ağzında dayanıb tufana tamaşa etdik. Meşələr və uçurumlu dərə şaraqhaşaraqla dolmuşdu. Qoz boyda dolu dənələri daşlara,

qayalara çırpılıb elə səs çıxarırdı ki, elə bil, minlərlə pulemyotdan birdən atəş açılırdı. Yerə düşmüş dolu tez-tez çaxan ildırım işığında şüşə kimi parlayıb qeyb olurdu. Üç-dörd dəqiqədən sonra dalı yağışa döndü. Çox çəkmədi ki, sellərin qıjıltısı eşidildi. Bizim çadırımız balaca dikdirdə olduğundan, içinə su dolmurdu. Lakin o tərəf-bu tərəfindən ağ köpüklü sel sürətlə axıb uçuruma tökülürdü. Mən özümdə qəribə bir ruh yüksəkliyi hiss edirdim.

Təbiətin qüdrəti məni heyran qoyurdu. Mən tufanın gurultusunu dinləyərək bir az qabaqkı düşüncələrimi xatırlayırdım və sanki mənim açıq, qəti və aydın yol tutmağımı təbiət öz gücü ilə məndən tələb edirdi. Hər cür ikiüzlülük, yalançılıq bu qüdrət qarşısında son dərəcə kiçik və mənasız görünürdü.

Birdən haradansa lap yaxında iki-üç dəfə bərk şaqqıltı eşidildi.

– Bu sel körpünün divarlarını uçurub dağıtmasa yaxşıdır, – deyə Adil yavaş səslə dilləndi və elə bu zaman mən yarıqaranlıqda üç nəfərin üzüaşağı, körpüyə sarı qaçdığını gördüm, mən də dərhal plaşımı başıma ataraq yüyürdüm.

– Hara? – deyə Adil arxadan qışqırdı.

Mən cavab vermədim.

– Divarlar oğul kimi dayanıb! – yağışın və sellərin gurultusu içində Kərəmxanın şən səsi eşidildi.

Sel körpünün iri borularından güllə kimi çıxaraq qıjıltı ilə uçuruma tökülürdü.

Biz dördümüz də dayanıb “körpəmizə” baxırdıq.

Bizim plaşlarımızdan şırıltı ilə su axırdı. Mən borulardan çıxan selin uçuruma necə töküldüyünü yaxından görmək üçün irəli getmək istədim.

– Yaxına getməyin, – Soltan qolumdan yapışdı.

Mən yerimdə dayandım.

Selin yuxarıdan uçurub gətirdiyi qayalar gurultu qopara-qopara uçuruma yuvarlanırdı. Yağışdan nə dərənin dibi, nə də yandakı dağlar görünürdü. Biz körpü divarlarının və yenicə bərkidilmiş boruların möhkəm dayandığına əmin olandan sonra, onlar öz çadırlarına, mən də özümüzünkünə qaçdım. Adil qapının ağzında dayanıb papiros çəkirdi. Məni görən kimi üzündəki acıq dərhal mülayim bir ifadə ilə əvəz olundu və o, qəsdən gülümsəməyə çalışaraq soruşdu:

– Hə... necədir?

– Yaxşıdır... – deyə mən qısa cavab verib, böyürdən sivişərək çadıra girdim. Sonra su içində olan plaş və ayaqqabılarımı çıxardıb, saçlarımı, üzümü quruladım.

Yağış eyni şiddətlə davam edirdi. Meşənin içində körpüsalanların işığı bəzən görünür, bəzən də dörd-beş dəqiqə yox olurdu. Biz adama bir stəkan kofe ilə bir-iki şəkərçörəyi yeyəndən sonra işığı söndürərək, soyunub çarpayımıza uzandıq. Qapının açıq yerlərindən üzümə sərin su zərrələri səpələnirdi.

Mən uzun zaman oyaq qaldım.

Adilin də oyaq olduğunu hiss edirdim.

Biz susurduq.

Yağış eyni şiddətlə çadırı tarap-turup döyəcləyirdi. Çadırın o tərəf-bu tərəfindən axıb uçuruma tökülən sellərin iti qıjıltısı eşidilirdi. Biz hər yandan tufanla əhatə olunmuş halda susurduq.

Mən təbiətin qüdrətli səsini dinləyirdim. Yəqin ki, Adil də o səsi dinləyirdi. Bəlkə də dinləmirdi. Bəlkə də Adil tamam ayrı şey haqqında düşünürdü. Biz bir-birimizdən bixəbər idik. Yağış isə, yarpaqları eyni qüvvətlə vururdu. Sellər axıb uçuruma tökülürdü. Tufanın şiddətində bir ahəngdarlıq vardı və mən bu ahəngin xoş təsiri altında yuxuya getdim. Gecənin bir aləmi dəhşətli gurultuya oyandım.

– O nə idi?! – deyə çadırın qapısında dayanmış Adildən soruşdum.

– Deyəsən bizdən bir az aşağı, üstündə böyük yemişan ağacı olan qaya uçdu...

– Sən yatmamışdın?

– Yox.

– Nə üçün?

– Elə-belə, yuxum qaçmışdı.

– Üstündə yemişan olan qaya uçsa, yolu bağlayar ki...

– Elədir...

– Gecən xeyrə qalsın!

– Sağ ol!

Mən dərhal yenə yuxuya getdim.

... Səhər tezdən oyandığım zaman Adil çadırda yox idi. Geyinib bayıra çıxdım. Göyün üzü zanbaq kimi gömgöy idi. Günəş yaş yarpaqları, çiçəkləri, otları və körpünün divarlarını gur işığa qərq eləmişdi, çaylaq dolusu köpüklü su axırdı.

Lakin dərədən o yana uzaq dağlar qaramtıl duman içindəydi. Görünür, ora hələ də yağırdı.

... Uçuruma tökülən suların şırıltısı dərənin dibindən axan dağ çayının qıjıltısına qarışırdı.

... Bizdən bir qədər aşağı, üzərində tək yemişan ağacı olan əyri qaya uçub yolu tutmuşdu. Adil və körpüsalanlar dayanıb sükut içində baxırdılar. Dağların o tərəfindəki fermalara gedən yeganə yol bağlanmışdı.

...Böyük bir yük maşını gəlib yol kəsilən yerdə dayandı. Həddindən artıq kök və gülərüzlü şofer oğlan düşüb yola tökülmüş qayaların üstündən aşaraq bizim yanımıza gəldi.

– Naçalnik, – deyə o, gülümsəyərək Adilə müraciət elədi, – biz neyləyəcəyik? Fermalara un aparıram. Camaat gözləyir.

– Düzələr, – deyə Adil sakit halda cavab verdi.

Sonra buldozerçiyə tərəf dönərək onun üzünə baxmadan soruşdu:

– Maşın sazdırmı?

– Bəli!

– Yolu təmizləmək lazımdır.

– Oldu!

– Tək siz öhdəsindən gələ bilərsinizmi? Bəlkə rayondan başqa buldozer də gətirdək...

– Məncə lazım deyil, – buldozerçi yola tökülmüş daş qalağına baxa-baxa cavab verdi.

Bu qısa söhbət zamanı mən, Adilin buldozerçi ilə mülayim söhbətindən gərginliyi hiss edirdim. Hiss edirdim ki, bu mehribanlıq sünidir və Adilə çox baha başa gəlir. “Öz hisslərimizi bir-birimizdən gizlətməyə bizi nə məcbur edir? Dünya bina olandan indiyə qədər davam edib gələn bu ikiüzlülük insanları təngə gətirməmişdirmi?”

... Buldozerçi iri-iri qaya parçalarını qabağına qatıb düz uçurumun qırağına gətirir və oradan aşağı yuvarladırdı. Daşlar dəhşətli gurultu qopara-qopara, nəhəng qayaların üzərindən atlana-atlana dərəyə gedirdi.

Bu eynilə ilk dəfə mənim bura gəldiyim zaman gördüyüm mənzərə idi. Lakin buldozerçi ondakı kimi hər dəfə uçuruma yaxınlaşdıqca, mənə baxıb istehza ilə gülümsəmirdi.

İndi buldozerçinin üzündə işgüzar qayğıdan başqa heç bir ifadə yox idi. Adil bir qədər tamaşa eləyəndən sonra dönüb çadıra getdi. Yol bağlı olduğundan, yəqin ki, bu gün işə gedə bilməyəcəkdi. “QAZ-69” o biri tayda qalmışdı.

Buldozerçi düz üç saat aramsız işlədi. Yolun ortasında təll atılmış qayalar qurtarmaq bilmirdi.

– Düş, bir tikə çörəkdən-zaddan ye, – deyə Soltan buldozerçiyə müraciət etdi.

O, maşını saxlayıb düşdü. Sonra yaylığını çıxardıb onu təzə görürmüş kimi bir neçə saniyə baxdı, alnının və boynunun tərini sildi. Bu yaylığı, o birilərininki ilə birlikdə mən yuyub-ütüləmişdim.

– Gedək balaca bir qəlyanaltı eləyək, – Soltan yeni gəlmiş yük maşınının şoferinə də təklif etdi.

– Nəyiniz var? – kök oğlan körpüsalanlarla yüz ilin dostuymuş kimi açıq-saçıqlıqla soruşdu.

– Ev yiyəsinin olanından, – deyə Soltan gülümsədi, – çay, pendir, təzə buğda yuxası.

– Yox, dadaş, mən sizi qonaq eləməli oldum...

Şofer azı yüz iyirmi kilo ağırlığına uyuşmayan bir cəldliklə daşların üstündən tullana-tullana o taya keçib yük maşınına qalxdı. Sonra böyük bir zənbillə geri qayıdıb, üç iri parça kolbasa, iki balıq konservi, beş şüşə pivə və bir kömbə çörək çıxartdı.

Kərimxan:

– Ə, qardaşlıq, – dedi, – sən dünyanı yığıb gətirmisən ki.

– Nə olacaq? Gəlin oturun.

Şofer cibindən bükülü bir qəzet çıxarıb ora-burasına baxaraq:

– Təzə olsa da, maraqlı bir şey yoxdur, – deyə otun üstünə sərdi.

Soltan:

– Bəlkə çadıra gedəydik?

Buldozerçi:

– Lazım deyil, bura yaxşıdır, – deyib hamıdan əvvəl əyləşdi.

Kərəmxan:

– Onda mən gedim stəkandan-zaddan gətirim.

Şofer:

– Dayan, stəkan da var, – deyə göy, sətin pencəyinin cibindən balaca bir stəkan və çəngəl-bıçaqdan tutmuş konserv qutusu, şüşə ağzı açana qədər, azı, on beş-iyirmi ağzı olan bıçaq çıxartdı.

– Sən ölmüyəsən! Səndə dəsgah var, qardaşlıq, adın nədir? – deyə Kərəmxan soruşdu.

– Adım Səməndər! – deyə şofer cavab verib, kolbasaları, çörəyi səliqə ilə doğradı, konserv qutularını açdı.

Sonra mənə müraciətlə:
– Bəlkə, – dedi, – siz də əyləşəsiniz...
– "Bəlkə" nə üçün? – dedim. Sizinki döndü... "Qonaq, çörək yeyirsiniz?"
Şofer bərkdən güldü.
Hamımız otların üstündə oturduq, mən bir-iki tikə alandan sonra əlimi süfrədən çəkib:
– Çox sağ ol, Mirzə Səməndər, – dedim, – indisə xahiş edirəm mənə icazə verəsiniz qaçım yoldaşımın yanına, görüm neyləyir.
– Hansı yoldaşınızın?
– Necə yəni hansı yoldaşımın? Həyat yoldaşımın!
– Bağışlayın.
Adil qapıda yemək stolunun yanında oturub, körpünün borularından çıxaraq gurultu ilə uçuruma tökülən selə baxırdı. Mən cəld stolun üstünə təzə ağ süfrə salıb göy-göyərti qoydum. Sonra qayğanaq bişirib iki qaba çəkdim və özüm də əyləşib böyük iştaha ilə yeməyə başladım.
O, bir-iki tikə götürüb çəkildi. Mən payımın hamısını eyni iştaha ilə yeyib qurtardım.
– Sənə çay tökümmü, Adil?
– Tök!
– Yəqin ki, yol təmizlənənəcən evdəsən.
– Yəqin ki...
Mən onun üçün bir stəkan tünd çay töküb, yenə də körpüsalanların yanına getdim. Onlar da təzəcə yeyib qurtarmışdılar.
Buldozerçi öz maşınına əyləşib, yolu tutmuş qayaları yenidən tərpədərək uçuruma yuvarlatmağa başladı. Biz dayanıb tamaşa edirdik.
Üzərində iri yemişan ağacı olan qayalıq elə parçalanmışdı ki, elə bil, dinamitlə partlatmışdın. Yemişan ağacı tikə-tikə olub torpağa qarışmışdı. Dünən tağ kimi yola sarı əyilmiş qayalığın üzərində tək dayanan bu yemişan ağacının romantik bir gözəlliyi var idi. Onun duruşu şahanə bir vüqar, qayğısız bir gözəllik təlqin edirdi. Adama elə gəlirdi ki, o min ildir elə beləcə qürurla dayanıb... Və min illər bundan sonra da elə beləcə dayanacaqdır.
Dünyanın işi əzəldən belədir. Təbiət böyük bir eşqlə yaratdığını eyni təntənə ilə də məhv edir.
Buldozerçinin bütün diqqəti maşının qarşısında idi. Onun çılpaq qolları, boynu-boğazı mis kimi qızarmışdı. Saçının qıvrımları bir-

birinə qarışmışdı. Kimsəyə baxmırdı. Kimsə ilə bir kəlmə kəsib danışmırdı. “İnsan nə qəribə məxluqdur...” deyə mən öz-özümə filosofluq edirdim. Heç elə bil bu buldozerçi birinci dəfə mən bura gələndə gördüyüm o saymaz oğlan deyil... O zaman o, maşınını qəsdən hər dəfə uçurumun lap kənarına qədər gətirir və istehza ilə mənə baxıb gülümsəyirdi. Heyf ki, rəssam deyiləm. Yoxsa, o zaman onun üzündə olan ifadəni elə çəkərdim ki...

İndisə, Kərəmxanın mahnısında deyildiyi kimi, tamam qaradinməz olubdur. Elə bil ki, danışmağa ağzından kirə istəyir. Elə bil ki, Soltanla Kərəmxandan başqa hamıdan zəhləsi gedir...

Lakin yox... O, şofer Səməndərlə də çox həvəslə danışırdı. Hətta, onun zarafatlarına gülürdü də. Adili görəndə isə, demək olar ki, əməllibaşlı qəzəblənirdi. O, üzünü yana çevirməklə bu hissini gizlətməyə çalışırdı. Lakin ovçu yanında göz qırpmaq olmaz. Mən onun hər bir hərəkətini bütün incəliklərinə qədər görüb-duyurdum. Mən ona qarşı son dərəcə həssas olduğumu gizlətmirdim. Biz bir-birimizdən heç bir şey gizlətməyəcəyimiz barədə briqadada and içmişdik. Lakin biz öz andımızı pozuruq. Mənə elə gəlir ki, Soltan da, Kərəmxan da, buldozerçi də, mən də nə isə bir şey bilirik. Nə isə hiss edirik, lakin bu “hiss etdiyimizi” bir-birimizə deməkdən çəkinirik.

İndi işimiz çoxdur. Baş açılan kimi mən bu barədə briqadada danışacağam... Mən hər şeyi... hər şeyi danışacağam. Bəlkə, hətta, ağlayacam da. Mənim deməyə sözüm çoxdur. Mən onlara deyəcəyəm: “Bura baxın, əzizlərim, gəlin, nə qədər çətin olsa da, andımıza əməl eləyək... Gəlin dünən qopan tufan kimi biz də öz böyük həqiqətimizlə hər şeyi alt-üst eləyək. Yüz min illərdən bəri insanlara çətin görünən mətləbi biz asan eləyək!..”

İndi günəş düz buldozerçinin üzərinə şaxıyırdı. Onun alnında, üzündə tər damlaları parıldayırdı. Yağışdan-tufandan sonra dağ günəşi qızğın olur.

– Bəlkə bizim qəhrəmana bir stəkan pivə verəsiniz... – deyə mən, zarafatyana bir əda ilə şofer Səməndərə müraciət elədim, – yoxsa, daha yoxdur?..

– Mənim, bax, bu gözüm üstə! Nə üçün yoxdur?! – şofer daşların üzərindən sıçraya-sıçraya gedib bir şüşə pivə gətirərək, ağzını açdı.

Mən:

– Bəs stəkan?

– Stəkanı neyləyir? – deyə o, yaxınlaşıb şüşəni buldozerçiyə uzatdı.

O da alıb birnəfəsə hamısını içərək, şüşəni uçuruma tulladı. Sonra bizə baxmadan yenə də işinə davam etdi.

– Birini də gətirimmi? – deyə şofer Səməndər ona sarı qışqırdı.

Buldozerçi başını buladı.

Kərəmxan zarafat elədi:

– Deyəsən, pivənin hamısını bizə içirtmək fikrindəsən.

– İçirdəndə nə olacaq, dədəm döyməyəcək, nənəm söyməyəcək. Qurbandır sizə!

Soltanla Kərəmxan qaya parçalarını linglə tərpədib irəli yuvarladırdılar ki, buldozer yaxşı ala bilsin. Səməndər də onlara kömək edirdi.

Etiraf edim ki, onun qonaq elədiyi şeylər mənə həmişə yediklərimdən ləzzətli gəlirdi. Yaxşı deyiblər: qonşu payı şirin olar.

– Sizin yuxarı fermalarda nə var, nə yox? – deyə mən ondan soruşdum.

– Hər nə desəniz. Sağlıq olsun, körpüləri salıb qurtarandan sonra gəlib görərsiniz.

Buldozerçi ara vermədən işləyirdi. Şofer Səməndər iki dəfə ona təklif etdi ki, sən düş, bir az dincəl, mən işləyim. Razı olmadı. Onun üzündən, əzələləri yumruqlanmış qollarından su axırdı. Dağ günəşi elə yandırırdı ki...

O bir az dincəlsəydi, pis olmazdı. Keçmə bu oğlanların inadından.

Təxminən saat üçə yaxın yolun əsas hissəsi açıldı. Şofer Səməndər maşınına əyləşib uzaq dağlara yol aldı və tezliklə meşədə görünməz oldu.

Günün axırına yaxın buldozerçi yolu tamam təmizləyib qurtardı.

Biz, briqada üzvləri, onu ortaya alıb, hərəmiz könül açan bir söz dedik.

– Tərlisən, sənə soyuq olar... – deyə Kərəmxan öz nazik pencəyini onun çiyninə saldı.

Mən çadıra gəlib:

– Adil, – dedim, – sən bizim rəisimizsən! Xahiş edirəm buldozerçini təbrik eləyəsən.

O, sakit halda soruşdu:

– Nəyə görə?

– Yolu təmizləyib qurtardı.

Adil gülümsədi:

– Baş üstə, təbrik edirəm. Ancaq, axı, bu onun vəzifəsidir.

– Əvvəla, onun vəzifəsi körpü salmaqdır. İkincisi, bir var, tək öz vəzifəni yerinə yetirəsən, bir də var, bir gündə on günün işini görəsən. Sən gördün ki, yola nə qədər daş-qaya tökülmüşdü...

Adil dinmədi. Haçandan-haçana mənim üzümə baxmadan:

– Əgər, – dedi, – ayın axırında imkan olarsa, tapşıraram, bugünkü işini nəzərə alıb, ona bir az artıq pul yazsınlar.

– Heç o, pul barədə düşünmür...

– Pul barədə düşünmürsə, burada nə gəzir?

– Bəs sən, mən burada nə gəzirik?

– Mən pul barədə düşünürəm!

Mən deməyə söz tapmadım və bu məni daha da qəzəbləndirdi.

Axşama yaxın hava yenə də tutuldu. Gecədən bir az keçmiş təkrar yağış başladı.

Səhər biz oyananda yağış kəsməmişdi. Mən körpü tərəfdə səs-küy eşidərək cəld geyinib bayıra çıxdım. Soltan, Kərəmxan və buldozerçi yağışın altında nə isə edirdilər. Mən plaşı başıma atıb onların yanına yüyürdüm. Sel üst tərəfdən böyük bir qaya parçasını yumalayıb suyun körpünün borularına dolduğu yerinə salmışdı. Borunun ağzı tutulduğundan, su yuxarı qalxaraq güc verib təzə divarı uçurmaq istəyirdi. Körpüsalanlar, dizlərinə qədər suyun içində, linglə qayanı qaldırıb kənara yıxmağa çalışırdılar.

Mən də lingin yuxarı tərəfindən yapışdım. Yağış üzümüzə çırpdığından, gözümüzü açmağa imkan vermirdi.

– Bir də!

– Ay gözünə dönüm, bir də! – deyə Kərəmxan tufanın içində ahəngdar səslə komanda verdi.

– Tərpənir! Bir də!

Və biz bir də güc verəndə qayanı qaldırıb kənara aşırdıq. Sel qəzəblə boruya doldu. Biz sudan çıxanda, yuxarı tərəfdə gurultu eşidildi və bu anda onlarca daş parçası o yandan yumalanaraq böyrümüzdən, başımızın üstündən atlandı.

– Qərib nə oldu? – deyə Soltan birdən səsləndi və mən tələsik dönüb baxanda, buldozerçini körpünün divarına söykənərək gözlərini yumub sağ ayağını yuxarı qaldırdığını gördüm. Üçümüz də bir anda onun yanına yüyürdük.

Soltan təkrar soruşdu:

– Nə oldu?

Buldozerçi ağrının şiddətindən zorla cavab verdi:

– Daş dəydi.

Onun yanında iri bir daş düşüb qalmışdı. Ayağından isə qan axırdı. Soltanla Kərəmxan onun qoltuğuna girdilər və biz çox çətinliklə onu çadırlarına aparıb çarpayısının üstündə oturtduq. Sonra mən:

– Dayanın, yaraya əl vurmayın, bu dəqiqə gəlirəm! – deyib öz çadırımıza yüyürdüm. Və Bakıdan gətirdiyim balaca əczaxananı götürdüm. Adil nə isə soruşdu. Lakin mən ona cavab vermədən körpüsalanların yanına qaçdım. Buldozerçinin ayağından qan sel kimi axıb çadırın ortasında göllənmişdi. Mən onun qanlı corabını qayçı ilə kəsib tulladım. Yaranın ətrafını spirtlə yuyub təmizlədim. Bir parça cunaya yod töküb yaraya basdım. Mən çiliklənmiş sümükləri əlimin altında hiss edirdim. Buldozerçi dinmirdi. Mən yaranı sarıyıb qurtarandan sonra Kərəmxan soruşdu:

– Qərib, yenə ağrıyır?

– Ağrıyır.

Soltan bir qədəh konyak töküb ona uzatdı:

– Al, vur getsin. Deyirlər cəbhədə yaralılara hərdən belə şey verirmişlər.

Buldozerçi konyakı alıb içdi.

Mən:

– İndisə, paltarınızı dəyişin. Yaş paltarda olmaz, – deyib bayıra çıxdım.

Yağış hələ də tökürdü. Bir-iki dəqiqədən sonra:

– Səriyyə, gələ bilərsən... – deyə Soltan içəridən səsləndi. Mən çadıra girərək buldozerçiyə:

– Bir az dincəlin, sonra rayon mərkəzinə, həkimə getmək lazımdır, – dedim.

– Əşi, orada nə var ki, həkimə getsin... – Kərəmxan zarafatyana cavab verdi.

Mən:

– Yox, – dedim, – getmək lazımdır.

– Düzdür, həkimsiz olmaz, – deyə Soltan təsdiq etdi.

Mən öz çadırımıza gəlib:

– Adil, – dedim, – buldozerçinin ayağı bərk yaralanıb, onu rayon mərkəzinə aparmaq lazımdır. Sən işə gedəcəksən?

– Gedəcəyəm.

– Onda buldozerçini də maşına qoyarıq.

– Mən yolda iş sahələrinə baş çəkəcəyəm. Telefon olan yerdə zəng edərəm, xəstəxanadan maşın göndərərlər.

– Yox, Adil, gec olar, onu tez, lap bu dəqiqə aparmaq lazımdır.

– Yaxşı, sən deyən olsun.

Adil etiraz eləmədi və o geyinib qurtarana qədər mən çayını-çörəyini hazırlayıb stolun üstünə qoydum. Sonra özüm də paltarımı dəyişib "QAZ-69"a əyləşərək, ağacların arasından keçib lap körpü-salanların çadırına yaxınlaşdım.

Soltanla Kərəmxan buldozerçinin qoltuğuna girərək, maşına çıxartdılar.

– Qəriblə kim gedəsidir? – deyə Kərəmxan Soltandan soruşdu.

– Mən! – deyə cavab verdim.

– Bəlkə bizdən də birimiz gedək? – Kərəmxan Soltana baxdı.

Buldozerçi mənə müraciətlə:

– Sizə əziyyət olar, – dedi, – qoyun uşaqlardan biri getsin.

– Mənə heç bir əziyyəti yoxdur, – dedim, – uşaqlar burada qalmalıdırlar. Bu tufanda yarımçıq körpünü yiyəsiz qoymaq olmaz.

– Doğrudur, – deyə Soltan təsdiq etdi, – Səriyyənin getməsi yaxşıdır.

Mən təkrar maşını öz çadırımızın qabağına gətirdim. Adil sükanın arxasında oturmaq istədi. Lakin mən durmadım.

– Nə təfavütü var, – dedim, – ya sən, ya mən.

O, dinmədi. Buldozerçidən də heç nə soruşmadı. Biz tərpəndik. Yağış eyni şiddətlə tökürdü. Yolda tez-tez dumana düşüb çıxırdıq. Mən yaralını incitməmək üçün mümkün qədər ehtiyatla sürürdüm.

Rayon mərkəzinə çatanda, Adil düşüb öz idarəsinə getdi və gedərkən:

– Xahiş edirəm, – dedi, – maşını tez qaytar, bəlkə mənə lazım oldu.

Mən onun arxasınca baxaraq, heç bir söz demədim və birbaş rayon xəstəxanasının qabağına sürdüm.

İnstitutu təzə qurtarmış cavan bir oğlan olan baş cərrah şəfqət bacısının müşayiətilə yaranı müayinə etdikdən sonra dərhal infeksiya əleyhinə iynə vurdu. Sonra məni öz otağına apararaq:

– Bilirsinizmi, – dedi, – yara çox ağırdır. Barmaq sümükləri də sınıb.

Sonra özünə güvənən ötkəm bir ifadə ilə əlavə etdi:

– Eybi yoxdur, sağaldarıq. Cərrahiyyə əməliyyatı çox mürəkkəb olacaq. Ancaq çalışarıq müvəffəqiyyətlə qurtarsın.

– Cərrahiyyəni kim eləyəcək?

– Mən!

Əvvəl heç bir söz demədim. Lakin o, həddindən artıq gənc idi... Utanmaq yeri deyildi.

– Bəlkə Bakıdan professor çağıraq?

Həkim bərk qızararaq, mənə acıqlı bir nəzər salıb:
– Əvvəla, – dedi, – o şeyi ki, özümüz eləyirik, ondan ötrü şəhərdən adam çağırmırıq. İkincisi, bu cür havada aeroplan gələ bilməz. Aydındırmı?
– Yox, aydın deyil.
– Nə aydın deyil?
– Cərrahiyyənin müvəffəqiyyətlə keçəcəyinə siz əminsinizmi?
– Əminəm. Daha nə soruşursunuz?
– Daha heç nə.
– Yaralı sizin nəyinizdir?
– Yoldaşım.
– Onun üçün bu qədər narahat olursunuz? – deyə o, gülümsədi.
Görünür, kinli oğlan deyilmiş. Özü də mənim “yoldaşımdır” sözünü “ərimdir” mənasında başa düşüb... Mən də onun səhvini düzəltməyərək:
– Yaxşı, – dedim, – əməliyyatı nə vaxt başlamaq fikrindəsiniz?
– Sabah səhər saat doqquzda.
– Bəlkə bu gün...
– Bu gün iki cərrahiyyə əməliyyatı aparacağam, – deyə o, qürurla cavab verdi, – vaxtım yoxdur.
Sonra zəngi basaraq, gələn şəfqət bacısına əmr verdi:
– Yaralını qəbul eləyin.
Şəfqət bacısı ilə birlikdə mən də çıxdım.
Buldozerçini palatada yerləşdirdikdən sonra soruşdum:
– Bəlkə ürəyin bir şey istəyir, Qərib?
– Heç nə lazım deyil...
Sonra şəfqət bacısına:
– Su istəyirəm, – dedi.
– Su yaxşı deyil, – şəfqət bacısı gedib bir stəkan çay gətirdi.
Sonra termometr qoydu. Mən səbrsizliklə on dəqiqə gözlədim. Şəfqət bacısı termometri götürüb əvvəl özü baxdı, sonra mənə verdi. Otuz doqquzdan xeyli ötmüşdü. Buldozerçi hərarət barədə heç nə soruşmadı, biz də demədik.
– Siz çox zəhmət çəkdiniz, sağ olun, – deyə o mənə müraciət elədi, – uşaqlara deyin nigaran olmasınlar.
– Mən hələ qayıtmıram.
– Bu gün getmirsiniz?
– Yox.

– Nə üçün?

– Burada bir-iki günlük işim var. Hələlik, sağ olun! Səhər gələcəyəm.

Mən təkrar baş cərrahın yanına qayıdıb, hərarətin çox yüksək olduğunu söylədim. Cavan həkim gülümsədi:

– Eybi yoxdur, əlbəttə, hərarəti olacaq. Çox ağır yaradır. Bu saat tapşıraram penisillin vurarlar.

– Hələlik, doktor, – deyib çıxdım və maşına oturub, Adilin idarəsinə getdim.

Əhvalatı ona danışıb əlavə etdim ki:

– Mən bu gün evə qayıda bilməyəcəyəm. Buldozerçini tək qoyub getmək olmaz.

– Nə üçün? Bəyəm xəstəxanada adam-zad yoxdur?

– Adam var. Ancaq mən cərrahiyyə əməliyyatının nəticəsini bilməmiş getmək istəmirəm.

O, dərindən nəfəs alaraq, mənim üzümə baxmadan:

– Yaxşı, – dedi, – nə cür istəyirsən... Ancaq harada qalacaqsan?

– Hələlik manikürçü qadıngilə gedərəm. Ya onlarda qalaram, ya da mehmanxanada. Sən get evə, narahat olma. Səhər birlikdə qayıdarıq.

Mən gözləyirdim ki, o deyəcək: “indi gedək evə, səhər yenə gələrsən. Onsuz da mən hər gün işə gəlib-gedirəm”. Lakin o belə demədi. Mən onun çox pərt olduğunu hiss edirdim.

– Hələlik, Adil! Bu gün naharı burada yeyib gedərsən.

O dinmədi.

Məni görərkən dərhal ayağa duran gənc katibənin böyründən keçib pillələri düşdüm.

Manikürçü qadının evi həmişəki kimi sərin, təmiz və səliqəli idi. Biz gilənar mürəbbəsi ilə çay içib, oradan-buradan söhbət elədik. Manikürçü qadının qızı baş cərrah Eyvazlını çox tərifləyirdi.

– Cavanlığına baxmayın. Yaman istedadlıdır. Hələ əlindən bir xata çıxmayıb, deyirlər, çox yüngül əli var.

– Görək sabah bizim buldozerçinin başına nə gətirir, – deyə mən zarafat elədim.

Axşam mən mehmanxanaya getmək istədim. Ev sahibləri buraxmadılar. Qonşudan xəstəxanaya zəng eləyib buldozerçinin vəziyyətini soruşdum. Gündüz gördüyüm şəfqət bacısı telefona gəlib cavab verdiki:

– Vəziyyəti elə siz gördüyünüz kimidir.

– Ağrıdan şikayət eləyir?

– Heç bir şeydən şikayət eləmir. Gözünü yumub sakit uzanıb.

– Penisillin vurdunuzmu?

– Vurduq.

O gecə mən səhərə qədər Qəribi yuxuda öz buldozerinin üstündə oturub selin-suyun içində əlləşən gördüm.

Səhər manikürçünün qızı ilə birlikdə xəstəxanaya getdik. Tanış şəfqət bacısı mənə dedi ki:

– Baş cərrah sizin yaralı barəsində o biri həkimlərlə konsilium edir.

– Məgər, vəziyyəti nə cürdür ki?

– Bilmirəm... – deyə şəfqət bacısı tutularaq cavab verdi.

Mən icazə-filan almadan otağa girdim. İçəridə qızğın mübahisə idi. Məni görərkən susdular.

Baş cərrah mənə ciddi bir nəzər salaraq:

– Bilirsinizmi, – dedi, – biz sizin yoldaşınızın ayağını pəncədən kəsmək qərarına gəlmişik.

– Nə üçün?

– Çünki barmaq tərəfindən qanqren başlanıb. Ayrı çarə yoxdur. Əgər, gözləsək, sonra qıçını kəsmək lazım gələcək.

– Yaralı sizin qərarınızı bilirmi?

– Bilir.

– Nə deyir? Razılıq verir?

– Yox, razılıq vermir. Bu saat onun fikri ilə hesablaşmaq olmaz. Qızdırması çox yuxarıdır.

– Kəsilməyə mən də razılıq vermirəm! – dedim.

Baş cərrah:

– O zaman məsuliyyət bizim üzərimizdən götürülür.

– Ancaq mən xəstəni Bakıya aparmaq istəyirəm.

Aradan qısa bir sükut keçdi.

– Nə vaxt aparmaq istəyirsiniz? – deyə həkim soruşdu.

– Lap bu saat.

– Nə ilə?

– Maşınla.

Yenə də sükut.

– Nə olar, – madam ki, istəyirsinizsə, aparın.

Amma gecikməyin. Yaralının vəziyyəti çox ciddidir. Bir saat belə ləngitmək olmaz.

– Mən xəstəni görə bilərəmmi?

– Görə bilərsiniz, – deyə baş cərrah üzümə baxmadan cavab verdi.

... Buldozerçinin rəngi pörtmüşdü. Məni görərkən gülümsəyib:

– Səriyyə, – dedi, – deyəsən, bu həkimlər mənim ayağımı tutub kəsmək istəyirlər...

– Eşitdim. Mən sizi bu saat Bakıya aparıram. Orada təcrübəli professorlar baxarlar.

– Bakıya getmək olar. Ancaq...

O, dişlərini bir-birinə sıxaraq, bir neçə saniyə susdu. Görünür, ayağı bərk ağrıyırdı.

– Ancaq sizinlə getmərəm. Gedin uşaqlardan birini göndərin. Ya da, mənim anamgil qonşu rayonda olurlar, onlara teleqram vurun gəlsinlər.

– Heç nə lazım deyil! O gec olar. Siz mənimlə gedəcəksiniz. Uşaqlarla qərarımız belə olub. Onlar işləyirlər.

O, quru atəşlə yanan gözlərini bir an üzümdə saxlayaraq, daha nə isə demək istədi. Lakin söhbət məqamı deyildi. Onun vəziyyəti, doğrudan da, ciddi idi.

Palatadan çıxıb, bayırda məni gözləyən manikürçünün qızı ilə birlikdə Adilin idarəsinə getdik. Katibə xəbər verdi ki, Adil rayon icraiyyə komitəsinin sədri ilə sahələrə gedib. Axşam saat beşdə-altıda qayıdacaq... Dedi ki, siz onu gözləyəsiniz.

Lakin mən onu gözləyə bilmədim. Mən bir qədər fikirləşəndən sonra katibədən soruşdum:

– Adil öz maşınında gedib?

– Xeyr, ispalkomun "Volqa"sında getdilər.

Biz Adilin maşını dayanan qaraja getdik. Orada məni tanıyırdılar. Müdirlə salamlaşıb dedim:

– Bir neçə saatlığa maşın mənə lazımdır. Adil soruşsa, deyərsən.

Qaraj müdiri:

– Baş üstə! – deyib darvazanı taybatay açdı.

Biz maşına qalxdıq. Mən əvvəlcə aptekə sürüb, "valerian" və sair xırda-xuruş dərman götürdüm. Sonra bazara sürüb, bir qədər gilənar, gilas, alma aldım. Daha sonra manikürçü qadıngilə gəldik.

– Buradan Bakıya dörd yüz kilometrə qədər yoldur. O cür ağır yaralı ilə tək getmək sizin üçün çətin olar, – deyə manikürçü qadın etiraz elədi. – Heç olmazsa, bir yoldaş da lazımdır.

Qızı dilləndi:

– Yoldaş – mən!

– Yox, sizə zəhmət olar, – dedim.

– Nə zəhmət olacaq?! Vaxta ki, getmək istəyir, qoyun getsin. Bakıda ev-eşiyimizə də baş çəkər. Biz hələ iki ay buradayıq.

Qız anasının razılıq verməsinə sevinib getməyə hazırlaşdı. Mən axşam da bir şey yeməmişdim, onlarla birlikdə qəlyanaltı elədim. Sonra manikürçü qadın böyük termosu çayla doldurdu. Soyutma yumurta bişirdi. Pendirdən-çörəkdən zənbilə yığıb maşına qoydu. Özü də əyləşib bizimlə xəstəxananın həyətinə gəldi.

... Biz rayon mərkəzindən çıxanda hələ də yağış çisginləyirdi. Ətraf xəfif duman içindəydi.

Mən tez-tez dönüb arxaya baxırdım. Buldozerçi gözlərini yummuşdu. Qonşu rayonun poçt idarəsinin qabağında maşını saxlayaraq, düşüb Adilə bu məzmunda bir teleqram vurdum: "Adil! Buldozerçinin ayağı qanqren elədiyindən, kəsmək istəyirdilər. Qoymadım. Onu təcili Bakıya aparası oldum. İdarəyə gəldim ki, səndən icazə alım. Dedilər axşam qayıdacaqsan. O vaxta qədər gözləmək olmazdı. Çarəsizlikdən sənin maşınında getdik. Hələlik! Səriyyə".

Biz sürətlə dağbasardan arana enirdik. Bu yerlərdə yağışdan əsər-əlamət yox idi. Asfalt qupquru idi. Göydən od yağırdı. Mən saatda yetmişdən az getməməyə çalışırdım. Tez-tez bir-iki dəqiqəliyə maşını saxlayıb, Qəribə çay və meyvə verirdim. Çox susayırdı. Huşu özündə olsa da, hərarətinin yüksək olduğunu hiss edirdim. Biz maşının içini elə düzəltmişdik ki, o, ayağını həmişə uzatmış vəziyyətdə saxlaya bilsin. Buna baxmayaraq, qanqren başlamış yaralı üçün bu qədər uzun yolun, maşının silkələnməsinin nə demək olduğu məlum idi. Lakin o dinmirdi.

Ağdaş şəhərinin yaxınlığında, dörd yüz əlli ildən artıq yaşı olan çinarın altında yaxşı bir çayxana var. Mən çinarın kölgəsində maşını saxladım. Məhrəbanı isladıb Qəribin üzünün tozunu sildim. Sonra təzə gilənar mürəbbəsiylə çay verdim. Manikürçünün qızı ilə mən də bir-iki stəkan çay içəndən sonra ona dedim:

– Bəlkə siz keçib burada oturasınız. Qəribin başına tez-tez cuna qoymaq lazımdır.

O mənim təklifimi həvəslə qəbul etdi.

Mən sükanın arxasına, o isə, Qəribin yanına keçdi.

Mən bu dəfə sürəti bir az da qaldırdım. Yaralıya əziyyət də olsa, şəhərə mümkün qədər tez çatmaq lazım idi. Mən maşınımı kiçik bir daş qırığının üstündən də olsa atlandırmamağa çalışırdım. Tənzifi tez-tez təzələyirdik. Nəhayət, məşhur Ağsu keçidi göründü.

– Daha az qalmışıq, Qəribcan, – deyə mən geri döndüm.

Birinci dəfə idi ki, ona Qəribcan deyə müraciət edirdim. O, gözlərini açıb bir an mənə baxdı, sonra yenə yumdu.

Biz Ağsu keçidinə çatanda hava birdən-birə tutuldu və bərk yağış başladı. Biz keçidin başına qalxanda yağış o qədər şiddətləndi ki, yoldan şırıltı ilə sel axır və üç-dörd addım qabağı görmək olmurdu. Bəzən yolu kəsib uçuruma tökülən su maşının ayaq qoyulan yerinə qədər qalxırdı. Mən suyun motoru söndürəcəyindən qorxub, ehtiyatla irəliləyirdim. Orada-burada dalbadal ildırım çaxıb meşəni və dərələri işıqlandırırdı. Mən qorxurdum ki, sel motoru söndürər, güc verib maşını uçuruma yuvarladar. Ən pisi də bu idi ki, yağış o yandan bəri düz üzümə çırpdığından, gözlərimi açmağa imkan vermirdi. Hər otuz-qırx metrdən bir isə döngələri burulmaq lazım gəlirdi.

Yol ilə o qədər sel axırdı ki, elə bil, biz dəhşətli bir dağ çayının içi ilə irəliləyirdik. Elə bil ki, "QAZ-69" canlı bir məxluqa çevrilərək, mənimlə birlikdə bu sellərin əlindən salamat xilas olmaq üçün fövqəladə güc və cəsarət göstərirdi. Öz-özümə deyirdim: "Bircə motor sönməyəydi!" Afərin! Tormoza söz yoxdur! Göylərdə bəyəm nə qədər su olarmış... Birdən mən bir anlığa geri çevrildim. Qərib gözlərini açaraq diqqətlə qabağa baxırdı. Bu zaman maşın təkrar yolu ortadan kəsən gur selə rast gəldi.

– Bərk keçin! – deyə buldozerçi arxadan səsləndi. Mən maşının sürətini artırıb seli qıjıltı ilə keçdim və dərhal geri çevrildim. Buldozerçi yenə də gözlərini yummuşdu.

Nəhayət, biz Ağsu keçidini enib yağışdan çıxdıq və bir az gedəndən sonra yenə isti başladı.

Mən qol saatıma baxdım. Çinarın altındakı on beş-iyirmi dəqiqəni nəzərə almasaq, düz altı saat idi ki, yol gəlirdik. Keçiddə xeyli ləngimişdik. Şamaxıdan sonra təxminən yüz kilometr yolumuz qalırdı. Mən sürəti artırdım. Özümdə yorğunluq hiss eləmirdim. Yalnız qollarımın yuxarısı, birtəhər, keyiyən kimi olmuşdu.

Axşam saat yeddiyə işləyəndə Bakıya çatıb, maşını düz Azərbaycan travmatologiya və ortopediya institutuna sürdüm. Ora yaxşı xəstəxana hesab olunurdu. Baş həkim də köhnə neftçi olan atamın dostu idi. Lakin maşını qapıda qoyub, yürüyə-yürüyə pilləkəni çıxdığım zaman lap göydən düşmüş kimi baş həkimə rast gəldim.

– Salam, doktor, – deyib tövşüyə-tövşüyə qabağını kəsdim.

– Salam... – deyə həkim ayaq saxlayıb təəccüblə mənə baxdı.

– Deyəsən, tanımırsınız, Səriyyəyəm də, usta Ağabalanın qızı.

– Bay, salam... salam... – altmış beş-yetmiş yaşlı xoşsifət bir kişi olan baş həkim mənimlə əl tutdu.

– Nə olub, üzün-gözün niyə belə torpaq içindədir?..

– Yeddi saatdır ki, maşın sürürəm... Rayondan ağır bir xəstə gətirmişəm.

– Bəs, sən Bakıda olmursan? Rayonda nə işin var idi?

– Xeyr, Adil də, mən də rayonda işləyirik. Müvəqqəti getmişik. Bizim yaxşı bir buldozerçimiz var; daş düşüb, ayağını əzib. Rayonda kəsmək istəyirdilər, götürüb qaçmışam bura.

– Kəsmək nə üçün? Nə olub bəyəm?

– Deyirlər, guya, qanqren başlayıb...

Doktor bir neçə an fikirləşib:

– Yaxşı, – dedi, – deyərəm xəstəni qəbul etsinlər.

– Çox razıyam, – mən onun əlindən yapışdım. – Mən rayondan sizi deyib gəlmişəm. Axı, siz mənim əmimsiniz... Yadınızdadır, həmişə mənə “Mişka” konfeti gətirərdiniz?..

Doktor gülümsəyib:

– Gedək, – deyə geri qayıtdı.

Kabinetdə stolun arxasına keçərək zəngi basdı:

– Yaxşı ki mənə rast gəldin. Çıxıb gedirdim bağa.

– Səltənət əmidostum bağdadır? – mən özümü yaxın göstərmək məqsədilə qəsdən Səltənət xanım əvəzinə, “Səltənət əmidostum” dedim. (Səltənət xanım onun arvadı, köhnə fransız dili müəlliməsi idi.)

– Bəli, bağdadır. Mən özüm də bağda oluram. Məzuniyyətdəyəm. Bu gün elə-belə gəlmişdim.

Bu zaman daxil olan şəfqət bacısına:

– Xəstəni tez götürsünlər, – dedi. – Üçüncü palataya. Doktor Möhsünzadə buradadırmı?

– Xeyr.

– Yaxşı, sən işində ol!

– Çox sağ olun, doktor, – deyib mən də şəfqət bacısının ardınca getmək istədim.

– Sən hara? Sənlik iş yoxdur. Özləri götürəcəklər...

Mən, istər-istəməz, dayandım. Həkim bir az fikirləşəndən sonra soruşdu:

– Deyirlər, qanqren başlayıb?

– Bəli...
– Oradan çıxdığınız neçə saatdır?
– Düz altı saat yarımdır.
Baş həkim zəng vurub xahiş elədi ki, professor Möhsünzadəni telefona çağırsınlar və bir dəqiqəyə qədər gözlədikdən sonra:
– Salam, salam, – dedi. – Yatmışdın? Yox? Sənə yaman əziyyət verməli olacağam.
Sonra əhvalatı ona danışaraq:
– Bilirəm, bu gün sənin növbən deyil... Ancaq çox xahiş edirəm... Bəlkə bir yarım saatlıq vaxt tapıb özün ona baxasan. Nə vaxt?! Çox sağ ol! İnşallah oğlunun toyunda bir at çaparıq...
Baş həkim zarafat eləyib dəstəyi asdı. Sonra mənə müraciətlə:
– Buldozerçinin işi düzələr, – dedi. – Narahat olma, ərin neyləyir?
– İşləyir.
– O gün radioda yaman tərifləyirdilər. Deyəsən, ağlı başında oğlandır.
– Bəli!
– Qardaşqızı pis oğlana getməz ki...
Baş həkim təkrar güldü.
– Professor nə vaxt gələcək?
O, divar saatına baxaraq:
– Səkkizdə. Dedim ki, narahat olma.
– Narahat olmuram...
Bir neçə dəqiqədən sonra şəfqət bacısı gəlib, yaralının palataya götürüldüyünü xəbər verdi.
– Növbətçi həkimə tapşırarsan ki, axşam saat səkkizdə professor gəlib həmin yaralıya baxacaq.
– Bəlkə icazə verəsiniz, professor baxanda mən də iştirak eləyim...
Həkim təəccüblə üzümə baxdı:
– Sənin nə işin var ki?! Möhsünzadə bizim ən yaxşı cərrahımızdır.
– Bilirəm!
– Baxacaq, lazım bilsə, kəsəcək. Lazım bilməsə, kəsməyəcək. Sən, yaxşısı budur, gedib bir yaxşı-yaxşı yuyunasan. Üz-gözünü o qədər toz basıb ki, dəyirmançıya oxşayırsan. Buldozerçi sənin nəyindir?
– Heç nəyim?
– Yaxşı, bunun əhəmiyyəti yoxdur. Gedək.
Həkim qalxdı. Qapıda “QAZ-69”u görüb soruşdu:
– Bunda gəlmisiniz?

– Bəli.

Manikürçünün qızına işarə ilə:

– Şofer budur?

– Xeyr, şofer mənəm.

– Oradan buracan özün sürmüsən?

– Nə var ki?.. Gəlin əyləşin sizi aparım.

– İstəməz, mən evə dəyəcəm. Sonra öz maşınım gəlib bağa aparacaq. Evə piyada getmək istəyirəm. Olmaya bu qız buldozerçinin arvadıdır?

Manikürçünün qızı güldü:

– Xeyr, bu mənim yoldaşımdır.

– Aha, çox gözəl! Hələlik, sabah sənin buldozerçinin xətri üçün bəlkə bir də xəstəxanaya gəldim. Zəng edərsən!

– Baş üstə!

Mən qəsdən ləngidim. Baş həkim bir daha:

– Hələlik, – deyərək bizdən ayrılıb getdi.

O, döngəni burulub gözdən itən kimi:

– Ay qız, mən bu dəqiqə gəlirəm, – deyərək təkrar qayıdıb xəstəxanaya çıxdım.

Şəfqət bacısını tapıb, məni üçüncü palataya aparmasını xahiş etdim. Şəfqət bacısı bir qədər tərəddüddən sonra gedib mənə bir xalat gətirdi və biz üçüncü palataya getdik. Cavan bir növbətçi həkim də oradaydı. Palata geniş, təmiz və işıqlı idi. Buldozerçidən başqa üç nəfər də ayrı xəstə var idi.

Qərib gözlərini yummuşdu.

Növbətçi həkim termometri götürüb baxdı və narahat halda başını buladı.

Mən heç bir söz soruşmadan şəfqət bacısı ilə birlikdə otaqdan çıxdım, ondan telefon nömrəsini öyrəndikdən sonra maşının yanına gəldim və yalnız indi yadıma düşdü ki, Bakıdakı evimizin açarlarını götürməmişəm.

Manikürçünün qızı:

– Nə təfavütü var, gedərik bizə, – dedi, – evimiz yayda pis olmur.

Biz maşına minib tini burulanda sanki arxadan məni çağırdılar. Maşından başımı çıxarıb geri baxdım. Heç kəs yox idi. Xəstəxana binası bir an mənə soyuq və cansıxıcı göründü. Sürəti artırıb tini buruldum. Başqa küçəyə keçəndə hava birdən-birə mənə sərin və xoş bir təsir bağışladı. Elə bil ki, nəfəsim genişləndi. Sonra palatada uzanmış buldozerçi gözlərim qarşısında canlandı və mən özüm özümə

məyus – mənasız bir canlı kimi göründüm. "Bütün bunlar... Altı-yeddi saat birnəfəsə maşın qovmaq, Ağsu keçidində bizi aşırıb uçuruma yuvarlanmağa can atan o sel-su, baş həkim... Nə üçündür?.. Yəqin ki, Adil indi gəlib əhvalatdan hali olur, əsəbiləşir, əzab çəkir... Nə üçün? Nə üçün məndən ötrü başqa birisi əzab çəkməlidir... Eh, Adil!.. Mənim ağıllı dostum". Birdən qız "oy" deyə qışqırdı. Əlində dolu zənbil küçəni keçən kök bir qadına toxunhatoxunda maşını saxladım. Qadın hirslənib söydü, sonra:

– Milis! Milis! – deyə çığırdı.

Mən qazı basıb aradan çıxdım və dərhal başqa küçəyə buruldum... Qaç ki, qaçasan! Manikürçü qadıngilin evləri Qaraşəhər körpüsünün yaxınlığında, ikinci mərtəbədə, iki balaca otaqla bir mətbəxdən ibarət kiçik və sadə bir mənzil idi. Pəncərələri açdıq. Axşam yeli içəri dolub otağın havasını təzələdi. Mən o qədər yorulmuşdum ki, mətbəxdə əl-üzümü güclə yuya bildim. Sonra gəlib çarpayılardan birinin üstünə yıxıldım və həmin anda da yuxuya getdim.

Oyananda gecə saat on bir idi. Bərk acmışdım. Qız stolun üstünə ağ süfrə salıb, pomidor salatı, göy-göyərti, kolbasa qoymuşdu.

– Dur gəl, – deyə o məni süfrəyə dəvət etdi, – yaxşı yatdın... Mən də bir az yatım.

Mən də qalxıb üzümə su vurdum. Sonra keçib oturaraq, yeməyə başladım və şam etdiyim müddətdə gözüm otağın aşağı tərəfinə qoyulmuş telefona zillənib qaldı. Elə bil ki, bu balaca qara qutunun içində mənə məlum olmayan başqa bir aləm var idi və o aləm böyük səbrlə mənim yeyib qurtarmağımı gözləyirdi. Elə bil ki, mən o aləmdə hər şeyin yalnız həyəcan, qorxu və iztirabdan ibarət olduğunu hiss edir, onları qarşılamağa, onlarla əlbəyaxa olmağa hazırlaşırdım. Bununla bərabər, mən özümdə təəccüblü bir arxayınlıq duyurdum. Mən təzə pomidor və tər xiyar dilimlərini duza batırıb yavaş-yavaş yeyir və buldozerçinin bu saat nələr çəkdiyini hiss edirdim. Bir an mənə elə gəldi ki, sağ ayağım o qədər bərk ağrıyır ki, elə bil, bu saat sümüklərim çilik-çilik olacaq və mən ayağımı qeyri-şüuri tərpədib irəli uzatdım. Ağrı-zad yox idi.

Qəribədir... Qız buldozerçi barədə bir kəlmə də danışmırdı. Lakin o mənimlə elə üsullu rəftar edirdi ki, elə bil, yaralı Qəribcan deyil, mənəm, hətta, mən özüm də buldozerçi barədə danışmaq istəmirdim.

Gözlərim isə telefon aparatında idi.

Yeyib doyandan sonra üstündən bir stəkan "Badamlı" içdim və öz aləmimdə bir qətiyyətlə qalxıb telefon aparatına yaxınlaşdım. Zəng eləyib şəfqət bacısı Cəvahir xanımı telefona çağırdım və Qəribin vəziyyətini soruşdum.

– Saat səkkizdə professor Möhsünzadə gəlmişdi... – deyə gənc qadın qətiyyətsiz səslə cavab verdi.

– Nə oldu? Professor nə dedi? – deyə mən sakit səslə soruşdum.

– İstəyirsiniz növbətçi həkimi çağırım... Onunla danışın.

– Çağırın.

Növbətçi həkim dəstəyi aldı:

– Allo... kimdir?

Mən cavab verdim...

– Professor hələlik qəti bir qərara gəlməmişdir. Səhər başqa professorla məsləhətləşəcək.

– Sizcə, ayağını kəsmək lazım gələcək?

– Məlum deyil.

Həkim bir qədər ara verdikdən sonra əlavə etdi:

– Professor Möhsünzadə kəsməyin tərəfdarı deyil. Səhər görək o biri həkimlər nə deyəcək.

– Yara nə vəziyyətdədir?

– Professor qanqrenin qarşısını almaq üçün hər nə lazım idisə elədi.

– Yaxşı! Sağ olun!

– Sağ olun!

Mən dəstəyi yerinə qoyub qıza baxdım. O da əllərini qoynunda çarpazlayaraq, başını azca yana əyib mənə baxırdı. Mən sakit halda pəncərənin qabağına keçdim. Dəniz tərəfdən sərin meh əsirdi. Şəhərdə saysız-hesabsız əlvan elektrik çıraqları yanırdı. "İnsan qanadsız quşdur, – deyə mən düşünürdüm, – srağagün bu vaxt biz, – mən, körpüsalanlar, bir də Adil Zoğallı meşəsindəydik. Qərib də yaralanmamışdı..."

"Qərib də yaralanmamışdı..." – mən öz-özümə təkrar etdim və birdən o günlər... tufan başlayana qədər keçən həmin günlər o vaxt fərqinə varmadığım bir aləm kimi təkrar qarşımda canlandı. Mən buldozerçinin hər bir hərəkətini, acığını, gülüşünü, təkəbbürünü, mehribanlığını heyrətli bir aydınlıqla təkrar-təkrar görürdüm. Mən bunların hamısını o günlərdən bütün xırda təfərrüatı ilə birlikdə görürdüm. Mənim zehnimdə Soltan da, Kərəmxan da, buldozerçi də, hətta, şofer Səməndər də bir saniyənin yüzdə, mində biri sürəti ilə bir-birini əvəz edirdi. Sonra onlar, Zoğallı meşənin, bizim hələ yarımçıq olan cavan

körpümüzün, dəniz kimi dərin, mavi dərənin, ondan o yana görünən dağların fonunda bir-birinə və mənə baxırdılar. Eynilə kino lentində olduğu kimi min cür vəziyyətdə baxırdılar. Min cür vəziyyətdə...

Sonra tufan başladı... və... və buldozerçi yaralandı. Qanqren nə demək olduğunu mən bilmirəm!.. Professor səhərə konsilium təyin etmişdir. Demək... Qız pəncərənin qabağına, mənim yanıma gələrək xəstə ilə danışırmış kimi yavaş və qorxaq səslə:

– Səriyyə xanım, – dedi, çay dəmləmişəm, gəlin bir stəkan için.

– İçək! – mən möhkəm addımlarla irəlilədim, stul çəkib oturdum.

Görünür, mənim gümrah cavabım qızın kefini açdı. O, ətirli çayı götürüb mənim qabağıma qoyaraq:

– Yaxşı ki, – dedi, – mən gəlmişəm... Paltarlarımıza güvə düşürmüş... şifonerin ağzını bağlayıb getmişdik.

– Gedəndə naftalin vursaydınız...

– Yadımızdan çıxıb, vurmamışıq. Gərək sabah hamısını havaya sərim... sonra da dərmanlayım.

Qızın bu sözləri mənə buradakı – Bakıdakı evimizi xatırlatdı. Biz yığışıb rayona gedəndə, şəhərdə qalan qış paltarlarımıza naftalin vurmaq lazım olduğunu Adil mənim yadıma salmışdı. Mən də onları çox həvəslə dərmanlayıb şifonerə yığmışdım. İndi mənə elə gəlir ki, bu iş çox uzaq bir zamanda olmuşdur. Elə bil ki, mən o paltarları cansıxıcı bir payız günündə dərmanlayıb getmişdim. O günün xatirəsi indi ağır bir daş kimi ürəyimi sıxırdı. Doğrudanmı, hər bir həvəsdən, xeyirli hesab elədiyin işdən axırda bu cür ağır, kədərli xatirədən başqa heç nə qalmır?! Doğrudanmı, məyusluq bizim son mənzilimizdir... Birdən bütün varlığıma qəribə bir hiss hakim oldu: mənə elə gəldi ki, əgər, buldozerçi sağalıb qalxsa, əgər, onun ayağını kəsməsələr, mən yenə də əvvəlki həvəslə gedib Adilin də, özümün də paltarlarımızı çıxarıb günə sərəcəyəm... Təzədən bir də dərmanlayacağam və Adilə hər şeyi bağışlayacağam... hər şeyi! Axı, mən nə zaman demişəm ki, Adil pisdir? Onu ağıllı, səliqəli eləyən mən olmamışammı? Dağların o tayındakı fermalara gedən yolun üstündə saldığımız o körpü nə üçün bizim bir-birimizdən soyumağımıza, hətta... hətta, bir-birimizə düşmən kəsilməyimizə səbəb olsun? Heç bu ağlabatan işdirmi?!

Qoy bircə bu Qəribcan sağalıb qalxsın. Hər şey o qədər yaxşı, o qədər fərəhli olacaq ki... Qoy bircə onun ayağı kəsilməsin... Mən Qəribcanı da götürüb gedəcəyəm univermağa... Adilə də... Soltana da... Kərəmxana da sovqat alacağam... Manikürçü qadını unutdum... Nə

sevimli qadındır... Qəribcan sağ-salamat qayıdanda o necə sevinəcək... Hamımız sevinəcəyik... Biz bir briqadayıq... Qəribcan bizim bir hissəmiz, bir parçamızdır. Ona bir şey olsa...

Mən qızın üzünə baxaraq fikrimə davam edirdim. "Biz dördümüz də adımızı bir kağıza yazıb, Zoğallı körpünün bünövrəsinə qoymuşuq. Dünənki o dəhşətli tufan bizim cavan körpümüzdən heç nə qoparıb apara bilmədi. Dördümüzün də adımız yazılmış o kağız bu saat şüşənin içində qupquru qalmaqdadır. Kim bilir, daha nə qədər bu cür dəhşətli tufanlar olacaq... Daha nə qədər sellər... sular axıb gedəcək. Lakin o kağıza heç nə olmayacaq. Hər zaman olduğu kimi, bu dəfə də o kağızın gözlərim qarşısında canlanması ilə birdən-birə ürəyimə anlaşılmaz bir vahimə çökdü və mənə elə gəldi ki, buldozerçiyə bir şey olsa, mən bədbəxt olaram. Uğursuz olaram. Həyatım qara bağlar. Kağızda onun adından sonra mənim adım gəlir. Demək, bu cür: "Soltan, Kərəmxan, Qəribcan və Səriyyə!" Hamı bilir ki, mövhumatçı deyiləm! Heç bir mövhumi şeyə də bənd olmaram. Lakin hər dəfə o kağız yadıma düşəndə, bu buldozerçi bütün qədd-qaməti ilə qarşımda canlanaraq, dərin və mükəddər baxışlarla düz gözlərimin içinə baxır və mənə elə gəlir ki, bu saat onun enli, qüdrətli sinəsindən bir "ah" qopub onu da, məni də məhv edəcək!

Vaxt olur ki, əllərimlə üzümü qapayaraq, başımı yastığın altına soxub onun bu nəzərlərindən qaçmağa can atıram... Halbuki adi həyatda bizim baxışlarımız çox nadirən qarşılaşır... Bəs, bu məlun hiss haradan mənə qənim kəsilmişdir?.. Nə üçün onun hər bir hərəkəti, məsələn, gecədən xeyli keçənə qədər çadırlarının yanında oturub papiros çəkməsi məni narahat edirdi?

Nə üçün mən ondan oddan-sudan qorxan kimi qorxurdum? Bu çox anlaşılmaz, qərib və əsassız bir qorxu idi... Bəzən onu qaşqabaqlı oturub papiros çəkən görəndə mənim vəziyyətim çox gülməli olurdu. Elə bil ki, kiçik, gücsüz bir heyvan, qəzəbli nəzərlərlə uzaqlara baxan bir pələngə rast gəlmişdir və əgər, bu pələng onun bir hərəkətindən xoşlanmazsa, onu parça-parça eləyər. Buna görə də, həmin məxluq gülür, zarafat edir, pələngin kefini açmağa çalışırdı. O, pələngdən aralanmağa, qaçıb yaxasını qurtarmağa cəsarət eləmirdi.

O qorxurdu...

Lakin budur: indi pələngin yaralanması ilə bu qorxu da anlaşılmaz bir narahatlığa, dəhşətli bir qeyri-müəyyənlik hissinə çevrilmişdir. Elə

bil ki, nə isə, ağır bir dərd, bir faciə, siyirməqılınc qarşımda dayanaraq, mənim öz həyatımı və aqibətimi təhdid edir!

Ərim, qohum-qardaşım, hətta, yaxın tanışım belə olmayan bu adamla aramdakı bu qəribə münasibətin səbəbi, sirri nədə idi? Bilmirdim... heç nə bilmirdim və bu dünyada onun sağalmasından, ayağının salamat qalmasından başqa heç nə istəmirdim. “Səadət” məfhumunun nə demək olduğunu, çox dumanlı şəkildə də olsa, indi hiss edirdim. Hiss edirdim ki, mənə heç bir qohumluq münasibəti olmayan bu adamın sağalması, ayağının kəsilməməsi mənim üçün həmin “səadət” deyilən şey ola bilər. Bu, mənim üçün bir kəşf idi və mən bu kəşfi gizlətməyəcəyimə and içirdim! “Təki o salamat qalsın! Gündüz yolda bir-iki dəqiqəliyə keçib onun yanında oturdum... Mən onun alışıb-yanan əlinə toxundum. Mən... ərli qadın olan mən, əsl səadətin və onu itirmək qorxusunun nə demək olduğunu həmin bu bir-iki dəqiqədə dərk etdim. Mən heç bir zaman, heç bir kəsi özümə bu qədər yaxın, bu qədər doğma hiss etməmişdim. Elə bil ki, mən Zoğallı körpüdəki həyatımızın ən əziz, ən qiymətli bir hissəsini – onun fərəhini, gözəlliyini özümlə birlikdə götürüb gedirdim... Və əgər, bunu itirsəm, məhv olaram. Nə üçün qız buldozerçi haqqında heç nə danışmır? Heç nə soruşmur?” deyə mən, təkrar-təkrar düşünürdüm. “Məgər qız, bilmir ki, buldozerçi mənim heç nəyim deyil və o (qız) bu barədə hər bir şeyi soruşa bilər? Lakin, onunla bərabər, mən özüm də buldozerçi barəsində heç nə danışmırdım. Danışmaq istəmirdim. Bayaq o tufanda Ağsu keçidini düşərkən zehnimdən, bir neçə anlığa da olsa, çox məsuliyyətsiz bir xəyal gəlib-keçdi; sel maşını yumalayıb uçuruma salsa, o buldozerçi də, mən də məhv olsaq, daha gözəl olmazmı?

“Bəs bu qız? Məgər, o bunun üçünmü bizə qoşulub?” Daha sonra düşündüm ki, “sel bizi aparaydı... Bu qız isə, sağ qalaydı...”

Bu dünyada bizim xəyalımızdan gəlib-keçənlərin hamısı ağıllı, əsaslı fikirlər olsaydı, nə vardı ki...

... Səhər düz saat doqquzda xəstəxananın qapısını kəsdirdim. “Mən buldozerçini selə axıtmaq üçün gətirməmişəm” deyə əsəbiliklə düşünür və konsiliumun qurtarmağını gözləyirdim.

Nəhayət, tanış şəfqət bacısı Cəvahir xanım gəlib mənim yanımdan keçdi.

– Professor Möhsünzadədir... – deyə Cəvahir xanım pıçıldadı və mən dərhal durub professorun ardınca yüyürdüm.

O, qayıdıb məni görərkən ayaq saxladı:

– Nə buyurursunuz? – deyib eynəyini gözündən götürdü.

Bu, otuz yeddi-otuz səkkiz yaşlarında çox yaraşıqlı bir adam idi.

– Professor, – dedim, – sizi saxladığım üçün üzr istəyirəm.

– Eybi yoxdur... Eybi yoxdur, – deyə o, sağ gözünü tez-tez qırpdı.

– Üçüncü palatadakı xəstənin vəziyyətini soruşmaq istəyirdim...

– Hansı xəstənin, Qərib Muradbəylininmi?

– Bəli.

– Siz onun nəyisiniz?

– Tanışı. Biz bir briqadada işləyirik. Onu Bakıya mən gətirmişəm. Rayonda ayağını kəsmək istəyirdilər.

– Bilirsinizmi, – professor əlində tutduğu eynəyinə baxaraq cavab verdi, – onlarda təqsir yoxdur... Qanqren çox sürətlə başlayıb. Buradakı professorlardan da kəsmək təklif eləyəni oldu... Ancaq... əksəriyyəti kəsilməsinə razı olmadı... Oğlanın çox güclü orqanizmi var... Mənim yeganə ümidim dava-dərmandan çox onun özünədir. Görək nə olur?! Biz nə lazımsa eləyəcəyik...

– Çox sağ olun, professor.

– Dəyməz. Borcumuzdur! Hələlik, – o, dönüb məndən aralandı.

Bəzən xarici görünüşünün adama qəribə təskinedici təsiri olur. Professorun qəşəngliyi və çox səmimi danışması məndə birdən ruh yüksəkliyi və ümid doğurdu.

Mən xəstəxanadan çıxıb taksiyə əyləşərək bazara getdim. Bir neçə cür meyvə alıb təkrar xəstəxanaya qayıtdım, Cəvahir xanımdan xahiş etdim ki, gətirdiklərimi xəstəyə çatdırsın.

O günün axşamı səbrimi basıb xəstəxanaya getmədim. Zəng də eləmədim. Gecədən xeyli keçənə qədər otaqda gəzinib, manikürçünün qızının baş-beynini apardım. Sonra soyunub çarpayıma uzandım və yalnız səhər açılanda yarım saata qədər mürgüləyə bildim. Mən artıq öz sirrimi özümdən gizləmirdim. Mən yeri-göyü köməyə çağıraraq, buldozerçinin sağalmasını istəyirdim.

Gündüz saat on birdə xəstəxanaya getdim və bütün cəsarətimi toplayaraq Cəvahir xanımı tapdım...

O məni görərkən:

– Bilirsinizmi, – dedi, – dünən xəstənin ayağını kəsdilər.

– Kəsdilər? – mən alacalanmış gözlərimi ona zillədim.

– Bağışlayın... demək istəyirəm ki, professor Möhsünzadə onun ayağının şişini bir neçə yerdən yardı. O qədər zərdab töküldü ki... İndi vəziyyəti yaxşıdır, hərarəti bir dərəcə düşüb. Bu səhər qəhvə içdi.

Mən birdən əllərimlə üzümü qapayaraq ağladım.
– Bay, nə oldu? Nə oldu? – deyə Cəvahir xanım təəccüblə soruşdu...
Donumun cibindən yaylığımı çıxarıb:
– Heç nə... – deyə gözümün yaşını sildim...
Cəvahir xanım mənim əlimdən tutaraq:
– Onu görmək istəyirsinizsə, gedək...
– Axı, bu gün görüş vaxtı deyil...
– Eybi yoxdur. Beş dəqiqəliyə olar...
O, arxası üstə uzanıb, əllərini başının altına qoymuşdu. Məni görərkən xəfifcə gülümsədi. Çoxdan idi ki, mən onun üzündə özümə aid mülayim ifadə görməmişdim.
– Hə, necəsiniz, yoldaş buldozerçi?..
– Deyəsən, daha kəsəsi olmadılar.
– Elə deyirlər...
– Amma yaman qaçdıq ha... – deyə o, təkrar gülümsündü.
Ordakı üç xəstə maraq içində mənə baxırdı.
Onlardan yaşlı bir kişi mənə müraciətlə:
– Deyir, Ağsu keçidində az qala sizi sel aparırmış...
– Elə bir şey var idi, – deyə mən zarafatyana cavab verdim, – ancaq qaçıb qurtardıq.
– Bizimki qaçmaqdan gəlib... – Qəribcan eyni təbəssümlə mənə baxırdı.
Həmin yaşlı xəstə:
– Vallah, qoçaq qızsanmış, – dedi.
– Çox tərifləməyin, nəzərlərsiniz...
– Allah eləməsin! Mənim gözümdə elə şey olmaz.
Onunla yanaşı yatan oğlan gülümsədi. Digər xəstə rus olduğundan, görünür, bizim söhbətimizi başa düşmürdü.
Birdən o, yastığa dirsəklənərək, buldozerçidən soruşdu:
– Vaşa jena?
Qəribcan qulaqlarına qədər qızarıb məzəmmətlə rusa baxdı.
Mən gülərək:
– Net, – dedim. – Ne jena.
– Prostite, – o, təkrar yerində uzandı.
– İndi ayağınız ağrımır?
– Ağrıyır. Ancaq... dünənki ilə müqayisə eləyəndə babatdır.
Yaşlı xəstə:

– Elə deməyinə baxmayın, – dedi, – o cür yara yaman bərk ağrıyar... Sizə zarafat gəlir...

Mən beş dəqiqə əvəzinə on dəqiqədən artıq oturaraq, palatadan çıxdım.

– Amma yaman oğlanmış, – deyə Cəvahir xanım nağıl edirdi. –Ayağını bir o qədər doğradılar, bir dəfə “uf” demədi. Bihuşdarı verməyə də qoymadı. Özü də gərək ki, mühəndisdir... Eləmi?

– Xeyr, buldozerçidir.

– Sizin qohumunuzdur?

– Yox! Mənim heç nəyim deyil.

“Qəribədir... Nə üçün hamı bu sualı verir? Nə üçün hamı bu sualı verir? Nə üçün hamı onu mənim nəyimsə hesab edir?”

Mən Cəvahir xanımdan ayrılandan sonra poçta gedib Adilə belə bir teleqram vurdum:

“Mən sağ və salamatam. Xahiş edirəm Soltanla Kərəmxana deyəsən ki, Qəribin vəziyyəti yaxşıdır. Narahat olmasınlar. Mənim ünvanım belədir...”

Sonra bazara gedib, ət, pomidor, göy-göyərti, meyvə alıb taksidə qızgilə gəldim.

O mənə diqqət yetirib:

– Deyəsən, oğlan yaxşıdır?

– Yaxşıdır, – deyə mən çox ürəklə cavab verdim.

Biz yaxşı bir yemək hazırladıq. Buldozerçinin payını çəkib soyuducuya qoyduq və səhər tezdən götürüb xəstəxanaya getdik. Bu gün görüş vaxtı olmadığından, Qəribin yanına buraxmadılar. Dostum Cəvahir xanım da bu gün istirahətdəydi. Apardığımız şeyləri başqa bir şəfqət bacısı ilə göndərdik. O, Qəribdən balaca bir məktub gətirdi. “Nə üçün zəhmət çəkirsiniz... Burada bizə hər şey verirlər. Qılçam yaxşıdır. Sağ olun!”

Mən məktubu bərkdən oxuyub qurtaranda, qız, buldozerçiyə müraciət edirmiş kimi, sevinclə səsləndi:

– Siz də sağ olun!

Axşamçağı biz gülüb, danışa-danışa dəniz kənarındakı açıq kinoteatra getdik. “Vaterloo körpüsü...” adlı ingilis filmi göstərilirdi. Filmdə iki gənc bir-birini sevir. Sonra oğlan qızdan ayrılaraq, cəbhəyə gedir və hiss edirsən ki, bu gediş əbədidir. Yəni, sevgililər bir də heç vaxt görüşməyəcəklər. Oğlan müharibəyə gedəndən sonra qız tək qalıb onu xatırlayır. Bu an manikürçünün qızı özünü saxlaya bilməyib ağladı. Mən gülümsəyərək:

– Dava vaxtı bundan da dəhşətli şeylər olub.

O, gözünün yaşını silərək:

– Çox acı xatirədir, – dedi, – yazıq qız...

Mən:

– Eybi yoxdur, – dedim, – Jorj Sand deyib ki, xatirə bizim ruhumuzun ətridir.

– Daha indi elə deyil! Əgər, Jorj Sand bu dünyada necə xatirələr olduğunu bilsəydi, bəlkə də elə deməzdi.

Qız dərindən nəfəs alıb susdu. Sonra həyəcanla davam etdi:

– Elə xatirələr var ki, onlar ömrümüz boyu bizə əzab verir. Qarşımıza çıxan hər şirin günə bir damcı zəhər qatır. Eh... Jorj Sand...

Mən dinmədim. Doğrusunu söyləsəm, mənim həyatımda "ruhumun ətri" sanacağım elə bir xatirə də yox idi. Mənim indiyə qədər olub keçmiş ömrümdə hər şey lap adi və sadə idi. Lakin, doğrudan da, dünyada çox ağır xatirələr olduğunu eşitmişdim. Və and içmişdim ki, əgər, özümdən asılı olsa, həyatımda heç bir acı xatirəyə yol verməyəcəyəm. Mən nənələrim kimi eləməyəcəyəm. Mən tamam ayrı cür yaşayacağam. Mən tamam başqa bir zamanın qızıyam. Mən süni peyk düzəldib səmaya buraxıram və bu peykin sürəti qarşısında zaman-məkan öz hökmünü itirir. Biz gələcəyə körpüsalanlarıq. Biz hələ çox körpülər salacağıq! Mən gələcəyə doğru hərəkət edərkən yaşayıram. Mən bu işin, bu fəaliyyətin bir hissəsiyəm.

Birdən, elə buradaca, mənim qəlbimi hələ səbəbini dərk etmədiyim bir fərəh bürüdü. Sonra buldozerçinin bayaqkı məktubu yadıma düşdü. Daha sonra onun tezliklə sağalacağını və hər ikimizin yenidən körpü salmağa qayıdacağımızı düşündüm.

Mənim xatirələrim başqa planetlərə göndərdiyimiz peyklərin saçdığı işığa bənzəyir...

Səhəri gün Adildən belə bir teleqram aldım:

"Sənin hərəkətlərin çox təəccüblüdür. Maşınla birlikdə dərhal geri qayıtmağını tələb edirəm".

– Kimdəndir? – deyə qız soruşdu.

Mən teleqramı ona verərək, güzgünün qabağına keçib saçlarımı düzəltdim. Mən güzgüdən qızı görürdüm. O, teleqramı nəzərdən keçirəndən sonra onu üsulluca stolun üstünə qoyub mətbəxə getdi və iki stəkan çayla geri qayıdaraq, bu barədə bir kəlmə belə soruşmadı. Ağıllı, həssas adamlara eşq olsun!.. Deyirlər ki, tünd çay əsəbləri müəyyən dərəcədə sakit edir... Mən çayımı isti-isti içdim. Sonra özüm qalxıb birini də tökdüm.

Mən çaydan sonra respublika yollar idarəsinin rəisinə zəng eləyib buldozerçinin başına gələn əhvalatı və mənim onu götürüb Bakıya gəlməyə məcbur olduğumu söylədim.

– Siz çox yaxşı hərəkət eləmisiniz, Səriyyə xanım, – deyə rəis cavab verdi, – mən sizə ayrı nə deyə bilərəm ki... Əgər, xəstəyə bir şey-zad lazım isə...

– Xəstəyə heç nə lazım deyil. – Bircə mən sizdən onu xahiş etmək istəyirdim ki, bizim idarə maşınında gəlməyimizi üzürlü hesab edəsiniz.

– O barədə sizə kim bir söz deyir ki?

– Heç kim.

– Deməli, işinizi ehtiyatlı tutursunuz... – deyə rəis telefonda güldü. – Mən sizin “QAZ-69”da gəlməyinizi üzürlü hesab edirəm. Bir də ki, maşının sahibi sizin yoldaşınızdır...

– Mən istəyirəm ki, bu işin üstündə Adilə bir söz deyilməsin...

– Deyilməz.

... Sonra dərhal poçta gedərək Adilə bir teleqram vurdum: “Mən buldozerçinin sağalmasını gözləyirəm. Onunla birlikdə gələcəyik. Maşın barədə narahat olma. Körpüsalanlara salam”.

... Mən bilirdim ki, Adilin ixtiyarında başqa maşınlar da var... Bizim “QAZ-69”u gətirməyimiz onun işlərinə maneçilik törətməz. Lakin, bununla bərabər, Adil kimi işgüzar adamın maşınının burada olması məni sıxırdı. Ona görə də, istədim maşını elə lap bu gün qaytarıb aparım. Lakin aparmadım... Buldozerçini bu böyük şəhərdə o cür ağır halda qoyub gedə bilmədim. Bəlkə bu mənim tərəfimdən bir zəiflik idi... Bilmirəm...

Qız özünün və anasının paltarlarını sərib naftalin vuraraq yenidən şifonerə yığdı. Sonra biz birlikdə ev-eşiyi ürəyimiz istəyən kimi təmizlədik. Əyin paltarlarımızı yuyub ütülədik. Axşam xəstəxanaya zəng eləyib dostum Cəvahir xanımı telefona çağırdım. Əvvəlcə onun kefini soruşdum.

– Çox sağ olun! Təşəkkür edirəm, – dedi.

O, mənim ikinci sualımı gözləmədən əsl mətləbə keçdi:

– Xəstənizin kefi lap yaxşıdır. Ayağının şişi tamam yatıb. Bu gün hərarəti normal olub... Daha nə istəyirsiniz!?.

– Sizin sağlığınızı!

Cəvahir xanım şaqqıldayıb güldü:

– Qəribcana nə deyim?

Mən zarafatyana:

– Siz onun adını nə yaxşı öyrənmisiniz!

– Mən qəşəng xəstələrin adını çox tez öyrənirəm...

– Doğrudanmı?
– Doğrudan. Yoxsa, qısqanırsınız?
– Qısqanmıram.
– Qəribcana deyəcəyəm ki, siz yaman qısqancsınız.
– Sizdən inciyərəm...
Cəvahir xanım təkrar bərkdən gülərək:
– Qorxmayın, – dedi. – Biz şəfqət bacıları sirr saxlayan oluruq.
– Bizim heç bir sirrimiz yoxdur.
Cəvahir xanım məzəli bir əda ilə sözləri uzadaraq cavab verdi:
– Məsəl üçün deyirəm. Bu gün baş həkim özü də gəlib sizin xəstənizi yoxladı.
– Çox sağ olun! Xahiş edirəm məndən Qəribə salam deyəsiniz.
Sonra mən qızgilin telefon nömrəsini söyləyərək xahiş etdim:
– Bəlkə, bir şey-zad lazım oldu, zəng elətdirsin.
– Bunlar hamısı baş üstə! Sonra nə qulluğunuz var?
– Qulluq sahibi olasınız.
Qız divanda uzanıb mənə qulaq asırdı. Mən telefonun dəstəyini yerinə qoyub, onun yanında əyləşdim. Sonra dedim:
– Dur gedək Dağüstü parka.
O mənə uzun bir nəzər salaraq gülümsədi. Sonra əlimdən tutaraq, özünə tərəf çəkib çənəmdən öpdü və rus dilində:
– Sən çox gözəlsən, – dedi.
– Yalan demə, sən məndən gözəlsən, – deyə mən onun qəşəng, çılpaq qoluna bir şapalaq çəkdim.
– O! – deyə o, şapalaq dəyən yeri ovuşdurdu.
Mən sıçrayıb kənara qaçdım.
– Dur... dur gedək Dağüstü parka, mənim mələyim, – mən kavaler rolu oynayaraq, yaxınlaşıb onun qolundan yapışdım.
Rayondan gələndə paltar gətirmədiyimdən, qız özününküləri göstərib:
– Hansını ürəyin istəyir, gey, – dedi.
İkimiz də qolları çiyninə qədər açıq, nazik don geyib yüngül ətir vurduq (təxminən bir boyda, bir biçimdə olduğumuzdan paltarlar mənə yaxşı gəlirdi). Həyətdə saxladığımız “QAZ-69”a baş çəkəndən sonra dəniz kənarı ilə gəzə-gəzə gəlib funikulyorla Dağüstü parka qalxdıq. Gün batıb, axşamın qara sərini düşmüşdü. Biz oleandr, akasiya ağacları arasında xeyli gəzəndən sonra yay binasında verilən estrada konsertinə getdik. Əvvəlcə parlaq qara saçları, qara bığı olan

bir artist səhnəyə çıxıb, Üzeyir Hacıbəyovun məşhur "Məşədi İbad" operettasından Məşədi İbadın Rüstəm bəyin qızını görüb-bəyənməyə gəldiyi yeri oxudu. Artistin ifası ikimizin də xoşuna gəldi.

– Qara kostyumla ağ köynək, ağ qalstuk ona çox yaraşır – deyə qız gülümsəyərək hərarətlə əl vurdu.

Sonra, o zaman çox dəbdə olan gənc xanəndə qadın gəldi. Tamaşaçılar onu böyük sevinclə qarşıladılar. Qadın gülümsəyərək zalı mehriban nəzərlərlə süzdü. Sonra qədim Azərbaycan xalq mahnılarından "Küçələrə su səpmişəm"i oxudu. Camaat uzun zaman əl vurdu. Xanəndə qadın bu dəfə müasir Azərbaycan bəstəkarlarının əsərlərindən oxudu. Onun səsi təravətli və cazibədar idi. Ürəkdən oxuyurdu. Lakin, doğrusunu deyim ki, özü həddindən artıq kök olduğundan, mahnıları mənə o qədər güclü təsir bağışlamırdı. Mən kök qadınları sevmirəm. Mənə elə gəlir ki, onların bədənləri ilə bərabər ruhları da piylənir.

Konsertdən sonra biz yenə parkda gəzdik. Hava sərin və ətirli idi. Ətrafda çoxlu qərənfil, ətirşah əkilmişdi. Dənizin üzərində tez-tez əlvan işıqlar yanıb-sönürdü. Lap uzaqda, tamam çılçıraq içində olan bir gəmi dayanmışdı. Mən bərk acmışdım. Açıq havadakı restorana işarə ilə:

– Gəlsənə, gedək şam eləyək, – dedim.

– Nə olar, gedək!

Restoranın dənizə baxan tərəfindəki stullarda əyləşdik. Çox göyçək xidmətçi oğlan dərhal bizə yaxınlaşıb gülümsədi və menyunu qabağımıza qoyaraq, nəzakətlə dayanıb gözlədi.

Menyunu götürüb nəzərdən keçirərək, qıza uzatdım. O, menyunu kənara qoyaraq:

– Sən nə istəyirsən, mənə də ondan gətirsin, – dedi.

– Kabab necədir?

– Yaxşıdır.

Mən:

– Dörd pomidorlu kabab, təzə salat, iki şüşə də mineral su, – dedim.

– Baş üstə, – deyə oğlan yazıb götürdü.

Sonra məndən soruşdu:

– Kababı qanlı istəyirsiniz, yoxsa quru?

– Kabab qanlı, igid canlı! – deyə mən zarafatyana cavab verdim.

Oğlan gülümsəyərək:

– Bəs siz? – deyə qızdan soruşdu.

– Mənim üçün quru.

– O da baş üstə, – xidmətçi oğlan qaça-qaça getdi.

Bizim yaxınlığımızdakı stolun arxasında iki cavan oğlan oturub kababla qırmızı şərab içirdi. İkisi də son dəbdə geyinmişdi... Qabaqlarında üç boş şüşə vardı. Bizi görərkən, onlardan sarı, qıvrım saçlarını yandan ayıraraq Peçorinsayağı daramış qırmızısifət oğlan, əyilib yoldaşına nə isə pıçıldadı. Sonra ikisi də bizə baxıb gülümsədi. Biz özümüzü o yerə qoymadıq.

Oğlan bizim üçün kabab və mineral su gətirdi. Biz yeyir və dənizə baxırdıq. Sərin yel əsirdi. On üç-on dörd gecəlik Ay sanki dənizdən qalxırdı. Doğrusu, əgər, qonşularımız olmasaydı, biz özümüzü çox yaxşı hiss edərdik. Lakin qırmızısifət oğlan bizə göz verib işıq vermirdi. Biz mineral su tökdüyümüz stəkanları ağzımıza aparanda qırmızısifət oğlan da öz qədəhini yoldaşının qədəhi ilə bərkdən toqquşdurur, sonra yuxarı qaldıraraq, bizə baxıb, bir az çıxıq gözlərini süzdürüb gülümsəyir və “sağ olun” mənasında başını tərpədirdi. Biz öz aramızda danışıb-gülərkən o da gülümsəyir, gözəl qadınlar yaradan təbiətin sağlığına bərkdən tost deyirdi.

Qız üz-gözünü turşudaraq:

– Bu oğlan heç xoşuma gəlmir, – dedi, – başa düşmürəm bizi kim hesab edir.

– Fikir vermə, – dedim, – qoy cəhənnəm olsun!

Birdən qırmızısifət oğlan işarə ilə bizim xidmətçini çağırıb qulağına nə isə dedi. O bizə baxıb, bir neçə saniyə tərəddüd içində dayandı. Qırmızısifət oğlan daha nə isə pıçıldadı. Xidmətçi oğlan onlardan ayrılıb getdi və əlində bir şüşə konyakla bir boşqab konfet, geri qayıdıb bizə yaxınlaşaraq pıçıldadı:

– Bunları sizin stola göndəriblər.

Mən də eyni yavaş səslə:

– Qaytar! – deyə ona əmr etdim.

O heç bir söz demədən dərhal qayıdıb getdi. Mən güman etdim ki, qırmızısifət oğlan bərk utanacaq, lakin o, qızarmış çıxıq gözləri ilə mənə baxıb gülümsəyərək, guya, incimiş halda başını buladı. Mən qəsdən tələsmədən yeyirdim. Sonra haqq-hesab tələb edərək, cavan xidmətçinin pulunu verdim. O bizə təşəkkür edib, utancaq bir ifadə ilə üzr istədi:

– Bayaqkı konyak məsələsində məndən inciməyin, mən onlara dedim ki, yaxşı deyil... ancaq...

– Eybi yoxdur, – dedim, – sağ olun.

...Biz restorandan çıxıb xiyabanla bir az getmişdik ki, oğlanlar arxadan özlərini yetirdilər.

Qırmızısifət oğlan gülümsəyərək:

– Gözəl xanımlar, – dedi, – konyakı rədd elədiniz, heç olmazsa, sizi şəhərə qədər ötürmək şərəfinə nail olmağımıza icazə verin.

Biz cavab verməyib, yolumuza davam etdik. Lakin qırmızısifət oğlan qırsaqqız olub əl çəkmədi:

– İkiniz də incəbel... ikiniz də gözəl. İnsafdırmı ki, bu romantik gecədə... tək gəzəsiniz...

Sonra o zaman dəbdə olan bir mahnını asta-asta doğramağa başladı. O, arada mahnını kəsib bir söz atır, sonra yenə oxuyurdu. Mən qəflətən ayaq saxlayıb geri döndüm və başını Peçorinsayağı daramış oğlanın içkidən daha da pörtmüş üzünə dalbadal, tapança kimi açılan iki karlı sillə vurdum. O, gözlərini ağardaraq, bir neçə saniyə təəccüblə mənə baxdı. Sonra:

– Siz gözəl xanım yox, bəşəriyyətin xuliqan üzvüsünüz, – dedi.

Biz bir qədər aralanandan sonra mən onun bu qəribə ifadəsinə bərkdən güldüm. Qız da gülüb dedi:

– Amma vurdun ha...

Sonra biz Dağüstü parkdan düşüb sahillə gəzə-gəzə evə getdik. Şəhər isti idi. Mən bir az sərinləmək üçün pəncərənin qabağında oturdum. Küçədə gediş-gəliş azalırdı. Artırmalarda açılıb-bükülən çarpayılarda uzanmış adamlar görünürdü. Hər tərəfdə şəhər kənarına məxsus bir sakitlik var idi. Yuxarıda, Dağüstü parkda isə saysız-hesabsız işıqlar eyni təntənə ilə yanırdı. Bayaq bizim əyləşdiyimiz restoranın işıqları da aydınca seçilirdi. Yəqin ki, adamlar hələ yeyib-içməkdəydilər. Bizim küçədə isə, demək olar ki, hamı yatmışdı. Həyat həmişə qəribə ziddiyyətlərdən ibarətdir. Buldozerçi də yatağındadır... Bəlkə də, ayağı bərk ağrıyır. Başını Peçorinsayağı daramış oğlan təkrar gözlərim qarşısında canlandı. Onun bizimlə tanış olmaq üçün elədiyi gülünc hərəkətlər birdən-birə mənə yazıq göründü. "Nə üçün biz insanlar bu həyatdan bir şey qoparmaq üçün bu cür ikiüzlülük edirik... Yalançı, bayağı sözlər danışırıq... Yalandan gülümsəyirik... Yalandan tərifləyirik... Doğrudanmı, bunlarsız mümkün deyil?.." Madam ki, mən bütün bunlara nifrət edirəm, demək mümkündür. Məgər, mən öz-özlüyümdə həqiqi deyiləmmi? Məgər, mənim intibahlarımla da hesablaşmaq olmazmı? Doğrudur, mən nə aliməm, nə də filosof. Lakin mən hər şeyi aydınca görüb-duymağı bacaran normal bir insanam. Mən öz hisslərimlə hesablaşmaya bilmərəm. Buna görə də, mən bayaqkı qırmızısifət oğlanı sillələməkdə özümü

tamamilə haqlı hesab edirəm. Saxtakarlığı, rəzilliyi, ikiüzlülüyü sillələmək lazımdır. Çünki bunlar təbiətin ahənginə ziddir. Bunlar əvvəllər yox idi. Gec-tez də olmamalıdır. Adəmin oğlanları əvvəl kin, intiqam, acgözlük kimi hisslərin nə demək olduğunu bilmirdilər. Saxtakarlığa da ehtiyacları yox idi. Bu, əfsanə də olsa, yaxşı düşünülmüşdür.

... Mən səhər gedib Qəribcan üçün meyvəylə bərabər iki ağ tor köynək, bir neçə əl yaylığı aldım. Havalar bərk isti keçirdi. Xəstəxana köynəyinə nisbətən tor köynəklər sərin olardı. Buldozerçinin isti ilə arası olmadığını bilirdim.

Görüş növbəsi gözləyirdik. Əyinlərində ağ xalat olan baş həkimlə professor Möhsünzadə otaqların birindən çıxıb yanımızdan keçdikləri zaman baş həkim məni görüb ayaq saxladı. Möhsünzadə də dayanıb bizə baxdı.

Baş həkim:

– Salam, kişi qızı, – deyə bərkdən səsləndi.

Sonra:

– Sizin oğlan yaxşılaşır, – deyə əlavə etdi.

– Çox sağ olun!..

– Professora təşəkkür eləyin, – o, Möhsünzadəni göstərdi, – ancaq professora!

– Professor bizim boynumuza elə bir haqq qoyub ki...

– Doğrudur! Tamamilə doğrudur, – deyə baş həkim təsdiq etdi.

Professor qızarıb uşaq kimi gülümsədi.

Baş həkim soruşdu:

– Usta necədir?

"Yaxşıdır. Sizə salamı var" demək istədim. Yalan satmağa üzüm gəlmədi.

– Atamgili hələ görə bilməmişəm...

– Nə üçün? – baş həkim təəccüblə üzümə baxdı.

– Bağdadırlar. Xəstəyə başımız qarışdı...

– Xəstənin kefi doxsan doqquzdur. Get atangili gör. On beş dəqiqədən sonra bizim görüş növbəmiz çatdı.

Qəribcan bizi görəndə dikəlib oturdu. Əllərini yanlardan yerə dirəyib qalxarkən üzünün qızarmasından yaralarının hələ ağrıdığını hiss elədim. O biri xəstələrlə də köhnə dost kimi salamlaşdım. Sonra əlimizdəki şeyləri dolabçanın üstünə qoyaraq stul çəkib oturduq.

– Yaman isti keçir, – deyə Qəribcan şikayətləndi.

– Eybi yoxdur, – dedim, – Bakının istisi xeyirlidir.

– Uşaqlardan nə xəbər var?

– Hələlik bir şey yoxdur.
– Yəqin ünvanı bilmirlər.
– Yox. Mən Adilə yazmışam.
– “QAZ-69” buradadır?
– Buradadır.
– Bəlkə siz qayıdasınız...
– Biz bir az gəzmək istəyirik. Mən Bakı sarıdan çox qəribsəmişəm..
– Siz bakılısınızmı? – deyə yaşlı xəstə soruşdu.
– Bəli!
– Qayıtsanız yaxşıdır, – deyə Qəribcan təkrar etdi. – Maşın işdə lazım olar.
– İşdə maşın çoxdur. Mən burada rəisin özündən də icazə almışam. Nə üçün sən bizi Bakıdan qovmaq istəyirsən?.. (Mən birinci dəfə ona “sən” dedim).
– Siz öz evinizə düşmüsünüz?
– Yox! Qızgilə!
Yaşlı xəstə bizim söhbətimizə çox maraqla qulaq asırdı.
– Tələsik gəldiyimiz üçün mən evin açarını götürməmişəm.
O susdu. Üzündəki qayğı və kədər məni darıxdırdı.
– Nə vaxt çıxırsan?
– Məndən olsa, bu gün.
Qız:
– Yox, – dedi, – qoyun yaranız əməlli sağalsın.
– Əlbəttə... Ancaq bura yaman isti olur. Yaşlı xəstə əlavə etdi:
– Bakı – Bakıdır.
– Bu səhər professor dedi ki, iki gündən sonra ağacla gəzmək olar.
– Xəstəxananın yaxşı bağçası var.
– Bircə tez sağalaq gedək, – deyə yaşlı xəstə cavab verdi. – Bağçasını-zadını istəmirik.
Qərib soruşdu:
– Bütün günü neyləyirsiniz?
– Gəzirik, – dedim, – istirahət edirik. Dünən axşam Dağüstü parka getmişdik.
Birdən qız gülərək əli ilə ağzını tutdu. Mən də güldüm.
– Nə olub? Deyəsən, sizdə bir iş var...
– Heç bir şey.
– Yenə...
– Mən bir oğlana bir-ikisini çəkmişəm... – deyə ancaq onun eşidəcəyi yavaş səslə cavab verdim.

– Nə üstə?

– Zəhləmizi aparırdı, söz atırdı.

– Nə cür çəkdin? – Qərib birdən-birə mənə "sən" deyə müraciət edərək, maraqla soruşdu.

– Yaxşı qırmızı sifəti var idi. İki sillə tutuzdurdum.

– Dağüstü park sərin olur.

Mən gətirdiyim əl yaylıqlarından birini çıxarıb ona verərək:

– Üzünü sil, – dedim, – tərləmisən.

O, yaylığı alıb alnını, boynunu sildi:

– Dünyada bu tərləməkdən də dilxorçu şey yoxdur.

Yaşlı xəstə:

– Elə demə, oğlum, bu dünyada mənasız şey yoxdur. Tərləmək də lazımdır.

– Elədir, – deyə mən təsdiq etdim.

Sonra qalxıb ayrıca kağız torbada gətirdiyim gilas və gilənarı digər üç xəstənin arasında böldüm.

– Lazım deyil. Nə zəhmət çəkirsiniz... – deyə cavan xəstə etiraz etdi.

– Zəhməti yoxdur! Burada yenə var.

– Çox sağ ol, qızım!

– Papiros çəkəniniz var?.. – deyə yaşlı xəstədən soruşdum.

– Qriqori İvanoviç çəkir.

Mən Qəribcan üçün aldığım "Kazbek"dən üç qutu götürüb ona verdim.

– O, spasibo, – Qriqori İvanoviç gülümsədi və bir papiros çıxarıb ağzına qoyaraq yandırdı. – Siz haradan bildiniz ki, bizim papirosumuz qurtarıb?

– O, sehrkardır, hər şeyi bilir... – deyə Qəribcan da papiros çıxarıb yandırdı.

– Təəssüf ki, – yavaş səslə cavab verdim, – mən çox şeyi bilirəm... Ancaq bilməsəydim, yaxşı olardı.

Onun üzü dərhal ciddi ifadə aldı.

Biz qalxdıq.

– Nə tələsirsiniz... – deyə yaşlı xəstə mənə baxdı.

– On dəqiqəliyə icazə almışıq... Oturduğumuz iyirmi dəqiqədən artıqdır. Sağ olun!

– Siz də sağ olun!

Biz palatadan çıxdıq. Evə gələndə qonşu mənə balaca bir məktub verdi. Adil yazırdı:

"Mən bu səhər gəlmişəm. Saat üçə qədər evdə olacağam".

Qızla nə vaxt görüşəcəyimizi şərtləşəndən sonra "QAZ-69"a əyləşib öz evimizə getdim. Maşını həyətdə qoyub yuxarı çıxdım. Əvvəl

dediyim kimi, biz təzə tikilmiş binalardan birində olurduq. Öz qapımıza çatıb dayananda mənə anlaşılmaz soyuq bir hiss hakim oldu və səbəbsiz halda hirsləndim. Mən, yuxarı mərtəbədən enən yaşlı qadının salamına qaşqabaqla cavab verib düyməni basdım. İçəridə yavaş ayaq səsləri eşidildi. Sonra qapı üsulluca açıldı.

Mən içəri daxil olub eyni soyuq ifadə ilə:

– Salam, Adil, – dedim, – nə vaxt gəlmisən?

– Bu səhər. Sənə yazmışdım ki...

– Hə, yazmışdın.

Mən hansı bir ağır duyğunun təsiri iləsə otaqda heç nəyə nəzər salmırdım. Divanda əyləşib saçlarımı darayır və pəncərədən görünən Dağüstü parka baxırdım. Lakin mən Adilin necə həyəcanla var-gəl elədiyini görürdüm. O, birdən bufetin qabağında ayaq saxlayıb, kəskin hərəkətlə mənə sarı döndü. Mən də nəzərlərimi Dağüstü parkdan çəkib ona baxdım. O, görünür, qəzəbini zorla boğmağa çalışaraq:

– Bu nə işlərdir sən mənim başıma gətirirsən? – dedi.

– Mən onun ayağının kəsilməsinə razı ola bilməzdim, Adil!

– Cəhənnəm olsun onun ayağı da... sən də!

Mən düz onun gözlərinin içinə baxıb, cavab vermədim.

– Nə üçün onu yoldaşlarından biri gətirmirdi, sən gətirirdin?

– Mən də onun yoldaşlarından biri deyiləm?

– Sən, hər şeydən əvvəl, ərli qadınsan! Mən sənin ərinəm! Sən, heç olmazsa, məndən icazə almalı idin!

– Sən yox idin, dedilər axşam qayıdacaqsan.

– Niyə gözləmirdin?

– Gec olardı. Qanqren çox sürətlə artırdı.

– Bəs, nə üçün ölmədi?

– Həkimlər və mən qoymadıq.

– Sən əclafların əclafı imişsən.

– Bu sözlər mənasızdır. Adil, mən səni sevmirəm.

O, yemək stolunun üstündəki büllur vazanı qapıb var gücü ilə başıma tolazladı. Əgər, başımı bir an gec qaçırsaydım, şübhəsiz, işim bitmişdi. Vaza divara dəyib çilikləndi. Mən qalxıb ona tərəf bir-iki addım ataraq dayandım.

– Bunlar hamısı nahaqdır, Adil! Mən heç bir zaman səni qəhrəman hesab eləməmişəm. “QAZ-69” aşağıdadır. Bu ev-eşikdən isə, öz əyin paltarımdan başqa heç nə istəmirəm.

Sonra tələsmədən yataq otağına keçərək şifoneri açıb paltarlarımı vaxtilə evimizdən gətirdiyim böyük çamadana yığmağa başladım. Mən Adilin divanda oturub iki əli ilə başını tutduğunu güzgüdə görürdüm. Bu paltarları mənə Adil almışdı. Lakin bunların əvəzində mən evimizdən gətirdiyim şeyləri götürmürdüm.

Çamadanı və qış paltomu götürüb təkrar yemək otağına keçdim.

– Hələlik, Adil!

O, başını qaldırıb əvvəl mənə, sonra çamadana, sonra yenə də mənə baxdı. Onun gözlərində birdən-birə yaranan qorxmuş, mülayim ifadə məndə ikrah hissi doğurdu.

– Yaxşı, çamadanı yerə qoy. Lazım olsa, sonra gedərsən.

– Yox, Adil, elə indi getmək lazımdır.

– Sən məni camaat içində, təşkilatlar qarşısında biabır elədin! Mən sənə nə eləmişdim?

– Mən səni biabır edəcək heç bir pis iş görməmişəm, Adil!

O, acı-acı gülümsədi.

– Hələ bir danışırsan da...

– Görünür, mən sənin tələb etdiyin kimi hərəkət eləyə bilmirəm. Heç bir zaman da eləyə bilməyəcəm.

– Sən mənə öz xoşunla gəlmişdin... Səni heç kəs məcbur eləməmişdi.

– Doğrudur!

– Sən, hətta, özünü elə göstərirdin ki, guya... guya məni sevirsən də...

– Mən özümü elə göstərmirdim, Adil! Mən, doğrudan da, elə güman edirdim.

– Bəs, sonra nə oldu? – deyə məzlum bir ifadə ilə soruşdu.

Mən ona uzun və kəskin bir nəzər salaraq:

– Sonra nə olduğunu bilmirəm, Adil! Ancaq mən səni daha istəmirəm.

– Mən sənə nifrət eləməliyəm.

– Ola bilər.

– Sənin bədbəxtliyin orasındadır ki, gələcəyini görə bilmirsən.

– Bizdən hər birimiz gələcəyi ayrı cür görürük. Mən hiss edirəm ki, biz heç bir zaman gələcəyə eyni gözlə baxa bilməyəcəyik.

Bir qədər susaraq əlavə etdim:

– Gələcək isə, həyat deməkdir. Ona görə də, biz ayrılmalıyıq. Sağol!

Mən çamadanı götürüb qapıdan çıxdım.

*1960*

# XAN QIZI GÜLSƏNUBƏRLƏ TARZƏN SADIQCANIN NAĞILI

Üçüncü yay gecəsi idi ki, şəhərin sakitliyi içində Xan qızı Gülsənubər tarda çalınan o muğamı eşidirdi. Və üçüncü yay gecəsi idi ki, Xan qızı Gülsənubərin yuxusu göyə çəkilmişdi. O tarçalan oğlanın gözlərindəki qəribə ifadə ilə çaldığı muğamın söylədiyi hekayət arasında ayrılmaz bir bənzərlik var idi. O hekayətin nədən ibarət olduğunu qız dərk eləyə bilmirdi. Lakin hiss edirdi ki, bu, nə isə, uzaqlarda və uzaq zamanlarda olub getmiş bir hekayət idi. Bəs, onda nə üçün o əhvalatı indi tarında hekayə edərkən oğlanın baxışları bu qədər pərişan, bu qədər əlacsız olurdu? Qız onu da hiss edirdi ki, muğamın danışdığı o əhvalatda nəhayətsiz bir kədər, bəlkə də dünyada heç kəsin duya bilmədiyi bir nisgil var. Və indi bu cavan tarzən o pərişan, o nisgilli əhvalatı çaldığı muğamın gücü ilə hamıya nəql etmək istəyirdi. O qəmli əhvalatın sirri yəqin ki, bu oğlana aydın idi. Yoxsa, böyük Allahın onun gözlərinə bəxş etdiyi işıq muğamı çalmağa başladığı zaman birdən-birə bu qədər gözəl, bu qədər cazibədar, bu qədər dərin görünə bilməzdi.

Güllərin, çiçəklərin ətriylə dolu bu Aylı gecənin nəhayətsizliyi harada, hansı yalçın qayalıqda isə qurtarırdı. Lakin cavan tarzənin gözlərindəki o işıqlı, anlaşılmaz dünya, muğamı çaldıqca, həm dərinləşir, həm də əsrarəngsiz və qavranılmaz olurdu... Və qız, bütün bu düşündüklərinin, hiss etdiklərinin boş bir xəyal olduğuna özünü nə qədər inandırmaq istəyirdisə, ürəyini o aləmdən qoparıb, o cavan tarzəni özündən uzaqlaşdıra bilmirdi...

Özü kimi gənc və gözəl bir qız olan freylina Fatimə xanım qapını açıb içəri girəndə onu açıq pəncərənin qabağında oturub, aydınlıq içində olan bağçaya tamaşa eləyən gördü. Bağça ağ, qırmızı, çəhrayı güllər ilə, sənubər gülünün ətriylə dolu idi. Bağçada bülbüllər bir-birinə aman vermədən hey oxuyurdular. Əsli Kürdüstandan olan məşhur Bağdad bəyin qızı gənc Fatimə xanım Xan qızı Gülsənubərə freylina olmaqdan savayı, həm də onun yaxın dostu və sirdaşı idi.

Fatimə, Xan qızına baxıb:

– Xanım, – dedi, – gecdir, deyəsən, quşların haray-həşiri səni yatmağa qoymur... Həkimlər sənə deyib ki, həmişə vaxtında yatmaq lazımdır.

– Yata bilmirəm, Fatimə... O tarzəni görəndən bəri yuxum ərşə çəkilib, özümə gələ bilmirəm.

– Onu unut, xanım! Siz hara, tarzən hara... Nə olsun çox gözəldir?!

– Unuda bilmirəm onu... o tayda, o mənə baxanda, nə üçünsə diksindim. Elə bil, nədənsə, duruxdum. Elə bil, tilsimə düşmüşəm...

Sonra Xan qızı zarafatyana əlavə etdi:

– Gözlərinin tilsiminə...

Lakin, bu zarafat dərhal onun gözəl çöhrəsində, nə isə, anlaşılmaz, həyəcanlı bir ifadəyə çevrildi.

Xan qızı soruşdu:

– Deyəsən, o evlidir?

– Bəli, iki qəşəng oğlu var...

– Nə tez evlənib? Deyirdin iyirmi beş yaşı var... Böyük uşağı neçə yaşındadır?

– Böyüyü dörd, kiçiyi iki yaşında. Yaman çox istəyir oğlanlarını.

– Arvadı gözəldir?

– Demək olmaz ki, gözəldir... Ancaq yaraşıqlı gəlindir. Ucaboy, əsmər bənizli, qaraqaş-qaragöz... İnsafən, özü də çox qabiliyyətli, ağayana gəlindir...

– Yaxşı... Yaxşı... Az təriflə, göz deyər, – deyə Xan qızı freylinanın sözünü kəsdi və eyni anda da, özünün belə qısqanclığı özünə həqarət kimi göründü.

Xan qızı Gülsənubərin on səkkiz yaşı var idi. Evdə dərs deyən müəllimlər vasitəsilə qız fars və fransız dillərini öyrənmişdi. Atası, rus mayoru Lisaneviçin on yeddi baş ailəsi ilə güllələbaran etdiyi İbrahim xanın qohumu idi. Xan çarizmə dərin kin bəslədiyi üçün uşaqlarının rus dilini də öyrənmələrinə əhəmiyyət verməmişdi.

Gülsənubər bir tərəfdən Firdovsinin, Hafizin, doğma Füzulinin, bir tərəfdən də Bayronun və Viktor Hüqonun əsərlərini oxuya-oxuya böyümüşdü. Allah ona, məhz sənubər gülü kimi həssaslıq vermişdi. Şuşa qalasının dağlarında, onun igidlərinin məşhur Cıdır düzündə, Xəzinə qayasının uçurumlarında çoxlu kəklikotu, yabanı nanə bitər, bağçalarda tabaq boyda iri qızılgüllər açardı. Qalanın havası bu otların, güllərin, çiçəklərin ətri ilə dolu olardı. Və elə bil ki, Xan qızı Gülsənubərin zərif, həssas gözəlliyi ilə bu ətirli dünya bir yaranmışdı. Elə bil ki, o rayihəli gözəlliklər bir-birini tamamlayırdı.

Hər bahar Şuşa qalasının Cıdır düzündə, “Ərimgəldi” deyilən yerdə axşamlar daş-qaş içində, zər-xara libaslarda gəzməyə çıxan qız-gəlinin gözəllikləri, Cıdır düzündə cıdıra çıxan cavan igidlərin mindikləri qaragöz atların mərdanə yürüşü orda-burda oxunan muğam təsniflərində tərənnüm olunurdu... Və elə bil ki, bütün bunlar gənc qız

Gülsənubərin həssas qəlbində, özünün də dərk etmədiyi, fərqinə varmadığı səssiz, sözsüz mahnılara hay verirdi..

Ata-anasının ərköyün qızı olan Gülsənubər, ayları-illəri qayğısız, eyni zamanda, fərqinə varmadığı şirin həyəcanlarla yola salaraq və sanki bilmədiyi nəyi isə gözləyərək böyüyürdü... Avropasayağı geyinərək, açıq-azadə gəzir, kişilərdən yaşmanmırdı. Və heç kəs də bunu ona ayıb tutmurdu. Hamıya elə gəlirdi ki, bu gözəl Xan qızı elə belə də olmalıdır.

***

Tarzən Sadıqcan lap ilk çağlardan qızın ona qarşı biganə olmadığını hiss etmişdi. Lakin, əlbəttə, bu qədər gözəl Xan qızı adi bir tarzənlə bu qədər açıq maraqlanmışdısa, onun gənc izzət-nəfsini oxşamışdısa da, oğlan buna o qədər əhəmiyyət verməmişdi. O çox gözəl qızların, gəlinlərin onunla maraqlandıqlarını, ona qarşı biganə olmadıqlarını görmüşdü. Xarici gözəlliyi və bütün dinləyiciləri valeh edən çalmaq qabiliyyəti onda özünə qarşı xudpəsənd bir inam yaratmışdı. Digər tərəfdən də, o, artıq "evli kişi" idi. Hörmətli bir kişi olan atası altı il qabaq onu evləndirmişdi. Bu izdivac əhvalatı çox sadə olmuşdu. Özü kimi hörmətli dostunun qızı atasının çox xoşuna gəldiyindən bir gün arvadına dedi:

– Hacının qızı çox xoşuma gəlir... Onu Sadıqcana almaq istəyirəm, ağlın nə kəsir?

Arvadı dedi:

– Sən məndən çox yaşayacaqsan. Neçə vaxtdır mən özüm sənə demək istəyirdim. Hacının qızı, Allah saxlasın, çox qabiliyyətli, mərifətli uşaqdır. Sadıq razılıq versəydi, Hacı ilə qohum olmaq mənim də ürəyimdən olardı. Qız həm də yaraşıqlıdır.

Kişi dedi:

– Biz razı olandan sonra, o nə deyəcək?!

– Yox, ay kişi, sən deyən zaman deyil... Əyyam dəyişib. İndi oğlanlar-qızlar bir-birini yaxından görüb, sevib evlənmək istəyirlər. Özü də ki, ola Sadıqcan kimi gözəl oğlan... Qızlar onun dərdindən ölür.

Kişi dilxor oldu:

– Sən Allah, şit-şit danışma. Nə gözəl oğlanbazlıqdır... Deynən, sənətini yaxşı bilən, ağlı başında oğlandır, vəssalam.

Bir qədər susub, sonra əlavə etdi:

– Sən Sadıqcanın özü ilə danış. Deynən, mənim də məsləhətim belədir.

Və ana oğlu ilə danışdı.

– Ay bala, – dedi, – şükür Allaha, tay vaxtdı. Yaşın iyirmiyə çatır. Ev-eşik, oğul-uşaq sahibi olmaq vaxtındır. Atayın da fikri belədir...

Sadıqcan soruşdu:

– Atam nə deyir? Kimlərlə qohum olmaq istəyir?

Sadıqcan bilirdi ki, onu evləndirmək üçün atasının gözaltısı olmasa, anası belə deməz.

Ana da oğlunun bu sualının mənasını başa düşərək dedi:

– Atan dostu Hacı ilə qohum olmaq istəyir. Qızından çox xoşu gəlir. İstəyir elçi getsin. Sənin cavabını gözləyir. Qızı toylarda görmüsən... Yaraşıqlı, qabiliyyətli cuvanəzəndi. Evlərinə gedəndə göz qoymuşam. Hacının arvadı həddindən artıq kökdür, cəld tərpənən deyil. O gözəl xalılar döşənmiş otaqların o çiçək kimi tər-təmizliyi, səliqəsi var, qızın öhdəsindədir. Özü də savadlıdır. Neçə il evdə, mollalardan fars-türk dilində dərs alıbdı.

Bir qədər sükutdan sonra ana soruşdu:

– Nə deyirsən? Atana nə deyim?

Oğlan dedi:

– Atam necə bilir, elə də eləsin...

Atası bütün şəhər əhlinin hörmət elədiyi mötəbər bir kişi olduğu kimi, Sadıqcanın özünün də dünyada ən çox hörmət eylədiyi insan idi. Hələ indiyə qədər bir sözünü iki eləməmişdi. Onun yanında heç saçını daramamış, papiros çəkməmişdi. Heç bir zaman ondan gec yuxudan qalxmamışdı.

Atasının dostu, qızın atası Hacıya da Sadıqcanın böyük hörməti var idi. Qızı da toylarda, Cıdır düzündə, Ərimgəldidə qız-gəlin arasında görmüş və onun özünə qarşı bir hərəkəti nəzərindən qaçmamışdı. Bunun bir gizlini yox idi ki, onu görən, onunla qarşılaşan qızlar yaraşığı, gözəlliyi və misilsiz çalğısı qarşısında sanki özlərini itirirdilər. Ərəb qızlarına oxşayan o ucaboy, şirin, əsmər bənizli qız isə, onun yanından elə keçirdi ki, elə bil, bu heç qızları dəli eyləyən Sadıqcan deyil. Qız gözünün ucuyla da ona nəzər salmırdı. Bu hal o qızı oğlanın gözündə maraqlı edirdi, böyüdürdü. Bütün bunlara görə də, Sadıqcanla o qız indiki qızlar-oğlanlar kimi bir-birilə görüşüb-gəzmədən, bir-biri ilə yaxından tanış olmadan evləndilər. Qalada o zamanın yüksək dəbiylə toyları oldu.

Atalar da, analar da onların ər-arvadlıq həyatından çox razı qalıb, övladlarının belə uğurlu izdivacı üçün böyük Allaha min təşəkkür elədilər.

***

İndi budur, altı ildir ki, onlar söz-söhbətsiz, dava-dalaşsız, əqli-səlimlə mehriban yaşayıb, iki gözəl oğlanlarını böyüdürlər.

Hacılar da, dizə qədər qarla örtülü olan uzun qış gecələrində bir-birinə qonaq gedib "Şahnamə"dən, Sədinin macəralı həyatından, qadınların günahlarını öyrənib yazma cəhdindən söhbətlər edirdilər. Və bütün bu aləm Xan qızı Gülsənubərdən uzaq idi. Bu həyatın daxili aləmi ona məlum deyildi, onun üçün yox idi. O, hətta, tarzənin körpə balaları barədə də düşünmürdü. Sanki, bütün bunların onun məhəbbətinə dəxli yox idi. O da qəribə idi ki, əgər, ona desəydilər ki, sən tarzənə aşiq olmusan, qız buna təəccüb edərdi. Çünki o tarzənə o qədər aludə olmuşdu ki, ona o qədər vurulmuşdu ki, bunu ifadə üçün təkcə "eşq", "məhəbbət" sözləri kifayət eləməzdi.

Tarzənin bütün varlığı, gözəlliyi, çaldığı muğamlarla birləşərək qızı uzaq, anlaşılmaz hisslərlə dolu aləmə aparanda, qız nəhayətsiz bir şirinliklə hey onun gözlərinə tamaşa etmək və bu gözəllik içində yuxuya getmək istəyirdi. Şirin... əbədi yuxuya... O, muğamın hər nidasında, hər çırpıntısında özünü uzaq və məchul bir aləmdə görüb hiss edirdi. Bəzən "Min bir gecə" nağıllarında təsvir edilən tilsimli bir qalaçada oturub, ondan ayrı düşmüş sevgilisinin hicranını çəkir, bəzən qupquru bir səhrada Məcnun kimi gəzib sevgilisini axtarır, bəzən dünyanın gözəl gülləri, çiçəklərilə dolu əsrarəngsiz bir bağçada dolaşaraq, ondan ayrı düşmüş sevgilisinin həsrətilə göz yaşı tökürdü... Lakin, heç bir zaman o da Məcnun kimi sevgilisinə çata bilmirdi... Və nəhayət, muğam qurtarır və qız təzədən real həyata qayıdaraq, nə olursa-olsun, o, tarzəni görməyə can atırdı.

Və o, freylinası Fatiməyə dedi:

– Məni o tarzənlə tanış elə. Deyirsən, atası əminlə dostdur, özünüz də qonşusunuz.

Fatimə dedi:

– Yaxşı, xanım, tutaq ki, mən sizi tanış elədim, sonra?

– Sonrasına baxarıq.

Fatimə ciddi ifadə ilə:

– Xanım, – dedi, – sən o oğlana o qədər bağlanmısan ki, mən sizi tanış eləməyə qorxuram.

Gülsənubər zarafata saldı:

– Qorxma, bizim aramızda heç bir şey ola bilməz, mən haqq aşiqiyəm, o mənə toxunsa, od tutub yanar.

Sonra freylinanı onları tanış etməyə razı salmaq üçün əlavə elədi:

– Ürəyinə başqa şey gəlməsin. Mən Xan qızıyam! Çox təsirli çaldığı üçün onunla tanış olmaq istəyirəm.

Və onlar axşamçağı Fatimə xanımgilin küçəyə baxan eyvanlarında oturub çay içdikləri zaman, gəlib öz darvazalarına dönən tarzəni görəndə, Fatimə bərkdən dedi:

– Sadıq qağa, buyur çaya qonağımız ol, Gülsənubər xanım da səninlə tanış olmaq istəyir.

Sadıqcan bir an ayaq saxlayıb, tərəddüd etdi. O, Gülsənubərin Xan qızı olduğunu bilirdi. Yalnız buna görə yox, ümumiyyətlə, gənc dinləyicilərin sözünü yerə salmamağı adət etmişdi. Bu dəfə də Fatimə xanımgilin həyətinə daxil olub pilləkənləri qalxdı və qonaq otağından keçib qızlar əyləşən eyvana çıxdı. Və ayağa qalxaraq onu qarşılayan qızlar oturandan sonra özü də əyləşdi. Görünür, Gülsənubər, doğrudan da, Allahın vəhy elədiyi haqq aşiqi idi. Ürəyi elə çırpınırdı ki, qız özünü ələ ala bilmirdi. Fatimə rəfiqəsinin qəfil ağarmış çöhrəsindən keçirdiyi həyəcanı hiss edərək tarzənə dedi:

– Sadıq qağa, Gülsənubər xanım sənin çalmağının vurğunudur.

Tarzən sakit, hörmətkar ifadə ilə dedi:

– Minnətdaram. Allah Xan qızını xoşbəxt eləsin.

Elə bil ki, tarzənin bu sözləri Gülsənubərin əsəblərini birdən-birə sakitləşdirdi və o öz-özünə təəccüblə fikirləşdi: “Cavan oğlan mənə qoca kişilər kimi təşəkkür edir”.

Və qız indi tamam sakit ifadə ilə tarzənə dedi:

– Sizin çalmağınız çox xoşuma gəlir.

Oğlan cavab verdi:

– Ömrünüz uzun olsun, xanım. Sizin kimi nəcib insanlara xoş gəlmək biz tarzənlər üçün xoşbəxtlikdir.

Gülsənubər bu dəfə özünü saxlaya bilməyib gülümsəyərək zarafatyana dedi:

– Sizlər qoca kişilər kimi təşəkkür edirsiniz...

Tarzən də eyni təbəssümlə dedi:

– Sizə nisbətən, əlbəttə, qocayam, xanım. Bu gün-sabah oğlanlarımın gələcək xeyir işləri haqqında düşünməli olacağam.

Xan qızı dedi:

– Nə qayğıkeş atasınız.

Tarzən dedi:

– Atalar üçün onlardan başqa nə var ki?!

Fatimə balaca stəkanda gətirdiyi çayı tarzənin qabağına qoyaraq dedi:

– O barədə Sadıq qağama heç kəs çatmaz. Oğlanları atalarını görəndə quş kimi hərəsi bir çiyninə qonur.

Gülsənubər qəribə bir daxili gərginliklə Sadıqcana dedi:

– Yəni, siz bu çalmağınızın təsirinə qarşı bu qədər biganəsiniz? Axı, hər gecə mən şəhər yatandan sonra Cıdır düzündə təkcə çaldığınız muğamları eşidirəm...

Sadıqcan dedi:

– Gecənin elə gec vaxtı sizin mənim çaldığım muğamları eşitməniz mənim üçün həqiqətən xoşbəxtlikdir, xanım. Təşəkkür edirəm.

Gülsənubər eyni gərginliklə dedi:

– Təşəkkür lazım deyil. Mən özüm üçün qulaq asıram. Ancaq nə üçün siz elə gecələrdə eyzən tək çalırsız? Axı, siz həmişə Hacı Hüsünü müşayiət edirsiniz...

Sadıqcan dedi:

– Hacı Hüsü o qədər gözəl oxuyandır ki, xanım, mən onu müşayiət eyləyəndə avazına o qədər aludə oluram ki, elə bil, özüm də onun səsinin bu avazıyla, bu nisgiiylə birləşib hey uzaqlara, anlaşılmaz, naməlum aləmlərə gedirəm...

Tarzən birdən-birə bikef halda susdu. Xəyalı o aləmlərəmi getdi?

Sonra çox mülayim və bir az da məlum ifadə ilə əlavə etdi:

– Bilirsiniz, xanım, arada mən özümlə tək qalıb ancaq öz çalğımı dinləmək istəyirəm ki, görüm muğamın hekayə elədiyi sözsüz əhvalat nə üçün getdikcə bu qədər dərinləşir, xanım, bu qədər dərinlik ki, var, harada qurtarır? Mən bunu dərk etmək istəyirəm! Hacı Hüsü Füzulinin qəzəllərinin dili ilə ürəyini boşaldır. Amma, mən çaldıqca nə qədər dərinə gedirəmsə, Allahın bizə vəhy elədiyi bu dərin iztirabların dilini başa düşə bilmirəm. Onun nəhayətinə çatmaq istəyirəm. Eh! Xanım, görünür, insan iztirabının sonu yoxdur. Biz üzüqara bəndə bu sonu heç bir zaman görməyəcəyik. Başa düşmürəm, nə üçün böyük Allahın vəhyi, bizə bəxş etdiyi istedad bizi, biz sənətkarları insan iztirabını, insan hicranını, nisgilini daima daha dərindən, daha təsirli ifadə eləməyə sövq edir. Biz heç bir zaman özümüzdən razı qalmırıq...

Bu cavan, bu yaraşıqlı oğlanın belə bir dildə danışması, belə sözlər deməsi, elə bil ki, bu gənc xanımları birdən-birə bir sehrə salmışdı. Handan-hana Fatimə səsini çıxartdı:

– Qağa, sən, məsələn, "Mirzə Hüseyn segahı"nı çalanda, bəyəm, görmürsən ki, adamlar necə yerlərində quruyub qalırlar?

Tarzən dedi:

– Görürəm, o çəpikləri də eşidirəm, xanım... Amma...

– Nə amma? – deyə, Gülsənubər, nəhayət ki, sehr aləmindən çıxıb hövsələsiz soruşdu.

– Amma, xanım, mənə elə gəlir ki, adamlar uşaq kimi aldanırlar. Mənim öz ürəyimi soyutmayan musiqi başqasını necə mütəəssir eyləyə bilər?

– Siz bizi, öz dinləyicilərinizi təhqir edirsiniz, cənab tarzən, – deyə Xan qızı məzəmmətlə ona baxdı. – Bizə məlumdur ki, neçə vaxtdır siz tarın üzərində işləyib onu daha da mükəmməlləşdirmək istəyirsiniz. Zənnimcə buna da müvəffəq olmusunuz. Məsələn, indiyəcən tarı diz üstə qoyub çalırdılar, amma sizin kəşfinizdən sonra tar sinəyə qalxdı. Demək, siz onu yerdən qaldırıb ürəyinizə... qəlbinizə daha da yaxınlaşdırmısınız... Onun da insafı olsa, gərək sizdən heç bir sirrini gizləməsin. İndi gərək o sizin hökmünüzdə olsun.

Fatimə:

– Məncə heç bir tarzən tara Sadıqcan qağa qədər hakim deyil.

Sadıqcan:

– Yox, elə deməyin, ustad tarzənlərimiz çoxdur...

Və sonra Gülsənubər xanıma müraciətlə səmimi etirafla cavab verdi:

– Xeyr, xanım, mən özüm-özümü təhqir olunmuş sanıram. Mənə elə gəlir ki, bizim ifamızda, nə isə, bir saxtalıq var ki, sadədil adamlara bu qədər xoş gəlir.

– Görürsünüzmü? Demək biz sadə adamlar ancaq "saxta" gözəlliyə malik işləri sevirik?

Tarzən dedi:

– Bağışlayın, xanım. Bəlkə "saxta" sözü sərt çıxdı. Mən "ürəyin dərinliklərindən gələn" demək istəyirdim. Məsələn, mənə elə gəlir ki, heç bir muğam məni təmin edəcək dərəcədə ürəyimin dərinliklərindən gəlmir. Bilirsiniz, xanım, hər dəfə muğam çalmağı məndə, məsələn, sizə qəribə görünə bilən fikirlər oyadır.

Qız maraqla soruşdu:

– Məsələn, nə cür fikirlər?

– Məsələn, mənə elə gəlir ki, bütün canlılar kimi, cansızların da ruhu var, xanım. Onlar da nə isə hiss edirlər. Onların daxili fəaliyyəti də idarə olunur, nizama salınır. Məsələn, torpaq öz-özlüyündə cansız bir şeydir. Ancaq necə olur ki, öz-özünə o boyda meşələr, bağlar yetirir?

Niyə çiçəklərin hamısı bir rəngdə olmur? Niyə quşların, heyvanların erkəkləri dişilərindən gözəl olur?

Fatimə dedi:

– Doğrudan da, qəşənglikdə xoruz hara, toyuq hara.

– Mənə elə gəlir ki, – deyə tarzən davam etdi, – milyon illərdən bəri yaşayıb gələn cansız cisimlərdə də vaxtilə onlarla uğraşan, məşğul olan insanların xatirələri, iztirabları, sevincləri yaşayır. Ona görə də, mən tarın üzərində bu qədər çalışıram ki, bu cansız görünən simlər şahidi olduqları insan iztirablarını daha dərindən ifadə eyləyə bilsinlər... O aləm yenidən canlansın!

Gülsənubər soruşdu:

– O aləm sizin özünüzə məlumdurmu?

Tarzən dedi:

– Mən o aləmi hiss edirəm. Mən ərz elədim ki, muğamın avazındakı nisgil, pərişanlıq, bəzən mehribanlıq, mərdanəlik atəşində sonsuzluq hiss edirəm. Ona görə də, imkanım olduqca, tək özümə çalıram ki, görüm, mən o aləmi nə dərəcədə ifadə edirəm? Nəhayət, onun axırına çata bilərəmmi?

Fatimə təəccüblə dedi:

– Qağa, vallah, mən başa düşə bilmirəm ki, sən nə istəyirsən? Çaldığın hər muğam bizə o qədər təsir etdiyi halda, nə üçün özünə əzab verirsən ki, guya, sən onun dərinliklərinə girə bilmirsən?

Gülsənubər sanki öz-özü ilə danışırmış kimi yavaş səslə dedi:

– Görünür, Sadıqcan çaldığı muğamın hekayə elədiyi əhvalatı olduğu kimi ifadə etdiyindən razı qalsaydı, onda, Sadıqcan olmazdı.

Qız bu sözləri sanki bir teht içində dedi. Sanki, tarzənin zahiri gözəlliyi, onun bu müəmmalı daxili aləmi ilə birləşərək qızı eləcə sehrləmişdi. Qız özündə bu oğlana qarşı şiddətli bir istək hiss edirdi və eyni zamanda da, bu hiss onu ürküdürdü. Əlbəttə, Xan qızı Gülsənubər bu on səkkiz yaşında başqa yaraşıqlı, aristokrat oğlanları üzdən çox görmüşdü, lakin, onların heç biri onun əqli-səlimini bu qədər alt-üst eləməmişdi. Onların heç biri onu bu qəribə bir maqnit qüvvəsi ilə özünə tərəf çəkməmişdi. Qıza elə gəlirdi ki, o, bu saat, nə isə, ağılsız bir hərəkət edər, səfeh bir söz danışa bilər və o, Fatiməyə dedi:

– Gedək, gecdir.

Və onlar qalxıb çıxanda anlaşılmaz bir ürək çırpıntısı ilə tarzənə dedi:

– Sağ olun!

Lakin, oğlanla əl tutuşmağa cəsarət eləmədi. Elə bil, nədənsə, qorxub çəkindi.

***

Onlar axşam olub çıraqlar yananda Xan qızıgilin imarətinə daxil oldular. Gülsənubər öz otağına çəkilib Fatimə ilə də heç nə danışmadan qapını örtdü. O, tək qalmaq, o oğlan haqqında düşünmək istəyirdi. Əslində Xan qızının o tarzən barədə düşünməli, aydın olmayan bir fikri yox idi. Lakin, bununla belə, o, özünü oğlandan qoparmaq, onun haqqında düşünməmək iqtidarında deyildi.

Qız oğlanın evli olması, uşaqları barədə düşünmürdü. Sanki, onların varlığı heç yadına da düşmürdü.

Qəribə bir halsızlıq içində, şam eləmədən yuxu onu tirmə divan üstündə aparmışdı. Və gecənin bir aləmi qız diksinərək yenə də Cıdır düzündə tarda çalınan o muğamı eşitdi. Və eşitdikcə, sanki muğamın min cürə iztirab ifadə eləyən nidaları o oğlanın mükəddər üzü ilə birləşərək, qızı da özü ilə birlikdə, hara isə, uzaqlara, anlaşılmaz nisgilli uzaqlara aparırdı. Və qız artıq heç nə düşünmədən qalxıb ipək örtüklü miz arxasına keçərək ona belə bir məktub yazdı:

"Əzizimiz Salıqcan! Sənin əsl adın Sadıq olduğu halda, elə bil ki, xalq bu adı məhz mənə görə, "Sadıqcan" deyə çağırır. Elə bil ki, Sadıq mənim öz canım olub... Mən sənin aləminə o qədər giriftar olmuşam ki, özümü səndən, bir anlığa də olsa, ayrı bir can, ayrı bir ruh kimi təsəvvür eləyə bilmirəm. Öz-özümdən soruşuram:

"Bu nədir? Sevgidirmi? Məhəbbətdirmi? Məcnun eşqidir, nədir?" Ey Allah, – deyirəm, – mən Xan atamın yeganə qızıyam! Məni xilas elə, məni o oğlanın tilsimindən xilas elə!

Mən özümü tilsimə düşmüş kimi hiss edirəm. İndi bu sətirləri qorxudan titrəyə-titrəyə yazıram. Mən səni insanların fövqündə dayanmış gözəllik, nəciblik timsalı, alicənab, anlaşılmaz bir məxluq kimi hiss edirəm. Mən dəli-zad deyiləm. Bəlkə sən yenidən zühur etmiş həzrət Yusifsən? Mən səni təklikdə görmək istəyirəm. Ancaq cəsarət etmirəm. Rica edirəm, bu məktubu oxuyub mənə bir söz de. Bəlkə mən dəli olmuşam? Bəlkə gecənin bir aləmində Cıdır düzündə tək oturub çaldığın muğamlar məni sehrləyib? Bilmirəm, heç nə bilmirəm!"

Xan qızı daha ayrı bir söz yazmayaraq, əynində çərkəz çuxa, belində gümüşqəbzəli balaca xəncər, ayaqlarında uzunboğaz çəkmə olan on beş yaşlı saray buyruqçusu Cəmili çağırıb, məktubu ona verərək dedi:

– Bu kağızı aparıb xəlvətcə tarzən Sadıqcana verərsən. Ancaq, heç kəs görməsin, ağzından bir kəlmə söz qaçırsan, öldürərəm.

Saray pajı Cəmil cavan xanımın axırıncı hədəsindən inciməyərək, şən bir əhvalla məktubu alıb götürüldü.

Sonra qız biləyində ləl-cəvahirlə işlənmiş bilərzik, barmaqlarında brilyant üzüklər olan gözəl əllərini göyə qaldıraraq:

– Ey böyük Allah, ey hər sirrimizə vaqif olan, Ərhəmərrahimin Allahımız! Əgər, günah edirəmsə, məni bağışla! Mənə kömək et! – deyə pıçıldadı.

***

Cəmil tarzəni güdüb, o, evlərinin darvazasına təkcə yaxınlaşanda, yüyürək qabağını kəsib, ipək zərfdə olan məktubu ona verərək, özündən bu sözləri də əlavə etdi:

– Bax, bu barədə ağzından bir kəlmə söz çıxmasın!

Sadıqcan ani təəccüblə məktubu alıb, nə isə demək istədi. Lakin, Cəmil döngəni burulub gözdən itdi. Sadıqcan məktuba ani bir nəzər salaraq, cibinə qoyub darvazanı açaraq, həyətə daxil oldu. Səhər-səhər yuxudan yenicə qalxıb, tabaq boyda açılmış qızılgüllərin arasında oynayan oğlanları səs-küylə yüyürüb gənc atalarının dizini qucaqladılar. Sadıqcan ikiyaşlı balaca oğlunu qucağına alaraq balkona çıxdı. Cibindəki məktubun nə barədə olacağını təxmin edirdi. Başqa qızlardan belə məktublar almışdı. Ona görə, otaqlarında açmadı. Ona görə yox ki, arvadı soruşa bilərdi ki, "nə məktubdur?" Ona görə ki, yad qadının eşq məktubunu arvad-uşağın yanında oxumağı özünə rəva bilmədi. Səhər yeməyindən sonra dincəlmək üçün külafirəngiyə qalxıb divanın üstündə uzanaraq, zərfi açdı (yəqin ki, Xan qızı Gülsənubər tarzənin onun məktubunu belə qarşıladığını bilsəydi, çox sarsılardı).

Və məktubu sakit halda oxudu. Sonra bir əlini gözünün üstünə qoyub, eyni sakitliklə xəyala getdi. Əlbəttə, Gülsənubər onunla tanış olmaq istəyən başqa qızların tayı deyildi.

Kor Şeytan tarzənin ürəyinə girib dedi:

– Düzdü, Gülsənubər hara, o qızlar hara?! Gülsənubər Şuşa qalasında tək gözəldir. Avropa təhsili görmüş, şah sarayına layiq qızdır! Sənin arvadın isə, bozbaş bişirən sadəlövh qadındır...

Söz bura çatanda tarzən sanki diksindi. Kor Şeytanı qovmaq üçün arvadının səhər onun naharı üçün gətirdiyi Turşsudan bir stəkan içdi.

Sonra məktubu zərfi ilə birlikdə didik-didik eləyib, Üçmıx dağından əsib gələn yelə verdi və kəklikotu, yabanı nanə ətrilə dolu yel də onu – Gülsənubərin bu ilk məhəbbətini – bağçada açılmış tabaq boyda qızılgüllərin, mavi yasəmən çiçəklərinin üstünə səpələdi. Və günorta tarzən külafirəngidən düşüb evə çıxaraq, arvadı və balaca uşaqlarıyla birlikdə Allahın verdiyindən nahar elədi.

***

İkinci gün idi ki, Gülsənubərin məktubuna cavab gəlmirdi. Və qız bir yerdə qərar tutub dayana bilmirdi. Otaqları, bağçanı bir-birinə vurub, qərarsız gəzib-dolaşır, heç kəslə, hətta, istəkli freylina Fatimə ilə də bir kəlmə kəsib danışmırdı. Tarzənə məktub göndərdiyini də Fatiməyə demirdi. İki gecəydi ki, Cıdır düzündən tarzənin tarının səsi də gəlmirdi. Bu isə, qızı lap dəli edirdi. Üçüncü gecənin bir aləmi Cıdır düzündə tarzənin çalmağa başladığı muğamın ilk nidaları eşidiləndə, qız qeyri-iradi hövlnak bir hərəkətlə qulaqlarını qapadı və bir neçə saniyə bu cür dayandı və bu bir neçə saniyə ona bir əbədiyyət qədər uzun göründü. Sonra qulaqlarını açaraq, gecə paltarında yarıqaranlıq bağçaya düşdü və güllərin arasına qoyulmuş kətilin üstündə oturub dinləməyə başladı. İndi qıza elə gəlirdi ki, bu muğamı çalan tamam yad bir adamdır və bu yad adam onun zavala gəlmiş nakam məhəbbətinin, nakam qəlbinin iztirablarını bu qədər nisgillə hekayə edir, ona bu qədər dərindən acıyır...

Və qız səhərə yaxın qeyri-şüuri tələsik paltarını dəyişib, saray əhlindən gizlin bağçanın Cıdır düzünə tərəf açılan qapısından çıxaraq, sərt qayaların arasıyla qıvrıla-qıvrıla yuxarı qalxan dar cığırla Cıdır düzünə doğru getməyə başladı. Yaxındakı fənərlər sönmüşdü. Şuşa qalası ulduzlarla dolu, ləkəsiz, nəhayətsiz göyün altında şirin yuxuda idi. O, heç nə görmürdü. Elə bil ki, bu qaranlıq, dolama cıdırlarla onu tarzənin çaldığı o muğamların nidaları, fəryadları çəkib aparırdı.

***

Tarzən birdən başını qaldırıb ulduzların işığında onu görəndə, çalğını saxlayıb, həyəcanla ayağa qalxdı. Musiqinin kəsilməsilə sanki qız da birdən-birə özünə gələrək, yerində dayandı. Və elə bil ki, bütün vucuduna qəfil, yeni bir həyat qüvvəsi daxil oldu və məhz bu neçə saniyədə o, xalq arasında igidliyilə məşhur olan Xan atasının qızı olduğunu xatırladı və sərt, amiranə bir səslə qışqırdı:

– Çal!..

Və bu dəfə qız tarzənə “siz” deyə yox, “sən” deyə müraciət etdi. Lakin, tarzən, sanki yerində quruyub qalaraq, çalmadı. O zaman Xan qızı, bu dəfə cəsarətlə ona yaxınlaşaraq, eyni amiranə səslə soruşdu:

– Nə üçün mənim məktubuma cavab vermədin? Yəni, sənin nəzərində mən o qədər mənasız bir vücudam?

Tarzən durduğu yerdə dayanmış halda dilə gəlib:

– Allah eləməsin, xanım! – dedi. – Mən adi bir tarzən, nə haqla sizin barənizdə o cür düşünə bilərəm.

Elə bil, tarzənin bu nəzakətli mülayimliyi qızın ixtiyarını yenidən əlindən aldı. Və o, taqətsiz halda yaxındakı qaya parçasının üstündə əyləşərək, öz-özü ilə danışırmış kimi, pıçıltıyla soruşdu:

– Mənim məktubum sənin ürəyinə zərrə qədər də təsir eləmədi?

– Xanım! – deyə tarzən bir addım irəli atdı. – Sizin sözləriniz mənim üçün Allah vəhyi qədər əziz və müqəddəsdir. Ancaq mən sizin gözəlliyinizə, hisslərinizə, açılmamış buta olan Gülsənubərə layiq olmayan, evli-uşaqlı bir kişi olduğum halda, sizin məktubunuza nə cavab verə bilərdim? Buna mənim nə haqqım var idi? Mən belə hörmətsizliyə necə cəsarət edə bilərdim? Yox, xanım, bu mümkün deyildi!

Qız birdən-birə, sanki canlanaraq, aydın bir əhvalla soruşdu:

– Əgər, evli olmasaydın, məni sevə bilərdin?

Tarzən dedi:

– Xanım, əgər, mən subay oğlan olsaydım, yeddi canım olsaydı, yeddisini də sizin yolunuzda qurban verməyə hazır olardım! Mən bu sözləri sizi sakit eləmək üçün demirəm. Siz o qədər gözəl, o qədər təmiz, o qədər günahsız bir məxluqsunuz ki, mən “uf” demədən bunu edərdim. Ancaq, nə etməli ki, mənim bir canım var, onu da o iki körpə oğluma, onların sadə, köməksiz analarına vermişəm. Mən öz ixtiyarımda deyiləm!

Qəribədir, tarzənin bu səmimi ürək sözləri qızın əldən getmiş ixtiyarını, həyat qüvvəsini yenidən onun özünə qaytardı. Və o təəccüblü bir açıq-saçıqlıqla dedi:

– Mən atamın təkcə övladıyam. Atamın bütün ləl-cəvahiri mənə qalıb. Gəl, biz onların yarısını qoyaq sənin gənc arvadının-uşaqlarının yanında, qalanını özümüzlə götürək, hansı ölkəyə istəyirsən, gedək. Elə bir ölkəyə ki, bizi tapa bilməsinlər.

Tarzən bir neçə saniyə susaraq, uzaq baxışlarla qıza baxdı. Həqiqətən də müqəddəs hesab elədiyi qızdan bu dərəcədə amansız sözlər eşitməyi onu bərk sarsıtmışdı.

– Xanım, – dedi, – neçə il bundan qabaq, mən subay olduğum zaman bizi İran şahının sarayına, böyük bir toyu aparmağa dəvət etmişdilər. Toy qurtarandan sonra əlahəzrət şah özü mənə təklif elədi ki, qalım şah sarayında çalım. Mən əlahəzrətə dərin təşəkkür edərək dedim: "Əlahəzrət, mən Qarabağsız çala bilmərəm, istəsəm də, çala bilmərəm. Mənim canım ordadır". İndi, xanım, mənim iki uşağım və qanuni arvadım da var.

Gülsənubər dərindən nəfəs alıb dedi:

– Ürəyin də daşa dönüb.

Sonra anlaşılmazlıq içində əlavə elədi:

– Bəs, necə olur ki, sən çaldığın muğamlarda o qədər nakam məhəbbət, o qədər nisgil, o qədər sonu görünməyən kədər ifadə eləyə bilirsən?

Elə bu anda həmin sübh çağı Kirs dağlarından sərin bir yel əsdi. Tarzən başını qaldırıb göyə baxdı və Üçmıx dağının zirvəsi tuşundan qapqara, nazik bir buludun ilan kimi qıvrıla-qıvrıla onların başı üzərinə gəldiyini görüb, həyəcanla qıza dedi:

– Xanım, bərk fırtına olacaq, tez qaçın evinizə.

Sonra səmaya işarə ilə əlavə etdi:

– O nazik, qara bulud həmişə fırtına gətirir.

Həqiqətən, aləm birdən-birə qapqaranlıq oldu. Soyuq külək gücləndi, dalbadal göy gurultusu eşidildi. Xəzinə qayası tərəfdən şiddətli şaqqıltı ilə şimşək çaxdı.

– İldırım düşdü, – deyə tarzən səsləndi. – Gəlin tez düşək şəhərə. Sonra sizin üçün çətin olar.

– Qoy olsun! – deyə, Xan qızı sakitcə cavab verdi. – Mən istəyirəm bu saat məni ildırım vursun.

Və birdən dalbadal göy şaqqıltısıyla elə şirə-boran yağış başladı ki, göz açmaq mümkün olmadı. Üçmıx dağından gurultu ilə sellər axdı.

– Dayanmaq vaxtı deyil, xanım! – deyə tarzən sol əlində tarı, sağ əli ilə qızın qolundan yapışıb onu qayaların arasıyla burula-burula şəhərə doğru enən dar cığırla üzü aşağı çəkdi.

Gülsənubər incəbel, zərif bir qız idi. Əynindəki nazik ipək donu şiddətli yağış çırpıb vücuduna yapışdırmışdı. Hücumla axan dağ seli onun ayaqlarını tez-tez yerdən üzüb, cığırın yanındakı qayalara çırpırdı.

– Yeriyə bilmirəm! – deyə yağışdan gözlərini aça bilməyərək qışqırdı.

Tarzən sol əli ilə tarını tutmuş olduğu halda, sağ əlini qızın belinə dolayaraq, onu qaldırıb qoltuğuna vurdu. O, ucaboylu, çox qüvvətli bir oğlan olsa da, bu daşlı cığırla üzü aşağı getməli idi. Arxadan qəzəblə gələn sel isə, onun kürəyinə şiddətlə zərbələr endirirdi. O, qızla bərabər üzü üstə selin altına yıxılmaqdan özünü zorla saxlayırdı. Qoltuğundakı qızdan səs çıxmaması onu qorxudurdu. Selin yuvarlayıb gətirdiyi daşlardan baş-gözünə dəymiş olardı. Tez-tez şimşək çaxıb, bu dəhşətli fırtına zülmətini qılınc kimi parçalasa da, heç nə görmək olmurdu. Tarzən Gülsənubərgilin imarətgahı olan məhəlləyə doğru düz getdiyini fəhmlə hiss edirdi. Və nəhayət, o, qaranlıqda tək-tək əl fənərinin ora-bura qaçdığını gördü. "Yəqin xanımı axtarırlar" deyə düşündü. Və son gücünü toplayaraq, addımlarını yeyinlətməyə cəhd etdi. Və birdən:

– Cəmil hey! – deyən Fatimənin həyəcanlı səsini eşitdi.

– Axtarıram, axtarıram! – deyə Cəmil eyni təşvişlə bərkdən səsləndi.

Və tarzənin qoltuğundakı qızdan iniltiyə bənzər bir səs eşidildi...

– Fatimə! – deyə tarzən bərkdən qışqırdı.

Fatimə ilə Cəmil özlərini onlara yetirdilər.

Tarzən heç bir söz demədən:

– Tutun qızı! – deyə nə üçünsə acıqla səsləndi.

Fatimə ilə Cəmil hərəsi bir tərəfdən yapışaraq, Xan qızını tarzənin qoltuğundan aldılar. Tarzən heç bir söz demədən çevrilib yağışın altında sürətlə uzaqlaşdı. Və o, evinə çatmamış Şuşa qalası öz möcüzəsini göstərdi. Dolu qarışıq yağış qəfil necə başlamışdısa, eləcə də birdən kəsdi. Göy üzünü örtən qara bulud sanki gözəgörünməz nəhəng bir qılıncla parçalandı. Və parçalar sürətlə bir-birindən uzaqlaşdı. Günəş doğub Şuşa qalasını təravətli, aydın bir nura qərq etdi. Və tarzən düşündü: "Elə bil ki, təbiət Xan qızını günahkar hərəkətinə görə tərbiyə etmək istəyirmiş".

Tarzən, Gülsənubər kimi gənc, subay qızın evli-uşaqlı kişiyə eşq yetirməsini, hətta, onu, ailəsini, uşaqlarını atıb getməyə təhrik etməsini dözülməz günah hesab edirdi. Və o, düşünürdü: "Bu cür qəddar ürək sahibinin eşqi Leyli eşqi, Məcnun eşqi ola bilməz!"

Tarzən bu fikirlə evinə qalxıb, əlvan xalılar döşənmiş böyük zala daxil olduqda, arvadı Mina xanımı, balaca oğlanlarını qorxu və həyəcan içində onun yolunu gözlədiklərini gördü.

Böyük oğlu Əsədulla gülümsəyərək soruşdu:

– Dədə, sel yaman axırdı?

– Yaman! – deyə tarzən birdən-birə hiss etdiyi xoş əhvalla cavab verdi.

***

Başına yığılan saray xidmətçiləri və freylinası Fatimə, Xan qızının islanmış paltarını dəyişib, çarpayıda uzandırandan sonra Gülsənubər nə üçünsə acıqlı ifadə ilə (elə bil ki, onlar nədə isə təqsirkardırlar) dedi:

– Ürəyim yaman darıxdı, bir az hava almaq üçün Cıdır düzünə qalxmışdım. Qəfil fırtına başlayanda, mən də qaçmaq istəyəndə, yaxşı ki, tarzənə rast gəldim. O olmasaydı, yəqin ki, o tufandan salamat qurtara bilməyəcəkdim.

– Oy xanım! Allaha şükür ki, tarzənə rast gəlmisən, – deyə aşpaz qadın Xeyransa dilləndi. – O cür tufandan salamat qurtarmağın möcüzədir.

– Yaxşı, – deyə qız dilləndi. – Gedin, mən yatmaq istəyirəm.

Gülsənubərin anası keçən il vəfat eləmişdi. Xan atası da Qarabağ kəndliləri üçün xaricdən gətirdiyi kənd təsərrüfatı alətlərini özü nəzərdən keçirmək üçün beş-altı gün bundan qabaq Cəbrayıl, sonra da Qarabulaq (Füzuli) rayonlarındakı kəndlərinə getmişdi.

Gülsənubər bir tərəfdən daşlara dəyib əzilmiş ayaqlarının ağrısından, digər tərəfdən isə, əsəbilikdən yata bilmirdi. Bu tufandan sonra Kor Şeytan ürəyinə girib deyirdi: "Sən Xan qızısan! Qara camaat içindən çıxan o tarzən səni rədd edib təhqir etdi, sənin məhəbbətini alçaltdı. O, sənin ən ağır intiqamına layiqdir. Hamısı birdir. Sən onsuz yaşaya bilməyəcəksən, o, səni sehrləyib. Öldür özünü, özün də yaz qoy ki, atangil bilsin, sənin ölümünə səbəb onun eşqidir".

Kor Şeytanın bu sözlərilə qıza şiddətli qızdırma gəldi. Və o, üç gün huşsuz yatdı. Fransada təhsil alıb gəlmiş cavan doktor müəyyən elədi ki, ona bərk soyuq dəyib. Doktorun cidd-cəhdindən sonra dördüncü gecə onun huşu özünə gəldi. Bu zaman həyatda eşitdiyi ilk səs tarzənin uzaqda çaldığı "Çahargah" muğamı oldu. Kor Şeytan, elə bil, onun ürəyinə girib dedi: "Eşitdinmi, sən bu cür xəstə olduğun halda, o, yenə də tar çalır".

Lakin qız o muğamdan qulağını çəkə bilmədi. Və bu zaman Allahın xeyir xəbərlər carçısı həzrət Cəbrayıl onun ürəyinə daxil olub dedi: "Sən Kor Şeytanın sözünə qulaq asma! Onu qov! O səni Allahla düşmən eləmək istəyir. Tarzən özünü, illərdən bəri üstündə əlləşərək təkmilləşdirmək istədiyi tarını məhv olmaq təhlükəsi qarşısında qoyaraq, səni dəhşətli ölümdən xilas elədi! O gecənin xatirəsi səni yüz il yaşatmağa layiqdir".

Və Gülsənubər "ah" çəkərək o muğamı dinləməyə davam etdi. Bu "Çahargah" muğamında sanki dəvə karvanı zınqrov səsləri altında uzaqlara, ayrı bir dünyaya, bəlkə də, əbədiyyətə yol almışdı. Və qız özünün, o tarzənin də əbədiyyətə gedən o karvanla yol yoldaşı olduqlarını və bu yolda onları əbədi bir sükutun müşayiət elədiyini qəribə bir aydınlıqla hiss edirdi. Muğam axıb getdikcə, həzrət Cəbrayıl ona pıçıldayırdı: "Axı, o gün Allah səninlə, o tarzənlə birlikdə, sənin məhəbbətini xilas etdi".

İndi "Çahargah" o məhəbbətin də o karvanla birlikdə əbədiyyətə getdiyini təmkinlə, yüksək ruhla hekayə etdikcə, qəlbində ülvi bir rahatlıq hiss edirdi. Və qız onu da düşünürdü ki, yəqin tarzənin onu (qızı) o dəhşətli ölümdən xilas etməyi, onun (tarzənin) özünü də sevindirəcək. Bu düşüncə qızda bir sevincə, bir ruh yüksəkliyinə çevrildi. Tarzən həmişə xatırlayacaq ki, onu sevən qızı ölümdən xilas etdi.

Və səhər gənc doktor onu diqqətlə müayinə eləyib təhlükənin sovuşduğunu xəbər verdikdə, qız eyni sevinclə dedi:

– Doktor mən sağalacağam! Axı, o tarzən məni Allahın köməyi ilə ona görə xilas etməyib ki, təzədən ölüm. Ona görə xilas eləyib ki, yaşayım. Onun muğamlarında hekayə olunan kimi, əbədi yaşayım. Elə deyil?!

Gənc doktor qızın bu müəmmalı sözlərindən bir şey başa düşməyərək dedi:

– Əlbəttə, xanım!

Və qız sonralar, hər dəfə tarzənin çaldığı o muğamları dinlədikcə hiss edirdi ki, onun nakam məhəbbəti əbədiyyətə qovuşmuşdur. Və o muğamlar bu nakam məhəbbətin iztirablarını, ələmlərini tərənnüm edir. Onu da hiss edirdi ki, böyük Allahın seçib, ülvi ruh bəxş elədiyi o tarzən özü də bu nakam məhəbbətin nisgili ilə mütəəssirdir...

*1996*

## KİTABDAKILAR



HEKAYƏLƏR



POVESTLƏR

